Bu kitab "Fuad Əliyev, Urfan Həsənov. İrəvan xanlığı" (Bakı, Azərnəşr, 1997) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır.

Redaktoru və
ön sözün müəllifi: **Kərim Şükürov**
tarix elmləri doktoru

**ISBN 978- 9952- 34- 166 – 9**
**947.54-dc22**
Azərbaycan- Tarixi
**Fuad Əliyev, Urfan Həsənov. İrəvan xanlığı.**
Bakı, "Şərq- Qərb", 2007,144 səh.

Tarixən qədim Azərbaycan torpaqlarını əhatə edən İrəvan xanlığı həm siyasi, həm də iqtisadi baxımdan az öyrənilmiş xanlıqlardan biridir. Kitabda müstəqil dövlət qurumuna çevrilməzdən əvvəl mürəkkəb və uzun tarixi yol keçmiş İrəvan xanlığının yaranmas, ictimai- iqtisadi vəziyyəti və siyasi tarixi ilkin mənbələr və arxiv sənədləri əsasında təqdim edilir.

Bu kitabda 1747- 1828-ci illəri əhatə edən dövrdə ermənilərin Azərbaycan ərazisində, Rusiya imperiyasının tərkibində "erməni dövləti yaratmaq üçün müxtəlif məktublarla dönə - dönə Rusiya dövlətinə müraciət etmələri barədə də maraqlı məlumatlar vardır.

"Şərq – Qərb", 2007

# QƏRBİ AZƏRBAYCAN – ERMƏNİSTAN (İNDİKİ) TARİXŞÜNASLIĞI VƏ ÜMUMİ AZƏRBAYCAN TARİXİNDƏ ƏKSİ

Azərbaycan tarixinə görə ölkənin Cənub (Atropatena) və Şimal (Albaniya) torpaqları qədim zamanlardan Rusiya işğalınadək (XIX əsrin əvvəlləri) ümumi konteksdə nəzərdən keçirilir, işğaldan sonra isə vəziyyət dəyişir, yəni yalnız Şimali Azərbaycan (əsasən, keçmiş Azərbaycan SSR) öyrənilir [1]. Bununla birgə Cənubi Azərbaycan tematikası xüsusi tədqiqatlarda davam etdirilir[2]. 1980-ci illərin sonları- 90-cı illərin əvvəllərində Azərbaycan tarixinin müasir dövrədək ümumi şəkildə öyrənilməsi zərurəti irəli sürüldü. İlk dəfə orta məktəblər üçün yeni, milli Azərbaycan tarixi dərsliklərində bu həyata keçirildi [3]. Təəssüf ki, bu yeniliklər Azərbaycan tarixinin yeddi cildlik akademik nəşrində nəzərə alınmadı[4]. Azərbaycanlıların digər tarixi etnik torpaqları olan Ermənistanın (indiki) – Qərbi Azərbaycanın tarixinin öyrənilməsi və ümumi Azərbaycan tarixində əksi vəziyyəti daha acınacaqlı oldu. ("Ermənistan (indiki)" anlayışı sonra xüsusi qeyd olmadığı halda Ermənistan kimi verilir – K. Ş.). Bu tematika faktiki olaraq gündəlikdən çıxarıldı. Bunun nəticəsində Qərbi Azərbaycana – Ermənistana sahib olmuş ermənilər, Ermənistan tarixi haqqında da öz uydurma konsepsiyalarını yaratdılar. Bu konsepsiyaya görə, tarixi Ermənistan ümumi şəkildə nəzərdən keçirilir, Rusiya işğalından sonra indiki Ermənistan – Şərqi Ermənistan, qalan isə Qərbi Ermənistan adlandırılır, erməni xalqının tarixi adı altında, onların hər ikisinin tarixi müasir dövrədək izlənilir.[5] Beləliklə, Ermənistan – Qərbi Azərbaycan anlayışı, tarixi və özünəməxsus inkişaf yolu təhrif edilib.

---

[1] Azərbaycan tarixi. Üç clddə. I – III c., Bakı, 1958- 1963.

[2] Cənubi Azərbaycan tarixinin oçerki ( 1828- 1917). Bakı, 1985.

[3] Azərbaycan tarixi. VI – IX siniflər üçün dərslik (müxtəlif nəşrlər).

[4] Azərbaycan tarixi. Yeddi clddə. I – VII c., Bakı, 1998 – 2003.

[5] История армянского народа. С древнейших времен до наших дней. Под. ред. М. Г. Нерсесяна. Ереван, 1980.

Sovet İttifaqının dağılması, Ermənistandan azərbaycanlıların deportasiyasının başa çatdırılması, Azərbaycana qarşı müharibə və i.a. tarixi həqiqətin - Ermənistan (Qərbi Azərbaycan) reallığının bərpasına təkan verdi. Azərbaycan tarixşünaslığında yeni elmi istiqamət - Azərbaycan ermənistanşünaslığı (ermənişünaslıq ilə qarışdırılmamalıdır) və ya Qərbi Azərbaycanşünaslıq yaranır.

Əvvəlcə Ermənistan – Qərbi Azərbaycan anlayışının tarixinə diqqət yetirək. Belə bir anlayış birdən – birə yaranmayıb. İlk vaxtlar Ermənistana dair tədqiqatlarda, əsasən, "Ermənistanda Azərbaycan...", yaxud "Ermənistan azərbaycanlıları" kimi ifadələr üstünlük təşkil edirdi [1] Lakin tədricən onunla paralel olaraq Ermənistan – Qərbi Azərbaycan fikri genişlənir, sonra isə əsas mövqeyə keçir. Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin "1948-1953-cü illərdə azərbaycanlıların Ermənistan SSR ərazisindəki tarixi etnik torpaqlarından kütləvi surətdə deportasiyası haqqında" 1997-ci il 18 dekabr fərmanından sonra bu mövqe daha da güclənir. Fərmanda bir mənalı şəkildə Ermənistan adlandırılan ərazi – azərbaycanlıların min illər boyu yaşadıqları öz doğma etnik torpaqları kimi ifadə edilir.

Ermənistan – Qərbi Azərbaycan tarixşünaslığında Ermənistanın Qərbi Azərbaycan Torpqalarının olmasının təsdiqi mərkəzi məsələ kimi çıxış edir. Burada bir neçə istiqamət diqqəti cəlb edir: 1) Ermənistan – Qərbi Azərbaycanın toponimiyasının tədqiqi; 2) ermənilərin indiki Ermənistan ərazisinə miqrasiyası; 3) Azərbaycanın tarixi coğrafiyasının dəqiqləşdirilməsi və i.a.

Birinci istiqamət daha geniş ədəbiyyat yaratmışdır[2] .Lakin burada daha çox toponomik faktların izahına geniş yer verilib. B.Budaqov və Q.Qeybullayev isə problemin konseptual ifadəsini

---

[1]S. N. M ahmudov. Ermənistan SSR-in ərazisindəki Azərbaycan mənşəli toponimlərin tədqiqinə dair. Azərbaycan SSR EA –nın "Xəbərlər"i (Yer elmləri seriyası), 1981, № 6, səh. 103-109; А.И.Абдуллаев. Материальная культура азербайджанцев, проживающих в Армении в XIX- начале XX века. АКД, Тифлис, 1981; İ. Məmmədov. Sovet Ermənistanında Azərbaycan kitabı. İrəvan, 1985.

[2]İ. Bayramov. Qərbi Azərbaycanın türk mənşəli toponimləri. Bakı, 2002, səh. 669-695.

irəli sürüb. Bu baxış həmin müəlliflərin “Ermənistanda Azərbaycan mənşəli toponimlərin izahlı lüğəti” adlı kitabında ümumiləşdirilib. Müəlliflər yazır: “Azərbaycan dilində “Ermənistan” sözü 1921-ci ildə Sovet Rusiyasının İrəvan quberniyası ərazisində təşkil etdiyi dövlətin (və ölkənin) adıdır.Ondan əvvəl “Ermənistan” adı məlum deyil. 1588 və 1728 – ci illərə aid türkcə arxiv sənədlərində İrəvan şəhərinin adı ilə bu ölkə müvafiq olaraq “Rəvan əyaləti” və “ İrəvan əyaləti adlanır” [1] Tədqiqatı yekunlaşdıran müəlliflər davam edir: “Deyilənlərdən görünür ki, indiki Ermənistan ərazisi ermənilərin yox, e. ə. VIII – VII əsrlərdən başlayaraq türk mənşəli tayfaların yaşadığı ölkə olmuş və sonralar, XIX əsrin əvvəllərinə qədər burada türklər aparıcı rol oynamışlar. Mənbələrdə elə bir tarixi məlumat yoxdur ki, Ermənistan ərazisində azərbaycanlılar erməniləri kəndlərindən qovub yerlərini tutsunlar. Lakin adları türkcə olan yaşayış məntəqələrində hələ orta əsrlərdə ermənilərin yaşaması halları istənilən qədərdir. Kimin gəlmə, kimin yerli olduğunu müəyyən etmək üçün bu faktın özü kifayətdir”[2]. Göstərilən kitabda türk tayfalarının indiki Ermənistan ərazisində yerli olması əsaslandırılsa, digər qrup tədqiqatlarda, ermənilərin bu əraziyə miqrasiyası tarixi nəzərdən keçirilir. Onların içərisində İ. Əliyev, H. Verdiyeva və R. Hüseynzadənin araşdırmalarını qeyd etmək olar[3].

H. Verdiyeva və R. Hüseynzadənin “Ermənilərin “şəcərəsi” və onların Balkandan Qafqaza miqrasiyası” essesinin adı bütövlükdə problemi əks etdirir. Müəlliflər ermənilərin Cənubi Qafqaza gəlmə olduqlarını bildirərək yazırlar ki, ermənilərin əcdadları Cənubi Qafqazda əzəli azəri torpaqlarını tutaraq vətən əldə etdilər [4].

İndiki Ermənistan ərazisinin Azərbaycan torpaqları olması Azərbaycanın tarixi coğrafiyasının obyektiv öyrənilməsi ilə bağlıdır.

---

[1] B. Ə. Budaqova, Q. Ə. Qeybullayev. Ermənistanda Azərbaycan mənşəli toponimlərin izahlı lüğəti. Bakı, 1988, səh. 19.

[2] Yenə orada, səh. 93.

[3] И. Алиев. Нагорный Карабах: История. Факты. События. Баку, 1989; Х. Вердиева, Р. Гусейнзаде. «Родословная» армян и их миграция на Кавказ с Балкан. Баку,2003.

[4] H. Verdiyeva, R. Hüseynzadə. Göstərilən əsəri, səh. 21.

Bu sahədə ilk ümumiləşdirici əsər 1987 – ci ildə nəşr edilib[1]. Bu nəşrdə Azərbaycanın bütün dövrlər üzrə xəritələri vardır. Onların sistemli şəkildə nəzərdən keçirilməsi göstərir ki, o zaman Azərbaycanın tarixi coğrafiyası haqqında konseptual baxış olmayıb. Məsələ ondadır li, ilk əvvəl Azərbaycanın ümumi tarixi – coğrafi xəritəsi hazırlanmalı, sonra isə dövrlər üzrə onun necə dəyişilməsi izlənilməli idi. Müqayisə üçün qeyd edək ki, ermənilər bu üsuldan geniş istifadə edir[2]. Azərbaycanın tarixi coğrafiyası kitabında buna əməl edilməməsi, bütövlükdə ölkə sərhədləri, o cümlədən onun qərb sərhədləri barədə xeyli sual yaranmasına səbəb olur. Bu baxımdan Albaniyanın sərhədlərinin müəyyənləşdirilməsi böyük əhəmiyyət kəsb edirdi. Həmin xəritələrə görə Albaniyanın qərb sərhədləri, əsasən, Göyçə gölünün ortasından ( e. ə. III əsr istisna olmaqla) keçir. IX – XIII əsrin əvvəllərində isə Göyçə gölü Azərbaycan daxilində verilir[3]. Buradan belə nəticə çıxır ki, guya həmin dövrdəki Azərbaycan dövlətləri Göyçə ətrafı torpaqları tutub. Azərbaycan tarixçiləri bu məsələyə də yenidən nəzər salıb və tarixi həqiqəti bərpa etməyə çalışıb. 2007 –ci ildə "Azərbaycan tarixi atlası" çap olunub[4]. Bu xəritələrdə Göyçə gölü və ətrafı bütün halda Albaniyanın daxilində verilir. Belə olduqda, Azərbaycanın sonrakı dövrlər üzrə hüdudlarının necə dəyişməsini izləmək daha məntiqi olur.

Qərbi Azərbaycanın tarixi coğrafiyasına dair tədqiqatlar da nəzərdən keçirilən qrupa daxil edilə bilər. Ə. Ələkbərlinin "Qədim türk oğuz yurdu – Ermənistan", S. Əsədovun tərtib etdiyi "Ermənistan azərbaycanlılarının tarixi coğrafiyası" və b. Kitablarda bu məsələ diqqət mərkəzində olub[5].

Ermənistan – Qərbi Azərbaycan tarixşünaslığında müxtəlif

---

[1] Историческая география Азербайджана. Баку, 1987.

[2]Карта: Историческая Армения, сопредельные страны. История армянского народа.

[3] Историческая география Азербайджана, стр. 88-97.

[4] Azərbaycan tarixi atlası. Bakı, 2007.

[5] Ə.Ələkbərli. Qədim türk – oğuz yurdu- Ermənistan. Bakı, 1994; S. Əsədov. Ermənistan azərbaycanlılarının tarixi coğrafiyası. Bakı, 1995; Z. Həbibbəyli, M. Zəngilanlı. Zəngəzurun qısa tarixi və coğrafiyası. Bakı, 2000; Musa Urud. Zəngəzur. Bakı 2005.

tarixi dövrlərin siyasi, iqtisadi, mədəni problemlərinə dair tədqiqatlar da vardır. S. Əsədov, İ. Məmmədov və b. Tədqiqatçıların araşdırmaları xüsusi yer tutur [1]. Qərbi Azərbaycan tarixi problemlərinə dair ədəbiyyat içərisində azərbaycanlıların soyqırımı və deportasiyası haqqında işlər üstünlük təşkil edir[2]. Deyilənləri yekunlaşdırsaq aydın olur ki, Ermənistan – Qərbi Azərbaycan tarixşünaslığı:

1. Azərbaycan sovet tarixşünaslığının rəsmi mövqeyi nəticəsində, olduqca gec, yalnız 1980- ci illərin sonları – 90- cı illərin əvvəllərindən yaranmağa başlayır;

2. Sovet dövlətinin dağılması, xüsusilə Ermənistan SSR –də azərbaycanlılara qarşı güclənən deportasiya, soyqırım və faktiki olaraq həyata keçirilən müharibəyə qarşı geniş elmi - ədəbi ictimaiyyətin reaksiyası kimi meydana gəlir ki, bu da onun səviyyəsi və problematikasına təsir göstərir;

3. Bütövlükdə Azərbaycan tarixşünaslığında yeni elmi istiqamətə çevrilir və s.

İndi başlıca vəzifə Ermənistan – Qərbi Azərbaycan tarixinin sistemli təhlilinə nail olmaq, onun əsas problemlərini kompleks şəkildə araşdırmaya cəlb etmək və davamlı şəklə salmaq, ümumi Azərbaycan tarixində müvafiq əksini təmin etməkdir.

Azərbaycan tarixən şimalda Böyük Qafqaz sıra dağları, cənubda Mərkəzi İranla həmsərhəd olub. Onun şərq sərhədləri Xəzər dənizi ilə hüdudlanıb. Qərbdə Gürcüstanla həmsərhəddir. Azərbaycanın Tarixi torpaqları Araz çayı əsasında şərti olaraq Şimali və Cənubi Azərbaycana bölünür. Sonralar Ermənistan adlandırılan ərazi bütün Azərbaycanın deyil Naxçıvanla birlikdə Şimali

---

[1] С. Асадов. Исторические проблемы Западного Азербайджана. Дисс. На соиск. учен. степени докт. ист. наук в форме научного доклада. Баку, 1999; yenə onun: Миф о Великой Армении. Баку, 1999; İ. Məmmədov. Tariximiz, torpağımız, taleyimiz. Bakı, 2002.

[2] Didərginlər. Bakı, 1990; İ. Məmmədov Ermənistan azərbaycanlıları və onların acı taleyi. Bakı, 1992; A. Paşayev. Köçürülmə. Bakı, 1995; İ. Vəlizadə, B. Muradov. Ermənistan azərbaycanlılarının soyqırımı. Bakı, 1996; Həbib Rəhimoğlu. Silinməz adlar, sağalmaz yaralar. Bakı, 1997.

Azərbaycanın qərb hissəsini təşkil edir. Ona görə bu ərazinin təbii – coğrafi şəraiti və tarixi Şimali Azərbaycanın tərkib hissəsi kimi nəzərdən keçirilməlidir. Lakin Şimali Azərbaycanın qərbinin bir hissəsində sonralar Ermənistan adlı dövlətin yaradılması, metodoloji baxımdan problemə yanaşmada dəyişiklik edilməsini zəruri edir. Şimali Azərbaycanın, məhz sonralar Ermənistan adlanan hissəsi "Qərbi Azərbaycan" kimi ayrılır. Qərbi Azərbaycan dağlıq ərazidir. Geniş çay şəbəkəsinə malik deyil, lakin çoxlu gölləri vardır. Onlardan ən böyüyü Göyçə gölüdür (sahəsi 1.3 min kv.km). Torpaq örtüyü rəngarəngdir. Təbii ehtiyatlarla, flora və faunası ilə də zəngindir.

Bunun nəticəsi idi ki, Azərbaycanın bütün ərazisində olduğu kimi, burada da qədim insan məskənləri aşkar edilib.

Qədim dövrlərdə, o cümlədən Albaniya (Qafqaz) dövründə (e. ə. IV – e. VIII əsrinin əvvəlləri) Ermənistan torpaqlarının xeyli hissəsi Azərbaycanın tərkibində olub. Tarixdə mövcud olmuş ilk erməni dövlətləri Qərbi Azərbaycanın hüdudlarından kənarda yaranıb. Ermənilər isə həmin ərazilərə ən tezi e. ə. II əsrdən sonra nüfüz edib[1]. Həmin dövrdə Ermənistan ərazisi Armeniyanın tərkibinə daxil edilir. Armeniya 387- ci il Sasani – Bizans müqaviləsindən sonra ümumiyyətlə dövlətçiliyini itirib[2]. Qərbi Azərbaycan Sasani imperiyası (III- VII əsrlər) tərkibində qalıb. Ermənilər 301- ci ildə xristianlığı qəbul etdikdən sonra erməni – qriqorian kilsəsi siyasi həyatda da fəal rol oynayır. Onun mərkəzləri də digər ərazilərdə yerləşirdi.

Təxminən VII əsrdə sonralar Qərbi Azərbaycanın mərkəzi olan İrəvan şəhərinin adı çəkilir ( Digər bir məlumata görə İrəvan adı e. ə. VIII əsrdə çəkilmişdir)[3].

Ərəb xilafətinin işğalları prosesində Qərbi Azərbaycan onlara tabe edilib. Ərəblərin ermənilərə xeyirxah münasibəti tarixdə yaxşı

---

[1] И. Алиев. Нагорный Карабах: История. Факты. События. Баку, 1989, стр. 18.
[2] История армянского народа, стр. 96-97.
[3] İ. Bayramov. Qərbi Azərbaycanın türk mənşəli toponimləri, səh. 335- 336.

məlumdur. Məhz onların köməyi ilə erməni – qriqorian kilsəsi 704 – cü ildə Alban kilsəsini özünə tabe etdi. Ərəblər Xilafətin Cənubi Qafqazda yerləşən bütün torpaqlarını "Ərməniyyə" adlı inzibati vahiddə birləşdirdi [1]. Bu siyasət ermənilərin Cənubi Qafqazdakı mövqeyinin möhkəmlənməsində müəyyən rol oynadı. Ərəb Xilafətinin zəiflimәsilə Baqratilər çarlığı ( 886- 1045) meydana gəldi. Onun da mərkəzi (Ani) Qərbi Azərbaycandan kənarda idi.

Səlcuq dövlətinin yürüşləri Qərbi Azərbaycan tarixində böyük əhəmiyyətə malik olub. XI – XII əsrlərdə Burada Səlcuqların hakimiyyəti qurulub. Səlcuqların hakimiyyəti ilə bu torpaqların "Ərməniyyə"yə daxil olmasına da son qoyulub. Kitabi – Dədə Qorqudda bu yerlər " Oğuz eli" kimi adlandırılıb.

"Oğuz eli" XIII – XIV əsrlərdə Monqol imperiyası tərkibinə qatılıb. XIII əsrin ortalarından İrəvan şəhərinin rolu da artmağa başlayıb.

Qızıl Orda hökmdarı Toxtamış və Teymurləng (1370- 1405) arasındakı müharibə də Qərbi Azərbaycandan yan keçməyib, bu torpaqlar Teymurləngə tabe edilib.

Azərbaycan Qaraqoyunlu dövləti (1410- 1468) yarandıqdan sonra, 1411 – ci ildə Qərbi Azərbaycanı da torpaqları sırasına daxil etdi. Məhz Qaraqoyunluların dövründə İrəvan şəhəri mühüm inzibati mərkəzə çevrilir. 1441 –ci ildə erməni – qriqorian kilsəsinin mərkəzi də İrəvan yaxınlığındakı Eçmiədzinə köçürülür. Erməni din xadimləri İrəvan ətrafında torpaq alğısını genişləndirib, mülklərini artırmağa başlayır.Qaraqoyunlulardan sonra Ağqoyunlular (1468- 1501) Qərbi Azərbaycanın sahibi olur. Azərbaycan Səfəvi dövləti (1501) Ağqoyunlu dövlətinin varlığına son qoyur. 1502-ci ildə Qərbi Azərbaycan ələ keçirilir. Səfəvilərin inzibati idarə sisteminə uyğun olaraq ölkədə bəylərbəyiliklər yaradılır. Onlardan biri də mərkəzi İrəvan şəhəri olan Çuxursəd bəylərbəyi idi[2]. Çuxursəd bəylərbəyiliyi

---

[1] Z. Bünyadov. Azərbaycan VII – IX əsrlərdə. Bakı, 1989, səh. 94; Историческая география Азербайджана, стр.52.

[2] Çuxursəd bəylərbəyiliyi haqqında b a x : Z. Bayramov, N. Cəfərli. Çuxursəd bəylərbəyiliyi. "Elm və həyat". 1990, №6; S.Onullahi. Çuxursəd – İrəvan Səfəvilər

Ermənistan – Qərbi Azərbaycanın ilk ümumi coğrafi adı hesab oluna bilər. Qərbi Azərbaycan torpaqlarının böyük bir hissəsinin bir bəylərbəyilikdə birləşdirilməsi onun həyatında mühüm rola malik oldu. İlk vaxtlar burada Div Sultan Rumlu və Hüseyn Sultan Rumlu bəylərbəyi idi. Səfəvilərlə osmanlılar arasındakı 1514- 1555 –ci il müharibəsi bəylərbəyiliyə ağır zərbə vurdu. Osmanlılar 1554 –cü ildə İrəvanı tutdu, lakin az sonra şəhəri tərk etdi.

1555 –ci il Amasiya sülhündən sonra Qərbi Azərbaycan Səfəvilərin tərkibində qaldı. 1578-1590-cı illər müharibəsində isə Çuxursəd bəylərbəyiliyi Osmanlı imperiyasına keçdi[1]. Osmanlı dövründə Çuxursəd bəylərbəyiliyi Rəvan (İrəvan) əyaləti adlandırıldı. İrəvan şəhərinin adının bütün əyalətə şamil edilməsilə Qərbi Azərbaycan daha bir coğrafi ad kəsb etdi. Belə bir hal, yəni bölgənin İrəvan şəhəri əsasında adlandırılması təcrübəsi (İrəvan xanlığı, İrəvan quberniyası) 1918-ci ilədək davam etdi. 1590-cı ildə burada müfəssəl dəftər tərtib edildi. Tədqiqatçılar yazır ki, 1590 –cı il tarixli müfəssəl dəftərə görə, İrəvan əyaləti 10 nahiyəsi (İrəvan, Karbi, Vedi, Aralıq, Talin, Ərmus, Abnik, Abaran, Şərabxana) olan İrəvan livasından ( əyalətə tabe olan inzibati - ərazi vahidi – K. Ş.), 16 nahiyəsi (Ağcaqala, Məvazeyi – Xatun, Mülki – Arslanlı, Qarabağ, Dərəşam, Dərəşahbuz, Bazarçayı, Şərur, Zar, Zəbil, Əlincə, Sisyan, Azadciran, Ordubad (görünür bu müvəqqəti xarakter daşımışdır), Şorlut, Dərənürgat) və bir qəzası olan Naxçıvan livasından ibarət idi[2]. Hesablamalar əsasında İrəvan əyalətində 51831 nəfər (67.5%) türk – müsəlman yaşadığı müəyyən edilmişdir[3]

I Şah Abbasın (1587-1629) apardığı yeni müharibə nəticəsində İrəvan əyaləti Səfəvilər dövləti tərkibinə qaytarıldı. Şah Abbas 1616-1618-ci illər müharibəsində də qalib gələrək, mövqeyini möhkəmləndirdi. Səfəvilər dövlətində ermənilərə verilən imtiyazlar

---

dövründə. El.turan, 1995, № 1-2, səh. 16- 19; İ.Məmmədov. Tariximiz, torpağımız, taleyimiz. səh.88.

[1] O.Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti. Bakı, 1993, səh. 83, 179.

[2]İrəvan əyalətinin icmal dəftəri. Bakı, 1996, səh. 8-9.

[3] Yenə orada, səh. 11- 12.

artırıldı[1].

Ermənilər XVII əsrin sonları – XVIII əsrin əvvəllərində Rusiya ilə yaxınlaşmağa, onun vasitəsilə erməni dövləti yaratmağa çalışırdı. I Pyotrun Xəzərsahili torpaqları işğalı bu bu niyyəti daha da möhkəmləndirdi[2].

Belə bir mürəkkəb şəraitdə osmanlılarla səfəvilər arasında 1723-1727 –ci illər müharibəsi başladı. İrəvan əyaləti yenidən Osmanlı dövlətinin tərkibinə keçdi və 1590 –ci ildə olduğu kimi, 1728-ci ildə də müfəssəl dəftər tərtib edildi. Tədqiqatçılar qeyd edir ki, "1728-ci il tarixli İrəvan əyalətinin müfəssəl dəftərindən aydın olur ki, osmanlılar Naxçıvan bölgəsi üçün ayrıca bir müfəssəl dəftər tərtib etmiş, Zar, Zəbil və Şərur nahiyyələrini Naxçıvan sancağının tərkibindən çıxararaq İrəvan əyalətinə birləşdirmişdilər. Bundan əlavə Maku, İğdır, Sürməli adlı nahiyələrin İrəvan əyalətinə birləşdirilməsi ilə bərabər, bu əyalətin ərazisində Göyçə, Məzrəə, Xınzırak, Qırxbulaq, Dərəçiçək və əhalisi 100% türk olan Sədərək adlı nahiyələr və Şürəngəl livası yaradılmış, XVI əsrin sonunda mövcud olmuş Talin, Ərmavi, Abnik, Şərabxana nahiyələri, Naxçıvan ərazisində isə Bazarçayı və Ağcaqala nahiyələri ləğv olunmuş, buraların kəndləri isə yeni yaradılmış nahiyələrə verilmişdir". Hesablamalara görə əyalət əhalisinin 43784 nəfəri (61.2 %) türk – müsəlman idi. İrəvan şəhərində bu rəqəm 3369 nəfər (63.5%) təşkil edirdi[3]

Səfəvilər dövlətinin son dövrlərində nüfuzu getdikcə artan Nadir xan osmanlılara qalib gələrək İrəvan əyalətini Səfəvilərə, sonra isə şahlığı dövründə (1736-1747) özünə tabe etdi. Nadir şahın inzibati – bölgü siyasəti böyük maraq doğurur. O, Şirvan, Qarabağ, Azərbaycan və Çuxursəd bəylərbəyiliklərini ləğv edib, əvəzində Azərbaycan vilayəti (mərkəzi Təbriz) yaratdı. Bu təsadüfi olmayıb, Keçmiş Çuxursədin də Azərbaycan torpağı olmasının təsdiqi idi.

---

[1]S.Onunllahi. I Şah Abbas və ermənilər. "Tarix və onun problemləri" jurnalı, 2002, №3, səh. 26-35.

[2] Вах: Г.А.Эзов. Сношения Петра Великого с армянским народом. СПб., 1898.

[3] İrəvan əyalətinin icmal dəftəri. Bakı, 1996, səh. 9, 18.

1747-ci ildə Nadir şahın qətlindən sonra Azərbaycanda iyirmi xanlıq meydana gəldi. Onlardan hər birinin Azərbaycan tarixində öz yeri və rolu vardır. Belə xanlıqlardan biri də İrəvan xanlığının meydana gəlməsi bir tərəfdən Nadir şahın qətlindən sonra yaranan vəziyyətlə bağlı idisə, digər tərəfdən Qərbi Azərbaycanın nəzərdən keçirilən tarixi inkişafının nəticəsi idi. Artıq qeyd etdiyimiz kimi Qərbi Azərbaycan torpaqları bu və ya digər dövlətlərin tərkibinə daxil olmuşdu, lakin burada ayrıca dövlət yaranmamışdı. İlk belə dövlət İrəvan xanlığı oldu[1]

İrəvan xanlığı Ağrıdağ düzənliyinin Göyçə gölü hövzəsi və Araz çayından cənub – qərbə doğru uzanan ərazini əhatə edirdi. Azərbaycanın şimal – qərbində yerləşən bu xanlıq paytaxt İrəvan şəhəri olmaqla inzibati cəhətdən naiblərin idarə etdiyi 15 mahala bölünürdü (Qırxbulaq, Zəngibasar, Gərnibasar, Vedibasar, Şərur, Sürməli, Dərəkənd, Saatlı, Talin, Seyidli- Axsaxlı, Sərdarabad, Karpi, Abaran, Dərəçiçək, Göyçə). İrəvan xanlığı 1747-1797 –ci illərdə müstəqil dövlət olmuş, 1797 – 1828-ci illərdə burada İranın hakimiyyəti bərpa olunmuşdu. Dövlətin başçısı xan idi; xandan sonra vəzir (yaxud baş mirzə), müxtəlif vəzifə daşıyan bəylər (divan bəyləri, sərkərdələr, əmirlər və s.) gəlirdi. Qoşuna xan özü başçılıq edirdi. Əhalisi, əsasən azərbaycanlılardan, qismən erməni və kürdlərdən ibarətdir; əkinçilik, bağçılıq, tərəvəzçilik və maldarlıqla məşğul olurdular. İrəvan xanlığında dövlət (divan), xalisə (xana və ailə üzvlərinə məxsus), mülk, vəqf və camaat torpaq mülkiyyəti formaları mövcud idi. Kəndlilər onlarca vergi verir və müxtəlif mükəlləfiyyətlər daşıyırdılar.

XVIII əsrin II yarısında yaranmış nisbi sabitlik şəraitində xanlığın iqtisadi həyatında müəyyən canlanma nəzərə çarpsa da, bu, uzun sürmədi. İrəvan xanlığı Həsənəli xanın dövründə (1756-1764-cü illər) Kartli- Kaxeti çarlığından asılı vəziyyətə düşdü, Hüseynəli

[1] F.Əliyev, U.Həsənov, İrəvan xanlığı. Bakı, 1997; И.П.Петрущевский. Очерки по истории феодальных отношений в Азербайджане и Армении в XVI- начале XIX в. Л., 1949; И.И.Шопен. Исторический памятник состояния армянской области в эпоху ее присоединения к Российской империи. СПб., 1852.

xanın hakimiyyəti illərində (1764-1783 cü illər) isə xanlıq feodal ara vuruşmaları nəticəsində daha da zəiflədi. Bundan istifadə edən Kartli- Kaxetiya çarı II İrakli 20 minlik qoşunla qəflətən hücuma keçərək İrəvan şəhərini işğal etməyə cəhd göstərdi, lakin ciddi müqavimətə rast gəldi, bir çox kəndləri qarət edib, çoxlu əsir və qənimətlə geri döndü. İrəvan xanlığı Kartli – Kaxeti çarlığı ilə sazişə girməyə məcbur oldu. Georgiyevsk traktatına (1783) əsasən Kartli – Kaxeti çarlığının Rusiya dövlətinin himayəsinə keçməsi İrəvan xanlığında Rusiyaya və gürcü çarlığına münasibəti xeyli dəyişdirdi. 80-ci illərin sonlarına doğru İrəvan xanlığı Kartli – Kaxeti çarlığının asılılığından tamamilə xilas oldu. 1795-ci ildə Ağa Məhəmməd xan Qacarın Cənubi Qafqaza yürüşü zamanı İran qoşununun bir hissəsi İrəvan xanlığına hücum etdi. 35 günlük mühasirədən sonra İrəvan qalası təslim oldu. 1796-cı ildə general V. Zubovun başçılığı ilə Rusiya qoşununun Cənubi Qafqaza yürüşü zamanı İrəvan hakimi Məhəmməd xan Rusiyanın himayəsinə keçmək istədiyini bildirdi. II Yekaterinanın ölümündən (1796-ci il, noyabr) sonra rus qoşunu Cənubi Qafqaz ərazisini tərk etdi. Ağa Məhəmməd xan Qacar (1796-cı ildən İran şahı idi) İrəvan xanını Tehrana çağıraraq həbs etdi və ailəsi ilə birgə Qəzvinə göndərdi; İrəvan xanlığının idarəsi Əliqulu xana tapşırıldı. 1797 –ci ilin sonunda İranın yeni hökmdarı Fətəli şah Məhəmməd xanı həbsdən azad edərək, yenidən İrəvan xanı təyin etdi. Müstəqil siyasət yeritməyə səy göstərən Məhəmməd xan general Sisianovun komandanlığı altında rus qoşununun İrəvan qalasını mühasirəyə alaraq ələ keçirmək cəhdlərinin heçə endirilməsində xüsusi şücaət və sərkərdəlik nümayiş etdirmişdi. İrəvan xanlığı Gülüstan müqaviləsinə (1813) görə İranın tərkibinə keçdi.

1826-cı ildə Rusiya ilə İran arasında yeni müharibə başlandı. Müharibə zamanı Azərbaycan dövlətləri olan Naxçıvan (1827-ci il, iyun) və İrəvan (1827-ci il, oktyabr) xanlıqlarının ərazisi işğal olundu. Müharibədən sonra İrəvan xanlığı ərazisində 420-dən çox kənd (o cümlədən Qırxbulaq mahalında 32, Zəngibasarda 8, Gərnibasarda 48, Dərəkənddə 8, Vedibasarda 33, Saatlıda 5, Talində

35, Sərdərabadda 9, Karpidə 12, Abaranda 60, Dərəçiçəkdə 33, Göyçədə 90, Dərələyəzdə 46 kənd) dağıdılmış, on minlərlə azərbaycanlı əhali məhv edilmişdi. Qafqazda hərbi əməliyyat aparan rus qoşunlarının baş komandanı İ.F.Paskeviç, hələ müharibə başa çatmamış, 1827-ci il oktyabrın 6-da İrəvanda "müvəqqəti idarə" təşkil etdi. İdarə üç üzvdən ibarət idi: general – leytenant Krakovski (sədr), N. Aştaraketsi və İrəvan qalasının komendatı podpolkovnik Borodin. Türkmənçay müqaviləsi (1828-ci il, 10 fevral) bağlandıqdan sonra, Naxçıvan və İrəvan xanlıqlarının idarəçiliyi dəyişdirildi. Çar I Nikolayın (1825-1855-ci illər) sərəncamı ilə (1828-ci il, 21 mart) həmin xanlıqlar əsasında "Erməni vilayəti" adlı müvəqqəti inzibati – idarə yarandı. Göründüyü kimi Rusiya hakimiyyəti dövründə də bu torpaqlar Ermənistan deyil, "Erməni vilayəti" adlandırılmışdı. Vilayət idarəsi vilayət rəisindən, iki rus müşavirindən (biri polis, digəri maliyyə üzrə) və iki asessordan (iclasçıdan) ibarət idi. Asessorlardan biri azərbaycanlı, digəri erməni icmasından idi. Çar hökümətinin tarixi Azərbaycan torpaqları əsasında "Erməni vilayəti" yaratması ilə I Pyotrdan başlayaraq ermənipərəst siyasətin həyata keçirildiyi təsdiq olunurdu. "Erməni vilayəti" iki əyalətdən – İrəvan və Naxçıvan əyalətlərindən ibarət idi.

Çarizmin və onunla əlbir olan ermənilərin Azərbaycan torpaqları olan İrəvan və Naxçıvan bölgələrini "Erməni vilayəti" kim i qələmə verməsini təkzibedilməz tarixi faktlar rədd edir. Çünki çar Rusiyasının erməniləri İran və Türkiyədən həmin ərazilərə kütləvi surətdə köçürməsindən əvvəl, sonradan "Erməni vilayəti" adlandırılan ərazinin əhalisi 107224 nəfər idi. Əhalinin 76.24% -ni azərbaycanlılar, 23.45% -ni ermənilər təşkil edirdi. Azərbaycanlıların əhalinin etnik tərkibində bu cür üstünlüyü təşkil etməsi həmin torpaqların tarixi Azərbaycan ərazisi olduğunu təsdiq edən inkaredilməz faktdır. 1826-1828-ci illər Rusiya – İran müharibəsi dövründə və müharibədən sonra İran və Türkiyədən ermənilərin kütləvi surətdə bu yerlərə köçürülməsi nəticəsində əhalinin etnik tərkibi dəyişdi. Fransız mınşəli rus tədqiqatçısı İ.İ.Şopenin 1829-1832-ci illərdə rəsmən həyata keçirdiyi kameral təsvirinin

nəticələrinə görə, artıq burada 31201ailə, 164450 nəfər əhali qeydə alınmışdı. Onlardan 16078 ailə (51.53%), 81749 nəfər (49.71%) müsəlmanlar (azərbaycanlılar); 4428 ailə (14.19%) 25151 nəfər (15.29% köçürməyədək burada yaşayan ermənilər; 6949 ailə (22.27%), 35560 nəfər (21.62%) İrandan köçürülmüş ermənilər; 3682 ailə (11.80%), 21666 nəfər (13.17%) Türkiyədən köçürülmüş ermənilər idi. Bu faktlardan aydın olduğu kimi vilayətə İran və Türkiyədən birgə 10631 ailə (bütün ailələrin 34.07%-i), 57226 nəfər (34.79%) erməni köçürülmüşdü. Belə bir vəziyyət İrəvan şəhərində də müşahidə edilirdi. Rusiyanın İrəvanı işğal etdiyi dövrdə burada 1807 azərbaycanlı ailəsi, yaxud 7331 nəfər (3749 kişi, 3582 qadın), 567 erməni ailəsi, yaxud 2369 nəfər (1220 kişi, 1149 qadın) qeydə alınmışdı. O zaman İrəvanın 9700 nəfərlik əhalisinin 75.6% -i azərbaycanlı, 24.4% -i erməni idi. Çarizmin erməniləri İran və Türkiyədən kütləvi şəkildə Şimali Azərbaycan torpaqlarına köçürməsi nəticəsində ermənilərin sayı İrəvan şəhərində də artdı. 1829-1832-ci illərdə həyata keçirilən kameral təsvirə görə İrəvan şəhərinə İrandan 366 erməni ailəsi, yaxud 1715 nəfər (903 qadın, 812 kişi), Türkiyədən 11 ailə, yaxud 48 nəfər (25 kişi, 23 qadın) köçürülmüşdü. Bu köçürmə nəticəsində İrəvan şəhəri əhalisinin sayı ermənilərin hesabına artaraq 11463 nəfərə çatmışdı. Nəticədə azərbaycanlıların sayı 64% -ə enmiş, ermənilərin sayı isə 36%-ə qalxmışdı. Bu siyasət sonralar da davam etdirilmişdi. Beləliklə, çar hökuməti Şimali Azərbaycanın işğalı zamanı ermənilərin çar ordusuna göstərdiyi "xidmət" müqabilində onlara işğal olunmuş Azərbaycan torpaqlarında Naxçıvan və İrəvan xanlıqlarının ərazilərində "Erməni vilayəti" adlandırılan ərazini "bəxşiş" verdi. Bununla ermənilər çar Rusiyasının himayəsi və köməyi ilə Cənubi Qafqazda özlərinə ərazi bazası yaratdılar. Bundan sonra ermənilər çar Rusiyasının antiazərbaycan və antitürkiyə siyasətinin həyata keçirilməsində fəal rol oynadılar. Çar hökuməti Cənubi Qafqazın işğalını və burada möhkəmlənməklə bağlı siyasətini həyata

keçirdikdən sonra 1840- ci il 10 aprel qanunu ilə "Erməni vilayəti"ni ləğv etdi. İrəvan və Naxçıvan əyalətləri qəzalara çevrildi[1].

Çar I Nikolayın fərmanı ilə 1849 –cu il iyunun 9- da keçmiş "Erməni vilayəti" və Aleksandropol (Gümrü) qəzası əsasında İrəvan quberniyası yaradıldı. Bəzi inzibati ərazi dəyişikliklərindən sonra quberniya İrəvan, Aleksandropol, Eçmiədzin, Naxçıvan, Novobayazid, Şərur- Dərələyəz və Sürməli qəzalarına bölündü. İrəvan quberniyasının ərazisi 23194.79 kv. Verst (1 verst = 1.0668 km) idi. 1917-ci il Qafqaz təqviminin məlumatına görə, quberniyada 1120242 nəfər əhali yaşayırdı. Hər kv. Verstə 48.3 nəfər düşürdü. Quberniya əhalisinin 589125 nəfəri (52.6%) kişi, 531117 nəfəri (47.4%) qadın, 1014868 nəfəri (90.6%) yerli sakinlər, 105374 nəfəri (9,4%) müvəqqəti yaşayanlar idi. Çarizmin İrəvan quberniyası əhalisinin etnik tərkibini ermənilərin xeyrinə dəyişdirmək siyasəti Türkmənçay müqaviləsindən sonra ardıcıl surətdə həyata keçirilmişdi. Ermənilərin İrəvan quberniyasına köçürülməsi 1877-1878-ci illər Rusiya –Türkiyə müharibəsi dövründə, XIX əsrin əvvəllərində də ardıcıl olaraq davam etdirilmişdi. Bütün bunlara baxmayaraq, İrəvan quberniyasında azərbaycanlı əhalinin xüsusi çəkisi həmişə yüksək olmuşdur. 1917-ci il təqviminin məlumatına görə, 100 ildən çox davam edən soyqırımlarına və deportasiyalara baxmayaraq, azərbaycanlıların sayı 373582 nəfər (33,35%) idi. Ermənilərin sayı isə qeyd olunan köçürmələr nəticəsində 669871 nəfərə (59,8%) çatdırılmışdı. İrəvan quberniyasındakı 5 şəhərin (Aleksandropol, Naxçıvan, Novobayazid, Ordubad, İrəvan) birlikdə əhalisi 132559 nəfər (11,83%) idi. Əhalinin qalan hissəsi – 967683 nəfər (88,17%) isə qəzalarda, o cümlədən İrəvanda (154331nəfər), Naxçıvanda (122208), Sürməlidə (104791), Şərur – Dərələyəzdə (90250) yaşayırdı. Azərbaycanlılar bütün şəhər əhalisinin 18,9%-ni (25044 nəfər), qəzaların əhalisinin isə 35,3% -ni (348538 nəfər), təşkil edirdi.

Əhalinin etnik tərkibinin dəyişdirilməsi quberniyanın mərkəzi

---

[1] İ.İ.Şopen. Göstərilən əsəri; F.Əliyev, M. Əliyev. Naxçıvan xanlığı. Bakı, 1996.

İrəvan şəhərində də aparıldı.

1873-cü ildə İrəvan şəhərində azərbaycanlıların sayı 5805, ermənilərin sayı 5959, 1886-cı ildə müvafiq olaraq 7228 və 7142, 1897-ci ildə 12516 və 12529 olmuşdu. 1917-ci il Qafqaz təqviminin məlumatına görə, İrəvan şəhərində 51286 nəfər əhali qeydə alınmışdı, onların 25548 nəfəri (49,8%) kişi, 25738 nəfəri (50,2%) qadın idi. Şəhər əhalisinin 22001 nəfəri daimi, 29285 nəfəri müvəqqəti yaşayanlar idi. Həmin məlumata əsasən, İrəvan əhalisinin 12557 nəfəri (24,5%) azərbaycanlı, 37204 nəfəri (72,5%) erməni idi. Bu fakt bir daha aydın sübut edir ki, 1828-1917- ci illər arasında çarizmin həyata keçirdiyi məqsədyönlü köçürmə siyasəti və azərbaycanlılara qarşı ayrı- seçkilik siyasəti nəticəsində İrəvanda yerli əhalinin – azərbaycanlıların sayı kəskin surətdə azalmışdı.

İrəvan quberniyasının iqtisadiyyatında əsas yeri kənd təsərrüfatı tuturdu. Quberniya torpaqlarının 70,1% -i xəzinəyə, 25,6%-i mülkədarlara məxsus idi. Birinci dünya müharibəsi nəticəsində yaranmış şəraitə görə (iş heyvanlarının səfərbərliyə alınması, əhalinin arxa cəbhə işlərinə cəlb edilməsi və i.a.) əkin sahələri üçdə bir qədər azalmışdı. İrəvan quberniyası Qafqaz cəbhəsi və Qafqaz ordusunun yaxın arxa cəbhəsi idi. Quberniyanın İrəvan, Aleksandropol, Naxçıvan və b. qəzalarında ehtiyyat hissələr və könüllü dəstələri yerləşdirilmişdi.

1917 – ci il Fevral inqilabı nəticəsində çarizmin devrilməsi xəbəri İrəvan quberniyasına martın əvvəllərində çatdı. Quberniyada müvəqqəti hökümətin yerli hakimiyyət orqanlarının formalaşdırılmasına başlandı. Martın 14 (27)-də təşkil olunan Quberniya İcraiyyə Komitəsi özünü Xüsusi Zaqafqaziya Komitəsinin (*rusca* ОЗАКОМ – Особый Закавказский Комитет) yerli orqanı elan etdi. Qəzalarda da icraiyyə komitələri yaradıldı. Müvəqqəti hökümət tərəfindən İrəvan quberniyasına və qəzalara komissarlar təyin edildi.

Fevral inqilabından sonra İrəvan quberniyasında sovetlər də yaranmağa başladı. Martın 8 (21)- də Aleksandropolda əsgər, sonra isə fəhlə deputatları sovetləri meydana gəldi. Hər iki sovet tezliklə

birləşdi. İrəvan şəhərində də martın 12 (25)-də əsgər, apreldə isə fəhlə deputatları sovetləri yarandı. Mart ayı ərzində İrəvan quberniyasının şəhərlərində sovetlər təşkil olundu. Həm Müvəqqəti hökümətin yerli orqanlarında, həm də sovetlərdə daşnaklar üstünlüyü ələ aldılar. 1917-ci ilin sentyabrın sonlarında daşnaklar Tiflisdə "Erməni milli müşavirəsi" çağırdılar. Müşavirədə erməni Milli Şurası (sədr A. Aqaronyan) təşkil edildi. İrəvan şəhərində və quberniyanın qəzalarında da milli şuraların təşkil olunmasına başlandı. Erməni milli şurası İrəvan quberniyasının azərbaycanlı əhalisinə qarşı soyqırım siyasətinin hazırlanması və həyata keçirilməsi, Osmanlı imperiyasında ermənilərin pozuculuq fəaliyyətinin təşkili, Qafqaz cəbhəsində vuruşmaqdan ötrü erməni korpusunun komplektləşdirilməsi üçün tədbirlər görməyə başladı. 1917-ci il Oktyabr çevrilişindən sonra yaradılan Zaqafqaziya komissarlığı (1917-ci il 15 (28) noyabr) hakimiyyətini İrəvan quberniyasına da yaydı. İrəvan quberniyasında da Müəssislər Məclisinə (Rusiya) seçkilərdə daşnaklar və sazişçilər qalib gəldilər. 1918-ci ilin 10 (23) fevralında işə başlayan Zaqafqaziya seymi Cənubi Qafqazın Rusiyadan ayrılmasını təsdiqlədi (1918-ci il mart). Zaqafqaziya Demokratik Federativ Respublikası elan olunduqda (1918-ci il 22 aprel) İrəvan quberniyası onun tərkibinə qatıldı.

Rusiya Sovet Federativ Sosialist Respublikası (RSFSR) hököməti Irəvan quberniyası və Osmanlı imperiyasında yaşayan ermənilərdən özünün siyasi məqsədləri üçün istifadə etmək xəttini həyata keçirirdi. 1917-ci il dekabrın 17 (30) –da Millətlərin işləri üzrə Xalq Komissarlığında erməni işləri üzrə ayrıca komissarlıq yaradılmışdı. RSFSR Xalq Komissarları Soveti 1917-ci il dekabrın 27 –də (1918 ci il 11 yanvar) "Türkiyə Ermənistanı haqqında dekret" qəbul etdi. Rus hərbi hissələrinin Qafqaz cəbhəsindən geri çağırılması (1917-ci il dekabr - 1918-ci il yanvar) daşnakların mövqeyini xeyli gücləndirdi. İrəvan quberniyasında azərbaycanlılara qarşı soyqırım daha da genişləndirildi.

Zaqafqaziya seyminin dağılmasından sonra (1918-ci il 26 may) daşnaklar 1918 –ci il mayın 28-də Tiflisdə Erməni (Ararat)

Resdpublikasının yaranmasını elan etdilər[1].

1918-ci il mayın 29-da Tiflisdə Azərbaycan Milli Şurasının iclası keçirildi. İclasın 3 nömrəli protokoluna görə, Fətəli xan Xoyski Şura üzvlərinin Azərbaycan və Erməni federasiyası ərazilərinin sərhədləri məsələsinə dair Erməni Milli Şurası ilə apardıqları danışıqların nəticələri barədə məruzə etmişdir. Xoyski məruzəsində Erməni federasiyasının yaradılması üçün onlara siyasi mərkəz lazım olduğunu, Aleksandropolun (Gümrü) Türkiyəyə keçməsindən sonra belə mərkəzin yalnız İrəvan ola biləcəyi haqqında məlumat verdikdən sonra İrəvanın ermənilərə güzəştə gedilməsinin zəruri olduğunu bildirmişdir. Xəlil bəy Xasməmmədov, Məmməd Yusif Cəfərov, Əkbər ağa Şeyxülislamov, Məhəmməd Məhəmmərov bu məsələ üzrə çıxış edərək, İrəvanın ermənilərə güzəştini tarixi zərurət, labüd bədbəxtlik adlandırdılar. Bu məsələ üzrə səsvermə nəticəsində 28 Şura üzvündən 16-sı İrəvanın güzəşt edilməsinin lehinə, 1 nəfər əleyhinə səs vermiş, 3 nəfər bitərəf qalmışdır (protokolda belə göstərilmişdir). Beləliklə, Azərbaycan Milli Şurası İrəvanın Ermənistana güzəştə gedilməsi haqqında qərar qəbul etmişdir. Azərbaycan Cümhuriyyəti hökümətinin baş naziri Fətəli xan Xoyski mayın 29-da Xarici İşlər naziri Məmməd Həsən Hacınskiyə yazırdı: "Biz ermənilərin bütün mübahisələrə son qoyduq, onlar ultimatumu qəbul edəcək və müharibəni qurtaracaqlar. Biz İrəvanı onlara güzəştə getdik". Milli Şuranın iyunun 1- də keçirilən iclasında həmin məsələyə yenidən baxılaraq, bu bu qərara protest elan edildi. Onu Şuranın İrəvandan olan 3 üzvi imzalamışdı. Milli Şura protesti müzakirə olunmadan iclas protokoluna əlavə etməyi qərara aldı. İrəvanın ermənilərə güzəşt olunması haqqında qərarın qəbul edilməsi, onun əsaslandırılması üçün gətirilən bütün dəlillərə

[1] Азербайджанская Демократическая Республика (1918 - 1920). Законодательные акты. Сб., док. Баку, 1998; Азербайджанская Республика . Документы и материалы. 1918-1920 гг. Баку, 1998; Q.Bayramov. Azərbaycanlıların soyqırımı erməni daşnak hökümətinin dövlət siyasəti olmuşdur. BDU – nun Xəbərləri (humanitar elmlər seriyası), 2002, № 1; S.Əsədov. Ermənistan azərbaycanlılarının tarixi coğrafiyası. Bakı, 1995; İ.Məmmədov Tariximiz, torpağımız, taleyimiz; С. Асадов. Миф о "Великой Армении".Баку, 1999; Кавказский календарь на 1917 г., Тифлис, 1916.

baxmayaraq, siyasi cəhətdən tamamilə səhv addım idi. Erməni hökuməti Tiflisdən İrəvana köçdükdən sonra İrəvanda və Azərbaycanın digər tarixi torpaqlarında azərbaycanlılara qarşı soyqırımı törətdi[1].

Ermənistan Respublikası və Osmanlı dövləti arasında bağlanmış 1918-ci il 4 iyun tarixli Batum müqaviləsinə əsasən, Sürməli qəzası, Aleksandropol, Şərur, Eçmiədzin və İrəvan qəzalarının böyük bir hissəsi Osmanlı dövlətinə keçdi. İrəvan quberniyasının ərazisinin üçdə bir hissəsindən azı Ermənistanın əlində qaldı. Lakin Birinci dünya müharibəsində Osmanlı dövlətinin məğlubiyyəti (1918 –ci il Mudros barışığı) onun bu torpaqlarda möhkəmlənməsinə imkan vermədi. Azərbaycan Xalq Cümhuriyyəti də İrəvan quberniyasının tərkibinə daxil olan ərazilərdə hakimiyyətinin bərqərar edilməsində çətinliklərlə üzləşdi. Bundan istifadə edən daşnak hökuməti İrəvan quberniyasında geniş miqyaslı soyqırımı həyata keçirdi. 1917 –ci ilin fevralından 1918 –ci ilin martına qədərki dövrdə İrəvan quberniyasında 200 azərbaycanlı kəndi dağıdılmış, 135 min nəfərdən çox əhali doğma torpaqlarından qovulmuş və ya məhv edilmişdi. Erməni (Ararat) respublikası qurulduqdan sonra azərbaycanlılara qarşı soyqırım dövlət siyasətinə çevrildi. Amerika alimləri Castin və Karolin Makkartilərin məlumatına görə, qarşıdurmanın sonunda (1920 –ci il nəzərdə tutulur) İrəvan quberniyasında 180000 müsəlman əhalisinin üçdə ikisindən çoxu ya öldürülmüş, ya da qaçqın düşmüşdü[2]. Azərbaycan Xalq Cümhuriyyəti hökuməti İrəvan quberniyasında azərbaycanlılara qarşı qırğın və deportasiya siyasətinin qarşısını almaq üçün tədbirlər görməyə çalışırdı. Lakin erməni daşnak hökuməti bu sahədə fəaliyyətini davam etdirirdi. Azərbaycanlılara qarşı soyqırımın həyata keçirilməsində Andronik, Dro, Njde və b. öz amansızlıqlarına görə xüsusilə fərqlənirdilər. Lakin azərbaycanlılar doğma torpaqları

---

[1] Fətəli xan Xoyski. Həyat və fəaliyyəti (sənəd və materiallar). Bakı, 1998; Азербайджанская Республика. Документы и материалы. 1918-1920 гг. Баку, 1998.

[2] Дж. Маккарти, К.Маккарти. Тюрки и армяне. Руководство по армянскому вопросу. Баку, 1996, стр. 80.

uğrunda qeyri – bərabər mübarizəni davam etdirirdilər. Bakıda təşkil edilmiş İrəvan Quberniyası Müsəlmanlarının Həmyerlilər Cəmiyyəti də quberniyada yaşayan azərbaycanlılarla həmrəylik sahəsində fəal iş aparırdı.

1920-ci il noyabrın 29-da Ermənistanda sovet hakimiyyəti quruldu. Bu, Ararat Respublikasından sonra Qərbi Azərbaycanda qurulmuş ikinci erməni dövləti idi. Lakin azərbaycanlılar əhali içərisində xüsusi çəkiyə malik olmaqda davam edirdi.

Ermənistan SSR hökümətinin mövcud olduğu bütün dövr ərzində onun fəaliyyətinin ən başlıca istiqamətlərindən biri burada yaşayan azərbaycanlılara və Azərbaycan SSR- ə qarşı yönəlmişdi. Ermənistan SSR hər vasitə ilə əhalisinin etnik tərkibinin dəyişdirilməsinə çalışırdı. Bu məqsəalə Ermənistanın erməniləşdirilməsi siyasəti həyata keçirildi. Ermənilər içərisindəki təbii artım hesabına onun həyata keçirilməsinin çətinliyi aydın olduğuna görə, "repatriasiya" ("vətənə qayıtma") adı altında xaricdə yaşayan ermənilər Ermənistana gətirilirdi. Yuxarıdakı şərhdən aydın olduğu kimi ermənilərin Ermənistan – Qərbi Azərbaycanda vətəni yox idi, onlar buraya gəlmə idilər. Bu baxımdan ermənilərin Ermənistana gətirilməsi repatriasiya deyil, məqsədli miqrasiya idi. Ermənistan SSR sovet dövləti rəhbərliyinin razılığı ilə 1921- 1936-cı illərdə dünyanın müxtəlif ölkərindən 42 min erməni miqrantını ölkəyə gətirir. 1941-1945 – ci illər müharibəsinin sonlarından bu daha kütləvi şəkil alır. SSRİ hökümətinin razılığı ilə 1945-ci ilin noyabrında xaricdə yaşayan ermənilərin Ermənistana köçürülməsinin təşkili başlandı. Ermənistan höküməti yanında xüsusi Komitə yaradıldı. 1946-1948-ci illərdə dünyanın müxtəlif ölkələrindən Ermənistan SSR-ə 100 mindən çox erməni köçürüldü. Xaricdə yaşayan ermənilərin Ermənistana köçürülməsi siyasəti, sonralar da davam etdirildi[1].

Ermənistanın erməniləşdirilməsini yalnız əhalinin etnik tərkibinin dəyişdirilməsi kimi qəbul etmək doğru olmazdı. Bu

---

[1] История армянского народа. Ереван, 1980, стр. 335-336, 365- 366.

Ermənistanın xaricdəki erməni mərkəzləri ilə əlaqəsini gücləndirir, Ermənistanın inkişafına əlavə stimul yaradır, azərbaycanlıların sıxıdırılmasını sürətləndirirdi.

Bu siyasətlə birgə Ermənistan daxilində bütün qüvvələr oradan azərbaycanlıların sıxışdırılması və deportasiyasına yönəlmişdi. Bu məqsədlə azərbaycanlı yer adları kütləvi şəkildə dəyişdirilir, azərbaycanlı yaşayış məskənlərinin sosial – iqtisadi və mədəni inkişafına əngəllər törədilir, inzibati idarə sistemində azərbaycanlılara yer verilmir, hər bir imkandan istifadə edərək onların deportasiyasına cəhd olunurdu.

Ermənistanda Azərbaycan mənşəli toponimlərin dəyişdirilməsi manyakcasına həyata keçirilmişdi. "Vandalizm: Tarixi adlara qarşı soyqırımı" kitabında yazılır: "...İndiki Ermənistanda azərbaycanlılara məxsus yaşayış məntəqələrinin adlarının və digər toponimlərin dəyişdirilməsi prosesinə ilk dəfə 1919 –cu ildə Ermənistan Respublikası hökümətinin qərar ilə başlanılmışdır. Ermənistanda sovet hakimiyyəti qurulduqdan sonra 1935 –ci ilədək orada 190-dan artıq azərbaycanlı yaşayış məntəqələrinin adları dəyişdirilmişdir. Sonrakı dövrlərdə azərbaycanlılara məxsus tarixi adların dəyişdirilməsi prosesi daha da sürətləndirilərək kütləvi miqyas almış və 1991-ci ildə Ermənistan Respublikası yaradıldıqdan sonra əsasən başa çatdırılmışdır"[1].

Ermənistanda sovet hakimiyyəti qurulduqdan sonra 1918-1920 –ci illərdə daşnak hökuməti tərəfindən didərgin salınmış azərbaycanlıların geri qayıtmasına mane olmaqla birgə, qalan azərbaycanlıların deportasiyasına cəhd edilirdi. Bu şəhər yerlərində xüsusən dövlətin paytaxtı İrəvan şəhərində özünü daha aydın göstərirdi. 1922-ci ildə İrəvan şəhərində cəmi 5124 nəfər azərbaycanlı qalmışdı. Ermənilər isə 40369 nəfər idi.

Kənd yerlərində yaşayan azərbaycanlıların deportasiyası da gündəmdə dururdu. Ermənistan hökuməti 1947-ci ilin sonlarında belə bir imkan yarada bildi. 1948- 1953 –cü illərdə on minlərlə

---

[1] Vandalizm:tarixi adlara qarşı soyqırım. Bakı, 2006, səh. 5-6.

azərbaycanlı Ermənistan SSR –dən deportasiya edildi[1]. Beləliklə, Ermənistan SSR əhalisi tərkibində azərbaycanlıların sayının azaldılması həyata keçirildi.

Ermənistan Azərbaycan SSR ilə münasibətdə əsas xətti ona qarşı ərazi iddiaları irəli sürülməsindən ibarət idi. 1921-ci il mart Moskva və oktyabr Qars müqavilələri ilə Naxçıvana olan iddiaların qarşısı kəsildi. Zəngəzurun taleyi isə faciəli oldu. Ermənilər bu tarixi Azərbaycan torpaqlarının böyük bir hissəsini ilhaq etdilər. Dağlıq Qarabağa olan iddialar isə 1923 –cü ildə Azərbaycan SSR tərkibində Dağlıq Qarabağ Muxtar Vilayətinin (DQMV) yaranması ilə nəticələndi. Lakin ermənilər bununla kifayətlənmədilər. 1929- 1930 –cü illərda Naxçıvan MSSR – in bir sıra torpaqları ələ keçirildi. 1938 –ci ildə Qazax və Gədəbəyin bir sıra torpaqlarının Ermənistana verilməsi barədə Azərbaycanda protokol imzalandı. 1945-ci ildə isə DQMV –nin Azərbaycandan qoparılmasına yeni cəhd cəhd edildi, lakin bu baş tutmadı. Ermənistan 1969- cu il mayın 7-də 1938 – ci il protokolunun Azərbaycan tərəfindən yenidən təsdiqinə nail oldu. Lakin Heydər Əliyevin hakimiyyətə gəlməsindən sonra onun icrası dayandırıldı. Bu planı, yalnız 1984-cü ilin oktyabrında reallaşdırmaq mümkün oldu[2].

Bütün bunlarla eyni zamanda Mərkəzi (Moskva) və Azərbaycan SSR- in partiya – dövlət elitasında yer tutan ermənilər və ermənipərəst qüvvələr vasitəsilə ölkənin mövqeyinə maksimum zərbə vurulur, onun tərəqqisinə maneçilik törədilirdi. 1937- 1938 –ci illərdə Azərbaycan SSR –də repressiyaların həyata keçirilməsində və miqyasının genişlənməsində ermənilərin xüsusi xidməti olmuşdu[3].

Daha bir xətt isə güclü erməni təbliğatı vasitəsilə Azərbaycan xalqının maddi və mənəvi irsinin mənimsənilməsinə, onun tarix və mədəniyyətinin təhrifinə yönəlmişdi.

Bütün tarixi boyu olduğu kimi sovet dövründə də bu siyasi platformanın baçlıca ideoloji mərkəzi erməni kilsəsi idi. İ. Stalinin

---

[1] A.Paşayev .Köçürülmə. Bakı, 1995.
[2] Azərbaycan Respublikası. 1991- 2001. Bakı, 2001, səh. 43.
[3]Z. Bünyadov. Qırmızı terror. Bakı, 1993.

xüsusi səyi nəticəsində 1941-14945 –ci illər müharibəsinin sonlarında Eçmiədzinin mövqeyi daha da möhkəmləndirildi[1]. Bunun nəticəsi idi ki, Ermənistanın azərbaycanlılara qarşı təcavüzkar siyasətində dini ekstremizm də həlledici yer tutmuşdu.

Ermənilərin Azərbaycanlılara və Azərbaycan SSR –ə qarşı yönəlmiş siyasəti 1980 –ci illərin ortalarından son mərhələsinə qədəm qoydu. Bu hər şeydən əvvəl, SSRİ –də baş verən hakimiyyət dəyişikliyi nəticəsində ermənipərəst M.S Qorbaçovun dövlət rəhbərliyinə gəlməsi və həyata keçirdiyi siyasi kursla bağlı idi. 1987 –ci ildə Heydər Əliyevin SSRİ rəhbərliyindən uzaqlaşdırılması erməniləri daha da fəallaşdırdı. Ermənistan Azərbaycan SSR –in Dağlıq Qarabağ Muxtar vilayətinə qarşı ərazi iddiası irəli sürdü. Əvvəlcədən hazırlanmış plan əsasında DQMV – nin terrorçu – separatçı qüvvələri Ermənistanla əlbir olaraq, Azərbaycana qarşı çıxdı. Ermənistan rəhbərliyinin dəstəyi ilə azərbaycanlıların dədə - baba torpaqlarından zorla, vəhşicəsinə qovulması prosesi başladı. Bu zorakı deportasiya zamanı azərbaycanlılara qarşı soyqırım tətbiq edildi. 1991-ci ilin avqustunda Nüvədi kəndi əhalisinin qovulması ilə azərbaycanlıların tarixi torpaqlarından deportasiyası prosesi başa çatdı. Ermənistan öz ərazisindəki azərbaycanlı yaşayış məskənlərini faktiki olaraq işğal etdikdən sonra, Azərbaycana qarşı açıq müharibəyə başladı. Qərbi Azərbaycan ərazisində üçüncü Ermənistan Respublikası elan edildikdən sonra, ermənilərin təcavüzkar xətti daha da gücləndi. Ermənistan silahlı qüvvələri Rusiya ordu hissələri ilə birgə 1992 –ci il fevralın 26- da Xocalıda azərbaycanlılara qarşı soyqırım törətdi. Dağlıq Qarabağ və onun ətrafında yeddi rayon işğal olundu.

Azərbaycan Respunlikası Ermənistanın işğalçı siyasətinin nəticələrini aradan qaldırmaq üçün fəal hərbi – siyasi iş aparır. İşğal olunmuş torpaqların, dövlətin ərazi bütövlüyünün bərpa edilməsi üçün sülh danışıqları aparılır, lakin hərbi yol istisna edilmir.

Azərbaycan Respublikasının prezidenti İlham Əliyevin bu

---

[1] В.А.Алексеев. Собор в Эчмиадзине\\ Иллюзин и догмы. М., 1991, стр. 347- 358.

sahədəki diplomatik fəaliyyəti problemin həllinə münasibətdə yeni mərhələ açmışdır. Burada tarix və müasirliyin vəhdəti aparıcı yer tutur. Azərbaycan Respunlikası müasir dünyada yaranmış real vəziyyəti nəzərə alır, bununla birgə tarixi hüquqlarının əhəməyyitini də bəyan edir. Prezident İlham Əliyev Azərbaycan torpaqlarında ikinci erməni dövləti yaradılmasına yol verməyəcəyini dəfələrlə bildirmişdir. Lakin qədim Azərbaycan torpağı olan İrəvanda yaradılmış birinci dövlətin də taleyinin məhz Azərbaycan Respublikasının hərbi – siyasi mövqeyindən asılı olduğu dünyaya bəyan edilmişdir.

# G İ R İ Ş

İrəvan xanlığı – Azərbaycan xanlıqları arasında həm siyasi, həm də iqtisadi cəhətdən Azərbaycan tarixçiləri tərəfindən nəinki az öyrənilmiş, hətta demək olar ki, unudulmuşdur. Bu “laqeydliyin” əsas səbəbi bu olmuşdur ki, həmin xanlığın ərazisində yerləşən müasir Ermənistan respublikası Sovet hakimiyyəti illərində müttəfiq respublika sayıldığına görə Azərbaycan alimləri “qardaşlıq” naminə erməni xalqının “qəlbinə” toxunmamış, tarixən Azərbaycana məxsus olan İrəvan xanlığından üz çevirmiş və beləliklə də qədim Azərbaycan torpağını elmi baxımdan hələ XX əsir 20 –ci illərindən erməni “qardaşlarımıza” bağışlamışlar.

Həmin torpaqda XVIII əsrin ikinci yarısında yaranan xanlığı azərbaycanlılar idarə etdiklərinə görə erməni tarixçiləri də öz növbələrində bu məsələnin üstündən vaz keçmiş, yalnız Eçmiədzin ( üş müəzzin, üç kilsə) monastırının tarixini tədqiq etmişlər[1]. Ədalət naminə qeyd etməliyik ki, V. R. Qriqoryan yeganə erməni tarixçisidir ki, İrəvan xanlığının tarixini araşdırmağa səy göstərmişdir. Həmin tarixçi İrəvan xanlığının təqribən 80 illik tarixinin yalnız 20 ilinə (1780- 1800) dissertasiya həsr etmiş və onu 1958 – ci ildə erməni dilində kitab halında çap etdirmişdir[2].

Belə bir sual ortaya çıxa bilər: nə üçün erməni tarixçisi tədqiqat üçün yalnız XVIII əsrin 80- 90 –cı illərini seçmişdir? Məsələ burasındadır ki, 1783 –cü ildə Kartli – Kaxetiya çarlığı Rusiya dövlətinin protektoratını qəbul etdikdən sonra bu hadisə sanki Cənubi Qafqazda məskunlaşan və dövlətləri olmayan ermənilərə ümid və qol – qanad verdi. Onlar münbit Azərbaycan torpağında “Erməni dövlətini” yaratmaq həvəsinə düşərək müxtəlif məktublarla dönə - dönə Cənubi Qafqazda xristian dövləti yaratmaq arzusu ilə Rusiya dövlətinə müraciət etdilər. Həmin məktubların üzü bu günə kimi “Mətndaran” da (“Matenadaran” da) və Rusiyanın arxivlərində

---

[1] Б.М.Арутюнян. Крупное монастырское хозяйство в Армении в XVII- XVIII вв. Ереван, 1940; С.Ереванци. Джамбр. М., 1958.

[2]В.Р.Григорян. Ереванское ханство в конце XVIII столетия (1780-1800). Ереван, 1958.

saxlanılır.

1796 –cı ildə rus qoşunları Cənubi Qafqaza yürüş etdikləri zaman erməni "vətənpərvərləri" yenidən canlanaraq baş qaldırıb Rusiya dövlətinə Azərbaycan torpağında ermənilər üçün dövlət yaradılması barədə müraciət etdilər. Həmin məktubların surətləri də yuxarıda adları çəkilən arxivlərdə saxlanılmışdır. Məhz belə sənədlər erməni tarixçisinə İrəvan xanlığının 1780 – 1800 –cü illərdəki tarixini " işıqlandırmaq" üçün bir növ "əsas" olmuşdur. Onu da qeyd edək ki, İrəvan xanlığının tarixini tədqiq edərkən V.R.Qriqoryan yalnız tarixi hadisələrə toxunmuşdur.

İrəvan xanlığının ictimai – iqtisadi tarixinə gəldikdə isə qeyd etməliyik ki, Ermənistan tarixçiləri bu məsələyə yalnız " Üç kilsə" monastırının malikanəsinə aid olan feodal münasibətlərini araşdıraraq, xanlığın bütövlükdə ictimai – iqtisadi problemi barədə bir kəlmə də yazmamışlar, guya heç belə bir xanlıq müvcud da olmamışdır. Halbuki, İrəvan şəhərindəki "Mətndaran" Əlyazmaları İnstitutunda bu barədə külli miqdarda sənədlər saxlanılır. Həmin sənədlərdən Azərbaycan mütəxəssislərinə istifadə etmək bir neçə il bundan qabaq yasaq edilmişdir. Biz belə sənədlərlə "durğunluq illərində" tanış olmağa müvəffəq olmuşuq. "Üç kilsə" monastırına aid olunub nəşr edilmiş əsərlərdə İrəvan xanlığına dair xeyli sənəd vardır ki, biz həmin mövzü üçün onlardan az- çox istifadə edə bilmişik.

İrəvan xanlığının siyasi və ictimai – iqtisadi tarixinə dair xeyli material XIX əsrin birinci yarısında rus mütəxəssisləri tərəfindən yazılmış kitablarda öz əksini tapmışdır. Məsələ burasındadır ki, Cənubi Qafqazı işğal etdikdən sonra çar hökuməti əvvəllər burada mövcud olan qayda – qanunu öyrənib, yeni tədbirlər həyata keçirmək məqsədi ilə öz məmurlarına bu torpaqların təsvirini tərtib etməyi tapşırmışdı. Məhz bunun nəticəsində həmin dövrdə Cənubi Qafqazın təsvirini əks etdirən onlarca kitab işıq üzü görmüşdür. Həmin kitablar indiki dövrdə əvəzolunmaz mənbələrdir.

# İRƏVAN XANLIĞININ YARANMASI

Azərbaycan tarixinin ən mühüm dövrlərindən biri olan xanlıqlar dövrü XVIII əsrin ikinci yarısıdır. Həmin dövrün səciyyəvi xüsusiyyətlərindən ən başlıcası ondan ibarətdir ki, bu zaman Azərbaycan əsrlərdən bəri itirdiyi müstəqilliyi yenidən əldə edirsə də, tarix səhnəsində vahid dövlət halında deyil, bir – birindən asılı olmayan, müstəqil və xarici siyasət aparan xanlıqlar simasında çıxış etmişdir.

Belə xanlıqlardan biri də mərkəzi İrəvan şəhəri olan sabiq Çuxursəd bəylərbəyiliyinin ərazisində yaranmış İrəvan xanlığıdır. Müstəqil, lakin xırda feodal dövlətinə çevrilməzdən əvvəl İrəvan xanlığı mürəkkəb və uzun tarixi yol keçmişdir.

Məlum olduğu kimi, XVI əsrin lap əvvəllərində Təbriz şəhəri mərkəz olmaqla, böyük bir ərazidə Səfəvi dövləti yaranmışdı. Bu dövlət 1514 –cü ildən başlayaraq müəyyən fasilələrlə, XVIII əsrin 30-cü illərinə kimi Osmanlı Türkiyəsi ilə qanlı müharibələr aparmışdır. Həmin müharibələr zamanı ucsuz – bucaqsız Səfəvi dövlətini idarə etmək çətinləşdiyinə görə XVII əsrin 30-cu illərində inzibati cəhətdən Qızılbaş tayfaları arasında bəylərbəyilik adlanan on üç əyalətə bölünmüşdü. Belə əyalətlərdən biri mərkəzi İrəvan (Rəvan) şəhəri olan Çuxursəd bəylərbəyiliyi idi.

Bəylərbəyiliklər də öz növbəsində inzibati cəhətdən bir neçə mahallara bölünürdü. Bu mahalları idarə edən şəxs xan və yaxud sultan rütbəsini daşıyırdı.

Çuxursəd bəylərbəyiliyinə Maku, Sədərək, XVII əsrin əvvəllərindən etibarən Naxçıvan vilayətləri, habelə Bəyazid qalası, Şadilu tayfasının vilayəti, kürdlərin dumbulu tayfasının vilayəti və Maqazberd daxil idi. Sərhəd boyunca yerləşən digər bəylərbəyiliklərdə olduğu kimi, Çuxursəd bəylərbəyiliyində də Səfəvi şahları daima nizami qoşun hissələri saxlayırdılar.

Hər bir bəylərbəyilikdə hakimdən (bəylərbəyi, əmir və yaxud əmir- ümara) başqa dini məsələləri həll edən və şəriət məhkəməsinin baş hakimi olan şeyx – ül – islam, vəqf malikanəsini idarə edən sədr, bəylərbəyinin müavini canişin (o bəylərbəyinin hərəkətlərinə göz gəzdirir və bu barədə şaha məlumat verirdi), vilayət vəziri də olurdu.

Çuxursəd bəylərbəyini Səfəvi şahları tərəfindən təyin edilmiş iki Azərbaycan tayfasının (ustaclu və qacar) nümayəndələri idarə etmişlər. XVI əsrdə bu bəylərbəyin ilkin hakimi 1538 –ci ildə təyin edilmiş Bədir xan Ustaclu olmuşdur. Sonradan onu həmin vəzifədə Şah Qulu Sultan Ustaclu və Məhəmməd xan Toxmaq Ustaclu əvəz etmişdilər[1].

XVI əsr Səfəvi dövləti tarixinin ən mürəkkəb dövrlərindən biri idi. Bu dövrün başlıca əlaməti 1514, 1533, 1538, 1548, 1555, 1578-ci illərdə baş vermiş və fasilələrlə davam etmiş möharibələr olmuşdur. Bu müharibələr, əsas etibarilə Azərbaycan ərazisində d

getdiyinə görə ağırlıq da müharibə bölgəsində yaşayanların üzərinə düşmüşdür. Osmanlı – Səfəvi müharibələri zamanı Çuxursəd bəylərbəyiliyinin paytaxtı İrəvan şəhəri çox zaman hərbi əməliyyatların mərkəzində olmaqla bərabər, gah Osmanlı əsgərlərinin əlinə keçmiş, gah da Səfəvi qoşunları tərəfindən geri alınmışdır.

Osmanlı – Səfəvi müharibələrini şərh etmək məqsədimizə uyğun olmadığından və bu barədə kifayət qədər ədəbiyyat olduğundan biz ötəri olsa, yalnız Çuxursəd bəylərbəyiliyinə aid hərbi əməliyyatlardan bəhs edəcəyik.

1514, 1533 və 1538 –ci illərdə Baş verən müharibələrdə Osmanlı qoşunları qələbə qazansalar da  Səfəvi dövlətinin ərazisini tərk etməli olmuşlar. 1548 –ci il müharibəsi də Səfəvi ordusunun qələbəsi ilə nəticələndi, lakin osmanlılar bu məğlubiyyətlə barışmayaraq, intiqam almaq hissi ilə yeni hücumlara hazırlaşdılar. Bu dəfə Türkiyə sultanı III Muradın (1574- 1595) göstərişi üzrə türk

[1] И.П.Петрущевский. Очерки по истории феодальных отношений в Азербайджане и Армении в XVI – начале XIX вв., Л., 1948, стр. 121.

əsgərlərinin ali baş komandanı Mustafa Lələ paşa Ərzurumla yüz minlik qoşunu müharibəyə hazırlamaqla bərabər, Türkiyənin vasssalı Krim xanı II Məhəmməd Gərayı da (1577- 1584) nəzərdə tutulan yürüşdə iştirak etməyə çağırdı.

Düşmən qoşunlarının Qars şəhərinin ətrafında birləşmələri xəbərini eşidən Çuxursədin bəylərbəyi Məhəmməd xan Toxmaq Ustaclu vaxt itirmədən bu barədə o zaman dövlətin paytaxtı olan Qəzvinə çapar göndərib, yaxınlaşan təhlükə barəsində şaha xəbər verdi. Vurduğu həyəcana cavab almayan və düşmən qoşunlarının Qars tərəfdən hərəkət etdiyini görən Məhəmməd xan Toxmaq yaxın qohumlarından Cənubi Azərbaycan bəylərbəyi Əmirxan Türkmənə və Qarabağ bəylərbəyi İmamqulu xan Qacara müraciət edərək qüvvələrini birləşdirib düşmənə birlikdə müqavimət göstərməyi təklif etdi.

Müraciət olunmuş bəylərbəyindən yalnız İmamqulu xan Qacar Məhəmməd xan Toxmağın xahişinə cavab olaraq, öz qoşunları ilə İrəvan şəhərinə gəldi. Lakin mütəffiqlərin qoşunu Osmanlı ordusu qarşısında sayca xeyli zəif idi- təqribən 15 min.

Düşmənin avanqardı ilə ilkin toqquşma zamanı qələbə çalan Qızılbaş qoşunları osmanlıları təqib etməyə başladıqları zaman özləri gözlənilmədən çoxsaylı türk əsgərləri ilə üzləşmiş oldular və nəticədə məğlub olmuşlar. Bu hadisədən sonra Osmanlı ordusunun əsas qüvvələri qızılbaşların hərbi qüvvələri üzərində qələbə çalmışlar.

1583 –cü ildə Çuxursəd bətylərbəyiliyinə Türkiyə tərəfindən daha bir hərbi yürüş edildi. Həmin ildə sərkərdə Fərhad paşanın komandası altında türk əsgərləri Səfəvi dövlətininərazisindən keçərək Çuxursəd istiqamətində hərəkət etdilər.

Çoxsaylı düşmən ordusunun yaxınlaşmasını eşidən bəylərbəyi Məhəmməd xan Toxmaq Ustaclu yenidən kömək üçün Qarabağ bəylərbəyinin hakimi Əmir xan Türkmənə müraciət etdi. Lakin bu zaman şah Məhəmməd Xudabəndə (1578- 1587) sərhəddən xeyli uzaqda – Xorasanda olduğundan həmin bəylərbəyilər Məhəmməd xan Toxmağın müraciətinə cavab vermədilər. Köməksiz qalan

Məhəmməd xan İrəvan şəhərini tərk edib Naxçıvanda sığınacaq axtarmağa məcbur oldu. İrəvanı alan Fərhad paşa şəhərin qala divarlarının müdafiə qabiliyyətini möhkəmləndirmək məqsədilə bir illik azuqə ehtiyatı ilə bir qarnizon qoyub geri çəkildi. Bir qədər sonra türk qarnizonu da İrəvanı tərk etdi.

Lakin bu heç də Osmanlı Türkiyəsinin sülhsevərlik siyasətini nümayiş etdirmirdi. İki ildən sonra, 1585- ci ildə türk sərkərdəsi Osman paşanın başçılığı ilə Səfəvi dövlətinin ərazisinə yeni hücum hazırlandı. Bunu görən Çuxursəd bəylərbəyiliyinin hakimi Məhəmməd xan Toxmaq müqavimət göstərməyi yersiz hesab edib, şah Məhəmməd Xudabəndənin istirahətdə olduğu Qarabağa pənah apardı.

Beləliklə, Çuxursəd bəylərbəyiliyi və İrəvan şəhəri bir daha osmanlı əsgərlərinin əlinə keçdi.

Bu hadisədən sonra şah Məhəmməd Xudabəndə müəyyən tədbir görməyə məcbur oldu. O bütün bəylərbəyilərə öz qoşunları ilə Təbrizdə cəmləşməyi əmr etdi. Bəylərbəyilərin əksəriyyəti şahın əmrinə tabe olmadı. Bu zaman şah Məhəmməd Xudabəndə Çuxursəd bəylərbəyiliyində hakimiyyətini itirən Məhəmməd xan Toxmağı Qızılbaş qoşunlarının başında döyüşə göndərdi. Sufyan adlanan yerdə ilk toqquşma zamanı qələbə çalan Qızılbaş qoşunları, sonradan çoxsaylı türk əsgərləri tərəfindən məğlubiyyətə uğradılar.

Beləliklə, müharibədə qələbə çalan Osmanlı Türkiyəsi Səfəvi dövlətinin ayrılmaz bir hissəsi olan Azərbaycanın bir çox torpaqlarına, o cümlədən Çuxursəd bəylərbəyiliyinə də sahib oldu. İşğal olunmuş ərazilərdə Türkiyə sultanı öz nümayəndələrini hakim təyin etdi. Türkiyənin Çuxursəd bəylərbəyiliyinin ilk hakimi Xızır paşa təyin edildi. Ona eyni zamanda Naxçıvan ölkəsini də idarə etmək həvalə edildi[1].

XVI əsrin sonlarında Səfəvi dövlətində gələcəkdə ciddi nəticə verə biləcək dəyişiklik baş verdi. 1587-ci ildə saray çevrilişi zamanı

---

[1] А.А.Рахмани. "Тарих – и аламарай- и Аббаси" как источник по истории Азербайджана. Баку, 1960, стр.82.




*İrəvan xanlığı. XVIII əsrin II yarısında.*



*Rus ordusunun İrəvanı işğal etməsi (1827). Rəssam Rubo.*

Məhəmməd Xudabəndəni Səfəvi taxtında onun oğlu I Abb as əvəz etdi.

Yeni şah Səfəvilərin Osmanlı Türkiyəsi ilə apardıqları uğursuz müharibələrə fasilə vermək və gələcəkdə ciddi döyüşlərə hazırlaşmaq məqsədilə 1590- ci ildə Osmanlı Türkiyəsi ilə sülh müqaviləsi bağladı.

Müəyyən hazırlıqdan sonra I Şah Abbas 1602- ci ildə Osmanlı Türkiyəsi tərəfindən işğal olunmuş bir sıra kəndləri və yaşayış məntəqələrini azad edərək, İrəvan qalasına yaxınlaşdı. 1604-cü il iyunun 8 -də İrəvan qalasında Şərif paşanın başçılığı altında müqavimət göstərən türk qarnizonu qızılbaşlara tabe oldu.

İrəvan qalası alındıqdan sonra I Şah Abbas fəallıq göstərən sərkədəklərindən Əmir Qunə xanı Çuxursəd bəylərbəyiliyinin hakimi təyin etdi.

1605 –ci ildə Qızılbaş qoşunlarının müvəffəqiyyətli yürüşünün qarşısı alındı. Həmin ildə Osmanlı Türkiyəsinin sərkərdəsi Sinan Paşa Ciqal oğlu çoxsaylı ordu ilə yenidən Azərbaycan torpaqlarına həmlə etdi. Bu hadisə ilə əlaqədar I Şah Abbas sərt tədbirlərə əl atmağa məcbur oldu. O, müvəqqəti olaraq geri çəkilməyi qərara alıb, türk əsgərlərinin tuta biləcəyi şəhər və kəndlərdən əhalini olub – qalan ərzaq məhsulları ilə birlikdə ölkənin daxilinə köçürtdürdü.

Tarixdə "Böyük sürgün" adlanan bu əməliyyatda ən ağır zərbə Çuxursəd bəylərbəyiliyi və Naxçıvan ölkəsinin əhalisinə dəydi[1].

Çuxursəd bəylərbəyiliyinin ərazisi və İrəvan şəhərinin "boşaldılması" əməliyyatını I Şah Abbas Əmir Qunə xanın özünə həvalə etdi. Şahın əmrilə Çuxursəd bəylərbəyiliyinin əhalisinin əksəriyyəti Araz çayının cənubunda yerləşən Qaradağ əyalətinə köçürüldü.

Tezliklə I Şah Abbasın "sürgün" əməliyyatı öz bəhrəsini

---

[1] И.П.Петрущевский. Азербайджан в XVI – XVII веках. Сборник статей по истории Азербайджана. Баку, 1949, стр. 277.

verdi: Çuxursəd ərazisini işğal etmiş Sinan Paşa Ciqal oğlunun başçılıq etdiyi türk əsgərləri aclıqla üzləşib geri qayıtmağa məcbur oldular.

Bunu görən Qızılbaş ordusu əks hücuma keçərək 1606 –cı ildə Çuxursəd bəylərbəyiliyini büsbütün türk əsgərlərindən təmizlədilər. İrəvan şəhərində yenidən Əmir Qunə xanın hakimiyyəti bərpa olundu.

Əmir Qunə xan fəaliyyətə başlar – başlamaz Çuxursəd bəylərbəyiliyinin ərazisinə həmin dövrdə Şimal – Şərqi Azərbaycanda və Qarabağda feodal istismarına qarşı üsyan etmiş kəndli dəstələri daxil oldular. Əmir Qunə xan tezliklə qiyamçıları məğlub edib, üsyanın başçısını- tarixdə "Mıxlı Baba" adı ilə məşhur olan şəxsi həbs edib dövlətə təhvil verdi[1].

Tarixi hadisələr tez – tez cərəyan etdiyindən Əmir Qunə xan Çuxursəd bəylərbəyiliyini tələb olunan səviyyədə idarə edə bilmədi : 1616 –cı ildə başda Türkiyənin baş vəziri Məhəmməd Paşa olmaqla, çoxsaylı Osmanlı ordusu yenidən Azərbaycan ərazisinə soxuldu və həmin ilin payızında Çuxursəd bəylərbəyiliyinin paytaxtını ələ keçirə bilmədilər[2]. İrəvan qalasının müdafiəsinə şəxsən Əmir Qunə xanın özü rəhbərlik edirdi.

Bu hadisədən sonra Əmir Qunə xan bir müddət hərbi əməliyyatlarda iştirak etmədən, Çuxursəd bəylərbəyiliyi daxilində mülki məsələlərlə məşğul oldu.

Səfəvi dövlətinin hər yerində olduğu kimi, Çuxursəd bəylərbəyiliyində də 5 torpaq mülkiyyəti mövcüd idi: dövlət torpaqları (divani), şah ailəsinə mənsub olan torpaqlar (xalısə), feodalların şəxsi torpaqları (muma), dini müəssisələrin torpaqları (vəqf), kəndli icmasına (camaat) məxsus torpaqlar. Burada da dövlət qarşısında müəyyən xidmət göstərmiş şəxslərə şərti mülkiyyət forması olan "soyurqal" verilirdi.

Əhalinin böyük əksəriyyətini təşkil edən kəndlilərin vəziyyəti

---

[1] Yenə onun: Азербайджан. Очерки истории СССР (XVII в.), М., 1955 г.

[2] A.A.Rəhmani. Göstərilən əsəri, səh. 120.

Səfəvi dovlətində istismar olunan kəndlilərin vəziyyətindən fərqlənmirdi. Onlardan da 35 -ə kimi müxtəlif vergi toplanılırdı. Əmir Qunə xan Çuxursəd bəylərbəyiliyini ədalətlə idarə edərək, buraya pənah gətirən xristianların – ermənilərin yaşayıb – yaratmaqları üçün də şərait yaradırdı. O, 1441-ci ildə Kilikiyadan qovulmuş, bu məmləkətə pənah gətirib özlərinə sığınacaq tapmış və Eçmiədzinə (Üç kilsə) monastırında sakin olmuş erməni katolikoslarının fəaliyyətini də məhdudlaşdırmamışdır. Həmin vaxtdan başlayaraq Eçmiədzin (Üç kilsə) bütün ermənilərin dini paytaxtına çevrilmişdi[1].

Əmir Qunə xanın dinc fəaliyyətinə son qoyuldu. O, müharibələrdən aldığı yaralardan heç cürə yaxa qurtara bilmədi. Bunu görən I Şah Abbas xanı öz sarayına dəvət etdi, yerinə isə oğlu Təhmasib Qulu bəyi göndərdi. 1625-ci ildə Çuxursəd bəylərbəyiliyinin əmiri təyin olunan Təhmasib Qulu bəy buranı 10 il (1625-1635) idarə etdi.

1635 –ci ildə Osmanlı Türkiyəsinin başçısı Sultan Murad 700 minlik ordu ilə Azərbaycanın ərazisinə daxil olub, İrəvan qalasına yaxınlaşaraq şəhəri mühasirəyə aldı. Doqquz günlük top atəşindən sonra İrəvan qalası Osmanlı qoşunları tərəfindən alındı. Çuxursəd bəylərbəyi Təhmasib Qulu xan həbs edilib İstanbula göndərildi. Bu hadisədən sonra Təhmasib Qulu xana bir daha Azərbaycana qayıtmaq qismət olmadı. İrəvan şəhərində on iki minlik qarnizon qoyan Sultan Murad Təbrizə hərəkət etdi, lakin buranı ala bilmədiyi üçün İstanbula qayıtdı[2].

Bir ildən sonra – 1636 –cı ildə Şah Səfi (1628- 1642) 100 minlik Qızılbaş ordusunun başında Çuxursəd bəylərbəyiliyinin ərazisinə daxil olaraq türklərin işğal etdikləri İrəvan şəhərini mühasirəyə aldı. Mühasirə 3 ay davam etdi. Azsayloı türk qarnizonu tab gətirməyib tabe oldu. Qaliblər İrəvan qalasında hakim təyin edilən Murtuza paşanı və xeyli türk əsgərini qətlə yetirdilər. Bundan

---

[1] С.П. Еремян. Армения. Очерки истории СССР (XVII в.), М., 1955, стр.946.
[2] Аракел Давврижеци. Книги историй. М., 1973, стр. 494.

əlavə türk sərkərdələrindən Şeyxixan paşa, İbrahim paşa, Mömin paşa həbs edilib İrana göndərildi. Şah Səfi yaxın adamlarından Kəbləli xanı Çuxursəd bəylərbəyinə əmir təyinedib geri döndü[1]. Kəbləli xanın hakimiyyəti dövründə Çuxursəd bəylərbəyiliyində demək olar ki, heç bir ciddi siyasi hadisə baş verməmişdir. Buna əsas səbəb 1639 –cü ildə Səfəvi dövləti ilə Osmanlı imperiyasının arasında bağlanan sülh müqaviləsi idi. Hər iki dövlət arasında yaranmış əmin – amanlıq ölkədə məhsuldar qüvvələrin nisbətən canlanmasına gətirib çıxardı.

I Şah Abbasın sələfləri II Şah Abbasın (1642- 1667) və şah Süleymanın (II Şah Səfinin 1667- 1694) hakimiyyəti dövründə Azərbaycanın ərazisində hərbi əməliyyat aparılmadığından XVII əsrin 80 –90 -ci illərinə kimi bütün ərazilərdə olduğu kimi, Çuxursəd bəylərbəyi dəö uzun sürən müharibənin təsərrüfat həyatına vurduğu yaraları sağaltmaq üçün imkan əldə etdi. Bəzi tarixçilər hətta II Şah Abbasın hakimiyyət illərini bütün Cənubi Qafqaz ölkələrinin iqtisadiyyatının inkişafı üçün uğurlu hesab edirlər[2].

Həmin məsələnin işıqlandırılması xüsusi tədqiqat tələb etdiyi üçün onun üzərində dayanmayacağıq. Lakin Çuxursəd bəylərbəyilərinin fəaliyyətləri ilə bilavasitə bağlı olan bir məsələdən – xristianlara münasibətdən bəhs etməyə bilmərik.

Bununla əlaqədar olaraq qeyd etməliyik ki, erməni tarixçiləri bu günə kimi səfəvilərin – müsəlmanların, daha doğrusu azərbaycanlıların erməniləri təqib etmələrindən, hələ orta əsrlərdən ermənilərin soyqırımından bütün dünyaya car çəkirlər. Əgər erməni tarixçiləri erməni kəndlilərinin istismar olunmalarından yazırlarsa, qeyd etməliyik ki, eyni dərəcədə müsəlman kəndliləri də istismar olunurdular. Səfəvilər dövründə xristianlar dinlərinə görə heç vaxt təqib olunmamışlar[3]. Əksinə, I Şah Abbas olmaqla, demək olar ki, Səfəvi şahlarının hamısı erməni din xadimlərinə və feodallarına xeyirxahlıqla yanaşmışlar, ermənilər heç vaxt, hətta sünni

---

[1]Аракел Даврижеци. Книги историй. М., 1973, стр. 494.
[2] П.Петрущевский. Азербайджан в XVI – XVII веках,. Баку, 1949, стр. 285.
[3] Yenə orada.

müsəlmanlar kimi təqib olunmamışlar. "Matenadaran" da saxlanılan sənədlərin birində deyilir ki, Səfəvi dövlətində bütün xristianlar can vergisi – cizyə verdikləri halda, erməni yepiskopları və monastırları bu vergidən azad olunurdular. Çox zaman erməni ruhanilərindən heç bir vergi toplanılmırdı[1]. Maraqlı burasındadır ki, bəzi şahlar və bəylərbəyilər erməni monastırlarını tikdirir və erməni ruhanilərinə böyük məbləğdə pul da verirdilər[2]. XVII əsrdə yaşayıb – yaratmış erməni din xadimi və tarixçisi Arakel Təbrizlinin yazdığı "Tarix kitabı" nın və "Şanlı monastırların bərpa olunması" adlı fəslində Səfəvi hökmdarlarının erməni din xadimlərinə göstərdikləri "səxavətdən" bəhs olunur.

Çuxursəd bəylərbəyiliyində ermənilərin dini mərkəzi yerləşən Eçmiədzinə (Üç kilsə) dünyanın hər yerindən bütün il boyu ziyarətçilərin gəldiyindən istifadə edərək, onlardan "səlaməti" və ya "xudrahdari" – bir sözlə, "torpaq basdı" vergisi toplayırdılar ki, bu da katolikosların (xəliflərin) gəlirlərinin azaldılmasına və onların etirazını səbəb olurdu.

Çox güman ki, əldə edilən həmin gəlirdən Çuxursəd bəylərbəyiləri şahın xəzinəsinə kifayət qədər məbləğ göndərirmişlər. Heç də təsadüfi deyildir ki, Səfəvi şahları Çuxursəd bəylərbəyiliyində kimin hakim- əmir olması məsələsinə heç də biganə qalmırdılar. Çuxursəd bəylərbəyiliyində Kəlbəli xandan sonra Nəcəf Qulu xan hakimiyyəti illərində, çox güman ki, sülh dövründə həddən artıq "özbaşınalığına yol verərək, dövlət xəzinəsinə tələb olunan məbləği İsfahana göndərməyi "unudurdu". Məhz buna görə də II Şah Abbas 1663 –cü ildə onu vəzifəsindən salıb İrəvana Əmir Qunə xanın oğlanlarından olan Abbas Qulu xanı hakim göndərmişdi.

Abbas Qulu xan Çuxursəd bəylərbəyiliyini XVII əsrin 70 –ci illərinin əvvəlinə kimi idarə etdikdən sonra onu bu vəzifədə adını və dinini dəyişib Səfi xan adını daşıyan gürcü əvəz etmişdir[3].

---

[1] Yenə orada, səh. 281

[2] П.Петрущевский. Азербайджан в XVI – XVII веках, Баку, 1949, стр. 281.

[3] С.А.Мамедов. Исторические связи азербайджанского и армянского народов (II пол. XV в. и первая треть XVII в.) Баку, 1977, стр. 42.

Səfi xanın ölümündən sonra Çuxursəd bəylərbəyiliyinin taxtında Səfi Qulu xan əyləşdi. O, Səfəvi şahlarından və özündən əvvəlki bəylərbəyilərdən fərqli olaraq xristianlara ürəyiyumşaqlıq göstərməyib, onlardan da lazımi vergiləri almağa baəladı. O hətta yağış yağdıqda ermənilərin küçəyə çıxmasına icazə vermirdi ki, onlar küçələri murdarlamasınlar[1].

Səfi Qulu xan dini mənsubiyyətindən və milliyyətindən asılı olmayaraq, hədsiz istismar nəticəsində əhalini var – yoxdan çıxarırdı. O, topladığı vergidən hakim olduğu bölgədə yerləşən hərbi rəislərə müəyyən miqdarda məvacib verməli idi. Lakin Səfi Qulu xan onlar üçün heç bir məbləğ ayırmırdı. 1677 –ci ildə iki il məvacib almayan Qızılbaş hərbi qulluqçuları, o cümlədən 500 süvari Səfi Qulu xanın əleyhinə silah qaldırmalı oldu.

Kəndli kütlələrinin narazılığı hərbçi feodalların arzuları ilə vəhdət təşkil edərək ümumxalq kininə çevrildi. Məsələ o yerə çatdı ki, İrəvan şəhərində üsyançılar bəylərbəyinin sarayını mühasirə edərək onun əmlakını talan etməyə məcbur oldular. Nəticədə Səfi Qulu xan İsfahana qaçmaqla yaxasını üsyançıların əlindən qurtardı. Əlacsız qalan Şah II Səfi Süleyman Çuxursəd bəylərbəyiliyinə Səfi Qulu xanın əvəzinə etibarlı adamlarından olan Zal xanı təyin etdi. Onun hakimiyyəti illərində, XVII əsrin son rübündə bütün Yaxın Şərq ölkələri kimi, Səfəvi dövləti də dərin siyasi və iqtisadi tənəzzül keçirirdi. Bu gerilik Çuxursəd bəylərbəyiliyinin təsərrüfat həyatında da öz əksini tapdı.

Yaxın Şərq ölkələrinin bu tənəzzülü barədə tarixi ədəbiyyatda kifayət qədər məlumat olduğundan, bu məsələnin üzərində dayanmayacağıq. Lakin qeyd etməliyik  ki, bir sıra mənbələrdə XVII əsrin II və III rübündə Səfəvi dövlətinin iqtisadiyyatından bəhs edilirsə, bunu yalnız ticarətə aid etmək olar. Həmin dövrdə İrəvan şəhəri Türkiyədən, Tiflis, Gəncə, Şamaxı, Ənzəli və İsfahan şəhərləri ilə aparılan ticarətin düyün nöqtəsi çevrilmişdi[2].

---

[1]Закария  Саркаваг. Хроника. М., 1969, кн. 2, стр. 90; S.A.Məmmədov. Göstərilən əsəri, səh.135.

[2] Л.Х.Тер- Мкртчян. Армения под власбю Надир шаха. М., 1963, стр. 28.

XVII əsrdə yaşayıb – yaratmış Zəkəriyyə Sarkafak bu barədə belə yazmışdır: "Ararat ölkəsi məhsuldardır və hər cür ərzaqla zəngindir. Bu səbəbə görə İrəvana hər tərəfdən gəlir, istədiklərini alıb aparırlar"[1].

Çuxursəd bəylərbəyiliyinin ticarətində müsəlmanların ali silkinin nümayəndələri ilə yanaşı, erməni monastırları da iştirak edirdilər[2].

Ticarətin müəyyən qədər çiçəklənməsini əsrin son rübündəki təsərrüfat həyatına aid etmək olmaz. Çünki ticarət sahəsindəki gözə-çarpan canlanma heç də XVII əsrdə, xüsusilə son rübündə kənd təsərrüfatının çiçəklənməsi demək deyildi. Mənbələrdə bütün Səfəvi dövlətində kəndlilərin vəziyyətinin ağır olması barədə külli miqdarda məlumat vardır. Müasirlərin yazdıqlarına görə zəhmətkeş kütlələrin rifah halı bütün XVII əsr boyu xeyli aşağı səviyyədə olmuşdur[3]. Şəhərlərdə də vəziyyət ağırlaşmışdı. Bunu əldən - ələ keçən şəhərlərin, o cümlədən İrəvan əhalisinin xeyli azalması bir daha göstərirdi.

XVII əsrin əvvəllərində Səfəvi dövlətində mərkəzi hökümət o qədər zəifləmişdi ki, ucqarlardakı hakim feodalların, bəylərbəyilərin "mərkəzdənqaçma" siyasəti ilə mübarizə apara bilmirdi. Bundan istifadə edən bəylərbəyiliklərdə, o cümlədən Çuxursəd bəylərbəyiliyində hakim feodallar daha çox özbaşınalıq edir və özlərini hakimmütləq kimi aparırdılar.

Ağır istismar demək olar ki, bütün Səfəvi dövlətini bürüyən həm feodal, həm də mərkəzi hökümətin əleyhinə qalxan silahlı üsyanlarla nəticələndi. Azərbaycanın şimalında ən qüdrətli üsyan Şirvanda baş verdi. Belə ki, üsyançılar Şimalı Azərbaycanda Səfəvi şahlarının ən etibarlı dayaq nöqtəsi olan Şamaxı şəhərini 1721 –ci ildə ələ keçirərək Şirvan əmirini qətlə yetirib, bu bölgədə müstəqil

---

[1] İqtibas. L.X.Ter- Mkrtçyanın göstərilən əsərindən götürülmüşdür, səh. 28.
[2] И.П.Петрущевский. Азербайджан в XVI – XVII веках, стр. 296.
[3] Путешествие Шардена. Тифлис, 1902, стр. 347.

dövlətin – xanlığın yaranmasına nail oldular[1].

Şamaxı şəhərinin üsyançılar tərəfindən alınması xəbəri tezliklə bütün Səfəvi dövlətini bürüdü. Həmin dövrdə dövlətin paytaxtı İsfahan şəhəri əfqan tayfaları tərəfindən işğal edildiyindən, Səfəvi dövlətinin yeni padşahı II Şah Təhmasibin özü ağır günlər keçirdiyindən Şirvan üsyanına qarşı heç bir tədbir görmək iqtidarında deyildi. Odur ki, Şirvan üsyanının genişlənməsindən təşvişə düşən Çuxursəd bəylərbəyiliyinin kömək üçün Şah II Təhmasibə müraciəti cavabsız qaldığından, Qarabağ bəylərbəyi Uğurlu xanla sözləşib Şirvan bəylərbəyi Hüseyn xanın aqibətini bölüşdürməsinlər deyə, birləşmiş qoşunlarla Şamaxı tərəfdən hərəkət etdi. Bundan xəbər tutan Şirvan üsyançılarının başçısı Hacı Davud Dağıstandan gəlmiş müttəfiqləri ilə birlikdə düşmənə Kür çayını keçməyə imkan verməyib, onu qəflətən qarşıladı və darmadağın etdi. Beləliklə, Çuxursəd bəylərbəyiliyinin qoşunları İrəvan və Gəncə şəhərlərinə çəkilməli oldular[2].

1639 –cu ildən Səfəvi dövlətinin Türkiyə ilə sərhədində, o cümlədən Çuxursəd bəylərbəyiliyində bərqərar olunan əmin – amanlıq 1723 –cü ildə pozuldu. İsfahan şəhərinin 1720 –ci ildə əfqanlar tərəfindən işğal olunmasından və Səfəvi xanədanının həddən artıq zəifləməsindən, habelə Rusiya dövlətinin Xəzərboyu əyalətlərini tutmasından[3] və ölkədə yaranmış qarmaqarışıqlıqdan istifadə edən Türkiyə höküməti sülh haqqındakı mövcud olan müqavilənin şərtlərini pozaraq, 1723 –cü ildə qoşunlarla sərhəd xəttini keçməyi əmr etdi.

Türk əsgərlərinin yürüşü 1722- 1723 –cü illərdə Xəzərboyu əyalətləri işğal edən rus qoşunları ilə Azərbaycan torpağında toqquşmaya gətirib çıxara bilərdi. Bu arzu edilməyən müharibənin

---

[1] Şirvan üsyanı barədə ətraflı b a x : Ф.М.Алиев. Антииранские выступления и борьба против турецкой оккупации в Азербайджане в I пол. XVIII в Баку, 1975. Стр. 28 – 36.
[2] C.Hanvey. İngilis ticarətinin Xəzər dənizi vasitəsilə aparılmasının tarixi təsviri, London, 1762, səh. 36 (*ingilis dilində*).
[3] 1722-1723-cü illərdə Rusiya dövlətinin Azərbaycanın Xəzərboyu əyalətlərini işğal etmələri barədə ətraflı b a x : F.M.Əliyev. Göstərilən əsəri, səh. 38-64.

qarşısını alsın deyə, hər iki dövlət arasında 1724 –cü ildə İstanbul şəhərində müqavilə imzalandı. Müqavilənin şərtlərinə görə Rusiya işğal etdiyi Xəzərboyu əyalətləri öz dövlətinə ilhaq etməklə kifayətləndi. Türkiyə isə Cənubi Qafqazın və Cənubi Azərbaycanın ərazilərini işğal etmək üçün Rusiyanın razılığını aldı.

İstanbul müqaviləsindən sonra Sultan III Əhmədin əmrinə əsasən Osmanlı qoşunları bütün sərhəd boyunca hücuma keçib qərb tərəfdən Səfəvi dövlətinin ərazisinə daxil olaraq, qarşıya çıxan şəhərləri bir – birinin ardınca işğal edərək ta Ərdəbil şəhərinə kimi gəlib çıxdılar.

Türk əsgərləri ilk ciddi müqavimətlə Çuxursəd bəylərbəyiliyi ərazisində, İrəvan qalası ətrafında rastlaşdılar.

İrəvana hücum edən 75 minlik türk ordusuna Abdulla Paşa Köprülü başçılıq edirdi[1] .

Abdulla Paşa Köprülünün göstərişi ilə kəşfiyyat məqsədilə irəliyə Yalquz Həsən və Qoç Əlinin komandası altında 1800 nəfərlik qoşun göndərildi. Həmin qoşunlar İrəvan yaxınlığındakı Uçivard adlanan yerə çatar – çatmaz, İrəvan qalasından Mehrəli xanın başçılığı altında olan süvari dəstəsi ilə toqquşmalı oldular. Hər iki tərəfdən böyük itkiyə səbəb olan döyüş Osmanlıların qələbəsi ilə nəticələndi. Məğlubiyyətə düçar olmuş Mehrəli xan sağ qalan qoşunları ilə İrəvan qalasına çəkildi və bir daha türk əsgərləri ilə vuruşmağa cəsarət etmədi[2]. Döyüşü qələbə ilə başa çatdıran Qoç Əli və Yalquz Həsən yürüşü davam etdirərək, İrəvan qalası yolunda olan Qarni qalasını mühasirəyə aldılar. Bundan xəbər tutan Mehrəli xan mühasirədə olanlara heç bir yardım edə bilmədi. Nəticədə Qarni əhalisi türk sərkərdələrinə külli miqdarda qiymətli "hədiyyə" verərək qalanın türk qoşunları tərəfindən darmadağın olunmasının qarşısını aldı.

Bu hadisədən sonra türk komandanlığı Qarni qalasında mühafizə üçün kiçik qarnizon qoyub İrəvan istiqamətində hərəkət

---

[1] Армянская анонимная хроника (1722-1736). Перевод с турецкого в примечание академика АН Азерб.З.М.Буниатова. Баку, 1988, стр. 8.

[2] Yenə orada.

etdi.

Türk qoşunlarının yaxınlaşmasını eşidən İrəvanın ətraf kəndlərinin sakinləri də şəhər qalasında sığınacaq axtarırdılar.

İrəvan qalasının mühasirəsindən bir həftə keçmişdi ki, Abdulla Paşa Köprülüyə İstanbuldan Sultan III Əhmədin fərmanı çatdırıldı. Fərmanda deyilirdi ki, İrəvan qalası alınarkən ermənilərin dini mərkəzi olan "Üş kilsə" (Eçmiədzin) nə dağıdılsın və nə də qarət olunsun[1].

Məlum olduğu kimi, həmin dövrdə İrəvan şəhəri əhalisinin böyük əksəriyyətini azərbaycanlılar təşkil edirdilər, ermənilər isə "Üç kilsə" və onun ətrafında məskun idilər. Sultan III Əhməd mənsəbcə şiə olan irəvanlıları – azərbaycanlıları qırmağa icazə verir, lakin ermənilərə toxunmamağı tapşırırdı. Türkiyə sultanın belə bir hərəkəti müasir erməni təbliğatçılarının hələ orta əsrlərdən türklərin erməni xalqının soyqırımı ilə məşğul olmaları fikrini bir daha qətiyyətlə təkzib edir.

Mühasirədə olan İrəvan şəhərinə həmlə etməzdən əvvəl Abdulla Paşa Köprülü Mehrəli xana məktub göndərib qalanın təhvil verilməsini tələb etdi. Mehrəli xan cavab məktubunda bildirdi ki, o İrəvanı yalnız İran şahının razılığı ilə təhvil verə bilər.

Sülh yolu ulə İrəvan qalasını ala bilmədiyindən Abdulla Paşa Köprülü İrəvan şəhərini top atəşinə tutdurdu. Buna baxmayaraq,İrəvanın müdafiəçiləri müqavimət göstərməkdə davam etdilər. Beləliklə, İrəvan qalasının mühasirəsi uzandı. Məcburiyyət qarşısında olan Abdulla Paşa Köprülü Sultan III Əhmədə aşağıdakı məzmunda namə göndərdi: "Bu şəhərdə külli miqdarda qoşun vardır, biz artıq xeyli əsgər itirmişik. Əmrinizi gözləyirik. Kömək göndərəcəksiniz və yaxud geri qayıdaq?"[2].

Abdulla Paşa Köprülünün məktubundan sonra Türkiyə sultanı Sarı Mustafa Paşa və Rəcəb Paşanın komandası altında İrəvan

---

[1] Армянская анонимная хроника (1722-1736). Перевод с турецкого в примечание академика АН Азерб.З.М.Буниатова. Баку, 1988, стр.17.

[2] Yenə orada, səh. 11.

şəhərini mühasirədə saxlayan türk qoşunlarına kömək göndərdi. 1724- cü il iyun ayının 7-də İrəvan qalasına daxil ola bildilər.

Şəhərdə küçə vuruşması getdiyi vaxt Mehrəli xan öz ailəsi və şəhər zadəganları ilə birlikdə qala daxilindəki iç qalada gizləndi.

Türk qoşunları şəhər qarnizonunun və əhalinin müqavimətini qırdıqdan sonra Abdulla Paşa Köprülü "Üç kilsə" katolikosunu – həmədanlı I Astvasaturu (1715 - 1725) yanına dəvət edib ona xələt və ənam verdi. Anonim erməni mənbənin verdiyi məlumata görə, türklərdən gizlənən Mehrəli xan guya həmin katolikosun vasitəçiliyi ilə işğaldan çıxıb öz ailə üzvləri ilə birlikdə İrəvanı tərk etmişdir[1].

Osmanlılar İrəvan şəhərini İran qarnizonundan 1724 –cü il avqustun 31-də büsbütün təmizlədilər. Abdulla Paşa Köprülü İrəvanda türk sərkərdələrindən Rəcəb Paşanı hakim təyin edərək[2] Təbriz istiqamətində hərəkət etdi.

Rəcəb Paşa hakimiyyətinin ilk günlərindən Çuxursəd bəylərbəyiliyinin əhalisini feodalizm quruluşuna xas olan tərzdə istismar etdiyi halda, "Üç kilsə" ruhanilərinə havadarlıq etmişdi. Əldə olunan məlumata görə, osmanlıların hakimiyyəti dövründə "Üç kilsə" monastırının ətrafında yerləşən kəndlərin əhalisi katolikosla suvarma üstündə mübahisə etdikləri zaman Rəcəb paşa işə qarışararaq suvarma arxlarını iki hissəyə ayıraraq suyun bir hissəsni "Üç kilsə" monastırına aid olan əkin yerlərinə vermiş, digər hissəsini isə 20 kənd arasında bölüşdürmüşdür[3].

Osmanlı türkləri Çuxursəd bəylərbəyiliyində 13 il hökmranlıq etmişlər. Həmin illər ərzində Çuxursəd bəylərbəyiliyindəki Türkiyə hakimləri zəhmətkeş kütlələri istismar etməklə yanaşı, həmişə "Üç kilsə" monastırının ruhani başçılarına tərəfdar olmuş, mübahisələri xristian din xadimlərinin xeyrinə həll etmiş və hökm çıxarılarkən sənədləri öz möhürləri ilə yanaşı qazının möhürü ilə də

[1] Армянская анонимная хроника (1722-1736). Перевод с турецкого в примечание академика АН Азерб.З.М.Буниатова. Баку, 1988, стр.17.
[2] S.Erevantsi. Göstərilən əsəri, səh. 177.
[3] П.Т.Арутюнян. Освободительное движение армянского народа в I четверти XVIII в. М., 1957, стр. 45.

rəsmiləşdirmişlər[1].

Türk qoşunları Səfəvi dövlətinin şimal –qərb ərazisində bir – birinin ardınca şəhərləri işğal etdiyi bir zamanda, Azərbaycanın Xəzərboyu əyalətlərində Rusiya hərbçiləri ağalıq edərkən, süquta uğramış İranda nizami qoşunlara ümumi başçılığı Əfşar tayfasının nümayəndəsi Nadir Qulu xan tədricən öz əlinə aldı. İran qoşunlarının yeni sərkərdəsi İsfahanı işğal etmiş əfqanları İranın cənub – şərqindən qovdu. İradəsiz İran şahı II Təhmasib 1729 –cü ildə Osmanlı Türkiyəsi ilə müqavilə bağladı, türk əsgərlərinin işğal etdiyi şəhərlərin, o cümlədən İrəvanın, Gəncənin, Tiflisin, Şamaxının, Naxçıvanın və s. torpaqların itirilməsi ilə razı olduğunu təsdiq etdi[2].

Heç bir hörmətə malik olmayan şahın türklərlə bağladığı müqavilənin şərtləri ilə hesablaşmayan Nadir Qulu xan Cənubi Azərbaycanın ərazisində türk işğalçı qoşunlarının əleyhinə uğurlu yürüşə başladı. Artıq 1731 –ci ilin əvvəllərində Marağa, Təbriz və Ərdəbil şəhərləri türk əsgərlərindən təmizləndi. Qarşıda Naxçıvan və İrəvan şəhərləri uğrunda mübarizə dururdu. Lakin növbəti uğurlu yürüşün qarşısını Xorasandan gələn xəbər aldı. Orada mərkəzi hökümətə qarşı üsyan baş vermişdi. Bununla əlaqədar olaraq, Nadir xan türk qoşunlarına qarşı apardığı müvəfdfəqiyyətli hərbi əməliyyatı yarımçıq qoyub, Xorasan istiqamətində hərəkət etdi. Elə bu zaman şah II Təhmasib xalqın, xüsusilə hərbiçilərin arasında nüfuzunu qaldırmaq məqsədilə, Nadir Qulu xanın Xorasana getməsindən istifadə edərək qızılbaş qoşunlarını İrəvan və Naxçıvan istiqamətində öz ardınca apardı[3]. Lakin şah türk əsgərləri ilə ilk toqquşma zamanı məğlub olub, geri çəkilməyə və türk komandanlığı ilə yenidən sülh müqaviləsi bağlamağa məcbur oldu. Beləliklə, 1732- ci il yanvar ayının 16 –da Səfəvi dövləti ilə Osmanlı Türkiyəsi arasında yeni müqavilə bağlandı. Müqavilənin şərtlərinə görə bir çox Cənubi Azərbaycan şəhərləri ilə yanaşı, İrəvan və Naxçıvan şəhərlərinin də

---

[1] S.Erevantsi. Göstərilən əsəri, səh. 177.
[2]L.X.Ter- Mkrtçyan. Göstərilən əsəri, səh. 47.
[3]Məhəmməd Kazım. Name-ye aləm ara-yi Nadiri, III c., M., 1966, səh. 116 (*farsca)*.

Türkiyənin tərkibində qalmaları təsdiq edildi.

Lakin Xorasan yürüşündən qayıdan Nadir Qulu xan nəinki yeni müqavilənin şərtləri ilə razılaşdı, hətta saray zadəganlarına arxalanaraq həmin ildə çah II Təhmasibi taxtdan devirib, onun 8 aylıq oğlunu III Şah Abbas adı ilə formal şəkildə şah elan edərək, qəyyumluğu öhdəsinə götürdü və faktiki olaraq hakimiyyəti öz əlinə aldı[1].

Hakimiyyət başına keçən kimi Nadir qulu xan Şah II Təhmasibin türklərlə imzaladığı müqavilənin şərtlərini pozdu və eyni zamanda, Osmanlı Türkiyəsinə nota göndərərək türk əsgərlərinin 1723-cü ildən bəri işğal etdikləri torpaqlardan geri çəkilmələrini tələb etdi. Rədd cavabı alan Nadir Qulu xan türk qoşunları ilə hərbi əməliyyatı bərpa etdi.

Qızılbaş qoşunlarının zərbəsi altında türk əsgərləri tədricən Azərbaycanın ərazisini tərk etdilər. Türklərin Azərbaycandakı sonuncu dayaq nöqtəsi İrəvan şəhəri idi. İrəvandakı türk qarnizonu qızılbaş qoşunlarının yaxınlaşmasını eşitdikdə döyüşə girməkdən çox, qalada müdafiə olunmağı üstün tutdu. Lakin tezliklə türk qarnizonu müdafiə olunmağı mənasız hesab edib, Nadir Qulu xanla danışıq aparmaq qərarına gəldi. Bu danışıqlar sayəsində türk qarnizonu heç bir qurban vermədən 1735 – ci il oktyabrın 3-də qalanı tərk etdi[2].

İrəvan qalasını aldıqdan sonra Nadir Qulu xan əhaliyə müraciət edərək bildirdi ki, şəhəri tərk etmək istəyənlərə mane olmayacaq. Bundan sonra qızılbaş ordusunun sərkərdəsi əhalidən dilindən, dinindən və mümkünatından asılı olmayaraq 10-20, 40-50 tümən alaraq, bir növ onları əfv etmiş oldu.

İrəvan şəhərində kiçik qarnizon saxlayan Nadir Qulu xan qoşunlarının əsas qüvvəsi ilə müqavimət göstərməkdə davam edən Gəncə istiqamətində hərəkət etdi.

İrəvan qarnizonundan fərqli olaraq Gəncə qalasındakı türk

---

[1] F.M.Əliyev. Göstərilən əsəri, səh. 106.

[2]Армянская анонимная хроника (1722-1736), стр. 61.

əsgərləri müqavimət göstərməyi qərara aldılar. 30 gündən sonra Nadir Qulu xanın başçılıq etdiyi qızılbaş qoşunları Gəncə qarnizonunun müqavimətini qırmağa müvəffəq oldu. 1735 –ci il iyulun 9 –da Gəncə qalası da yenidən səfəvilərin əlinə qaldı.

1736 –cı ildə Nadir Qulu xan formal olaraq şah sayılan Səfəvi sülaləsinin kişi cinsindən olan sonuncu nümayəndəsi 4 yaşlı III Abbası aradan götürdü. Bununla da Səfəvi sülaləsinin 1502 –ci ildən bəri davam edən hökmranlığına son qoyuldu. Nadir Qulu xan özünün yaratdığı şəraitdən bacarıqla istifadə edərək , başına Səfəvi şahlarının tacını qoymağa nail oldu və bundan sonra o, Nadir şah adlandırıldı.

Nadir şahın dövlət daxilində keçirtdiyi ilk tədbirlərdən biri mövcud inzibati bölgünü – bəylərbəyilikləri ləğv etməsi idi. Bu qayda ilə XVI əsrdə Azərbaycan ərazisini təşkil edən Şirvan, Qarabağ, Cənubi Azərbaycan və Çuxursəd bəylərbəyilikləri də ləğv edildi. Dörd bəylərbəyiliyin əvəzinə mərkəzi Təbriz şəhəri olmaqla vahid Azərbaycan vilayəti yaradıldı. Nadir şah bu vilayətin idarəsini doğma qardaşı İbrahim xana həvalə etdi. Nadir şah özünü şah "seçdirdiyi" Muğan qurultayında (1736) iştirak edən və onun namizədliyini dəridən – qabıqdan çıxa – çıxa müdafiə edən erməni katolikosu Abram Kretasi bu barədə öz xatiratında yazır: "...Nadir şah (qardaşını) farsca Azərbaycan adlanan Atropatana rəis və sərdar, yəni sərkərdə təyin edib, Naxçıvanın, İrəvanın və bütün Ararat vilayətinin, Gürcüstanın idarəsini ona tapşırdı və onu başqa və onu başqa xanlar üzərində bəylərbəyi və hakimi –mütləq təyin etdi"[1].

Yeri gəlmişkən, mətləbdən uzaqlaşsaq da oxucuların nəzərini bir tarixi incəliyə cəlb etmək istərdik. Abram Kretasinin yazdığına görə, 1736 –cı ildə Muğanda çağırılan qurultaya İrəvandan və Səfəvi dövlətinin ərazisinin başqa yerlərindən xeyli erməni din xadimləri gəlmişdi. Qurultay ərəfəsində Nadir Qulu xan qonaqları nəvazişlə qarşılamış və onlarla uzun – uzadı söhbət etmişdir. Abram Kretasini redaktə edən müasir erməni alimi A.D.Papazyan yazır ki,

---

[1]А.Кретаци. Повествование. Ереван, 1973, стр. 244.

əlyazmasında Abram Kretasi Nadir Qulu xanın ermənilərlə danışığını erməni hərflərilə Azərbaycan dilində vermişdir[1].

Yuxarıda yazılanlardan aşağıdakı qənaətə gəlmək olar; mənşəcə azərbaycanlı olan əfşar tayfasının nümayəndəsi Nadir Qulu xan İran dövlətini təmsil etsə də rəsmi zifayətlərdə Azərbaycan dilində danışarmış, ermənilərin Azərbaycan dilini bilmələri göstərir ki, Çuxursəd bəylərbəyiliyində zadəganların və əhalinin böyük əksəriyyətini azərbaycanlılar təşkil etdiklərinə görə erməni ruhaniləri yerli hakimlərin qılığına girmək və xalq arasında hörmət qazanmaq məqsədilə məcburiyyət qarşısında Azərbaycan dilini öyrənir və bu dildə də yerli əhali ilə təmasda olurmuşlar, heç də təsadüfi deyildir ki, dünya erməni dindarlarının mərkəzi "Eçmiədzin" – "Üç kilsə" adlandırırdılar, katolikos isə rəsmi sənədlərdə "müsəlmanlığa" xəlifə kimi qələmə verilirdi. Bu barədə "Matenadaran" da həddən artıq sənəd vardır.

İndi də əsil mətləbə qayıdaq: Nadir şahın ilkin tədbirlərindən biri də yaratdığı Azərbaycan vilayətinin ayrı – ayrı bölgələrinə və şəhərlərinə başçılar – xanlar, bəylərbəyilər təyin etmək oldu. Əslində Nadir şah bu tədbirə hələ taxta çıxmamışdan əvvəl əl atmışdı: Muğan qurultayı ərəfəsində Nadir Qulu xan Heratdan Muğana gələn, etibar etdiyi Pir Mahmud xanı İrəvan xanı və eyni zamanda bu bölgənin bəylərbəyi təyin etmişdi. Lakin Nadir Qulu xan qurultay öz işini bitirməyincə xanı öz yanında saxlayaraq İrəvana göndərmədi. Onun əvəzinə Nadir adı ilə Məhəmməd Rza bəy göndərildi. O, müvəqqəti olaraq İrəvan şəhəri və onun 9 mahaldan ibarət olan İrəvan bölgəsini idarə etdi[2].

Öz yaxın adamlarından yeni bəylərbəyilər, xanlar, kələntərlər təyin etməyinə baxmayaraq, Nadir şah onlara o qədər də etibar etmirdi. Odur ki, yeni şahın əmri ilə hər bir şəhərdə dövlət mədaxilinə nəzarət etmək daha 3 nəfər məmura tapşırıldı. Birinci məmur mirzə - vəkil adlanırdı. Həmin şəxs adətən, zabitlərdən təyin

[1] Yenə orada. 224-cü səhifədə redaktorun qeydi.
[2] A.Kreatsi. Göstərilən əsəri, 1973, səh. 227-249.

edilirdi. Mirzə - vəkil digər iki məmurun fəaliyyətinə göz qoyur və şəxsən dövlət xəzinəsi üçün gəlirin toplanmasına nəzarət edirdi. Onun səlahiyyəti daha geniş idi, lazım gəldikdə o həm pul xərcləyər və həm də günahkarları mühakimə edə bilərdi. Lakin belə hərəkət etdikdə mirzə - vəkil digər iki məmurla hesablaşmalı idi.

İkinci məmur vəzir adlanırdı. O mahallardan yığılan vergiləri xüsusi dəftərə salır, məxarici qeydə alırdı. Üçüncü məmur olan Mustofi dövlətə aid olan bütün kənd və mülklərin siyahısını xüsusi şah sarayının dəftəri adlanan siyahıya alır və onlardan toplanan gəlirə şəxsən nəzarət edirdi[1].

Hər bir əyalətə və şəhərə 3 nəfərdən ibarət nəzarətçı göndərməklə Nadir şah apardığı ardı – arası kəsilməyən müharibə və mübarizələrin xərcini ödəmək üçün dövlət gəlirinin mənimsənilməsinin, vergi toplanarkən əyintilərə yol verilməsinin qarşısını almaq məqsədini güdürdü. Bu isə sözün əsil mənasında feodal istismarının daha da gücləndirilməsi demək idi. Təsadüfi deyildir ki, Nadir şah hakimiyyət başına gəldiyi gündən zəhmətkeş kütlələrin vəziyyəti daha da ağırlaşdı. Müasirlərdən birinin yazısından məlum olur ki, həmin dövrdə: "Təkcə Muğanda deyil, hər yerdə: Təbrizdə də, Tuzaxda da, Gəncədə də, Qazaxda da, Loridə də, Gürcüstanda da, Sevan gölünün sahillərində də, Saxnudzorda da, Qafanda da, Naxçıvanda da, İrəvanda da çörək (buğda) tapılmırdı"[2]. Bu vilayətlərdə buğdanın satış qiyməti o qədər baha idi ki, onu almaq mümkün olmurdu.

Əhalinin rifah halının gündən – günə pisləşməsinə baxmayaraq, Nadir şah toplanılan vergilərin sayı və miqdarı ilə kifayətlənmirdi. Nadir şahın hakimiyyəti dövründə Azərbaycanda və eləcə də İranda olmuş ingilis səyyahı və rəsmi nümayəndəsi Con Hanveyin yazısı bu baxımdan XVIII əsrin 30-cü və 40-cı illərində bütün Səfəvi dövlətinin rəiyyətləri üçün səciyyəvidir. O yazırdı: "Nadirqulu quruda və dənizdə Türkiyənin əleyhinə ciddi şəkildə

---

[1] Yenə orada, səh. 247.

[2] A.Kreatsi. Göstərilən əsəri,səh. 263.

müharibəyə hazırlıq apararkən, Səfəvi dövləti hədsiz vergilərin ağırlığından inləyirdi. Çox çətinliklə həddən artıq toplanılan vergilər xalqın ümidini qırmışdı. Çoxları vergi toplayanların amansızlığı ucundan dağlara çəkilir... bəziləri isə ziyarət bəhanəsi ilə Ərəbistana qaçırdılar"[1] Nadir şahın İrəvan bölgəsindəki vergi siyasəti haqqında yazılan mənbələrin birində deyilir ki, şah hər il toplanılan vergiləri xüsusi siyahıya alır və onların miqdarını ildən-ilə artırırdı[2].

Sabiq Çuxursəd bəylərbəyiliyinin ərazisində yaşayan əhalinin acınacaqlı vəziyyətini mənşəcə erməni olan biri belə təsvir etmişdi: "Bu zaman xalq hədsiz olaraq var-yoxdan çıxmışdı. Lakin müştəri tapılmırdı. Belə olduqda onlar arvadlarını, oğul və qızlarını atıb qürbət ölkələrə qaçırdılar. İstərdim Nadir şahın törətdiyi bəd əməllərdən bunu da nəql edəm: o, bir xeyli erməni və türk[3] oğlan və qızlarını qul edib satırdı... Bu həm xristian, həm də türklər üçün ağır imtahan oldu"[4].

Həmin dövrdə tərtib olunmuş arxiv sənədlərindən birində yazılmışdır ki, təkcə rəiyyətlər deyil hətta ali silkin nümayəndələri-feodallar da tələb olunan ağır vergiləri verməyə imkanları olmadığından dağlara çəkilirdilər[5]. Müasirin yazdığına görə, əsrin 40-cı illərinin lap əvvəllərində bir sıra şəhərlərlə yanaşı, İrəvan şəhərində də kiçikdən böyüyə kimi demək olar ki, hamı üsyan edib dağlara qaçmışdı[6]. Ağır və dözülməz vergilərin məntiqi nəticəsi idi ki, dövlətin hər tərəfini silahlı üsyanlar bürüdü. Üsyanların yatırılmasında Nadir şah ilk növbədə yerlərdə öz adamlarından təyin etdiyi hakimlərə istinad edirdi. Sabiq Çuxursəd bəylərbəyiliyi ərazisində Nadir şah özünün vəzifə başında qoyduğu Pir Mahmud

---

[1]C.Hanvey.Göstərilən əsəri, səh. 373 (*ingiliscə).*

[2] S.Erevantsi. Göstərilən əsəri, səh. 217.

[3] Ermənilər başqa xalqlardan fərqli olaraq, müasir azərbaycanlıları tarix boyu "türk" adlandırmışlar.

[4] L.X.Ter- Mkrtçyanın əsərinə istinad edilmişdir, səh. 66.

[5] RXSA. Rusiyanın İranla əlaqə fondu. 1942, V c., I hissə, vər. 44.

[6] RXSA. Rusiyanın İranla əlaqə fondu. 1942, 5 cild. I hissə, vər. 44.

xandan istifadə edirdi. Nadir şah ilk çağlarda onun əli ilə çox yerlərdə üsyanların yatırdılmasına nail oldu[1]. Lakin ağır vergi sistemi hörümçək toru tək bütün ölkəni bürüdüyü kimi, feodal istismarına qarşı qalxan üsyanlar da bir o qədər qol-qanad açmaqda davam edirdi. Həmin dövrdəİran feodallarının zülmünə qarşı ən iri miqyaslı üsyan 1743-cü ildə Şirvanda baş verdi. Həmin üsyanı əfşar qoşunları 1743-cü ilin dekabrında amansızcasına yatırtdılarsa da[2], başqa yerlərdə üsyanların ardı-arası kəsilmirdi. Əhalinin əfşar üsul-idarəsindən narazı olmasından istifadə edən və hakimiyyəti ələ almağa can atan ayrı-ayrı şəxslər özlərini Səfəvi sülaləsinin nümayəndəsi kimi qələmə verib, ətraflarına "yaxşı şah" axtaran kütlələrin toplanmasına nail olurdular. Belə yalançı şahzadələrdən biri də Səfi Mirzə adı ilə fəaliyyət göstərən Rəfsəncanlı[3] Məhəmməd Əli idi[4]. O, İranda qərar tutmayəb Türkiyəyə köçmüş, burada "yalançı şahzadə" rolunu oynamaq kimi məsul bir missiyanı öhdəsinə götürmüş və böyük bir dəstə ilə İranın sərhədlərinə yaxınlaşmışdı.

Yalançı şahzadə Səfi Mirzənin tərəfdarları İrəvan bölgəsində də tapıldı. Şirvan üsyanından gözü qorxan Nadir şah çalışırdı ki, nəyin bahasına olursa olsun, Səfi Mirzəyə dövlətin sərhədini keçməyə mane olsun. Bu məqsədlə o. İrəvandan Qarsa qədər uzanan sərhəd boyunca dəstələr yerləşdirmiş, həmin bölgələrdəki elbəyləri tərəfinə çəkmək üçün onlara xələt göndərməklə bərabər, hamıya illik verginin yarısını güzəştə getmişdir[5]. 1744-cü ildə Nadir şahın qoşunları Səfi Mirzənin də hərəkatını yatırmağa nail oldular. Lakin nizami ordusunun əldə etdiyi qələbələr, heç də Nadir şah hökümətinə qarşı qalxan üsyan alovlarının söndürülməsi demək deyildi.

1746-1747-ci illərdə Cənubi Azərbaycanda növbəti yalançı şahzadələrdən biri olan Sam-Mirzə Nadir şahın hakimiyyətinə qarşı

---

[1] L.X.Ter- Mkrtçyan. Göstərilən əsəri, səh.66.

[2] Şirvan üsyanı barədə ətraflı b a x : F.M.Əliyev. Göstərilən əsəri, səh.3.

[3] Rəfsəncani kəndi Kirmanın şimal – qərbində yerləşir.

[4] М.Арунова, К.Ашрафян. Государство Надир шаха. М., 1958, стр. 150.

[5] RXSA. Rusiyanın İranla əlaqələri fondu. Siyahı 77/1, III sənəd, vər. 256.

üsyan qaldırdı. Bu zaman İrəvan bölgəsində də çaxnaşmalar başlanmışdı.Həmin dövrdə Azərbaycanda olmuş Rusiyanın İrandakı səfiri M.M.Qolitsin 1747-ci il martın 15-də Muğandan mərkəzə göndərdiyi məktubunda yazırdı: "...Hazırda İranın bir çox vilayətlərində və yerlərdə təhlükəli vəziyyət əmələ gəlmiş və böyük çaxnaşma başlanmışdı. Artıq Gəncə, İrəvan, Naxçıvan və Tiflisdə hədsiz vergilərin və cərimələrin üzündən demək olar ki, bütün əhali – kiçikdən böyüyə kimi, hətta o şəhərin vəzifəli şəxsləri üsyan edib öz var-dövlətləri, mal-qaraları ilə dağlara çəkiliblər[1].

Üsyanları yatırıb, üsyan başçıları və üsyançıları cəzalandırmaq üçün tədbirlər hazırlayan Nadir şahın həyatına qəsd edildi:1747-ci il mayın 9-da Nadir şah saray əyanları tərəfindən qətlə yetirildi.Zəhmli şahın gözlənilməz ölüm xəbəri ölkədəki hərc-mərcliyin artmasına səbəb oldu. Sarayda taxt-tac uğrunda mübarizə getdiyi zaman, vaxtilə silah gücünə İrana tabe edilən ucqarlarda müstəqil feodal dövlətləri yarandı. Elə bu anda Cənubi Azərbaycanda Təbrizi ələ keçirən yalançı şahzadə Sam-Mirzə yeni yaranmış Azərbaycan xanlıqlarına müraciət edərək hakimlərdən onu vahid Azərbaycanın başçısı kimi tanımağı tələb etdi. Təbiidir ki, müstəqillik əldə edən yerli hakimlər yalnız rədd cavabı verə bilərdilər. Belə olduqda da, Sam-Mirzə ayrı-ayrı şəhərlərdə xalq kütlələrinə müraciət etməyi və onlara apardıqları mübarizədə kömək etməklə "qara camaat" arasında nüfuz qazanmağa və beləliklə, tərəfdarlarının sayını artırmağı qərara aldı. Sam-Mirzə ilk növbədə Nadir şahın ölümündən sonra onun nümayəndəsi Pir Mahmud xana tabe olmaq istəməyən İrəvan əhalisinə kömək etməyi qət etdi və özünün silahlı dəstələri ilə İrəvan istiqamətində hərəkət etdi. Lakin o bilmədi ki, həmin dövrdə İrəvan şəhərində böyük çaxnaşma var idi. Məsələ burasındadır ki, İranda taxt-tac uğrunda mübarizə aparan namizədlərdən biri-Nadir şahın əmisi oğlu Əmir Aslan xan da ordu toplamaq məqsədilə əfşarların yaxın adamlarından olar Pir Mahmud

---

[1] RXSA. Rusiyanın İranla əlaqələri fondu. Siyahı 77/1, III sənəd, vər. 256.

xanın yanına gəlmişdi. İranda isə qeyd edildiyi kimi, yerli əhali Nadir şahın vəzifə başına gətirdiyi Pir Mahmud xanın əleyhinə qalxmışdı. Sam-Mirzənin dəstələrinin İrəvan qalasına yaxınlaşması xəbərini eşidən Əmir Aslan xan tez şəhər əhalisini "sakitləşdirib", üsyançıları qarşıladı və darmadağın edib geri oturtdu. Bu hadisədən sonra Əmir Aslan xan yenidən şahlıq uğrunda mübarizəyə qoşuldu. İrəvan xanlığının taxtında oturmaq isə yenə də Pir Mahmuda nəsib oldu.

İrəvan xanlığı XVIII əsrin ortalarında Azərbaycan ərazisində uzun sürən İran hakimiyyətindən sonra müstəqil dövlət qurumu qazanan 20-yə yaxın xanlıqlardan biri idi. Tarixçi Həsi Abdullayevin sözləri ilə desək, "Azərbaycan xanlıqlarının yaranması prosesi onu əvvəlki dövrdən ayıran feodal münasıbətləri inkişafının labüd dövrü idi"[1]. Həqiqətən də sabiq Çuxursəd ərazisində müstəqil İrəvan xanlığının yaranması ilə bu bölgədə yaşayan xalqların tarixində yeni səhifələr açıldı.

[1] Г.Абдуллаев. Азербайджан в XVIII веке и взаимоотношения его с Россией. Баку, 1965.

# İRƏVAN XANLIĞININ İCTİMAİ – İQTİSADİ VƏZİYYƏTİ

İrəvan xanlığının siyasi tarixi kimi, ictimai-iqtisadi vəziyyəti də tədqiqatçılar tərəfindən bu günədək demək olar ki, işlənilməmişdir. Həmin məsələdən bəhs etməzdən əvvəl, bir qədər geriyə nəzər salıb qeyd etməliyik ki, hələ XVII əsrin axırlarında Səfəvi dövlətində başlanmış həm siyasi və həm də iqtisadi böhran XVIII əsrin əvvəllərində daha da gərginləşmişdi. Nadir şahın silah gücünə yaratdığı dövlət parçalandıqdan sonra ölkədə mərkəzi hakimiyyəti ələ keçirmək, habelə taxt- tac və torpaq uğrunda qanlı feodal ara savaşı daha da şiddətlənmişdir. Bir – birini əvəz edən saray çevrilişləri mərkəzi hökuməti daha da zəiflətdi və vaxtilə Səfəvi dövlətinə tabe edilmiş ölkələrin feodalları paytaxta tabe olmaqdan imtina etdilər və qısa bir müddət ərzində şah hakimiyyətinin hökmranlığından çıxdılar. Yaranmış belə bir şəraitdə Azərbaycan da uzun sürən İran hakimiyyətindən xilas oldu. Lakin həmin dövrdə Azərbaycan tarix səhnəsində vahid dövlət kimi deyil, müstəqil, lakin pərakəndə xanlıqlar şəklində çıxış etdi. Belə xanlıqlardan bir də İrəvan xanlığı idi. Azərbaycanın şimal- qərbində yerləşən bu xanlıq paytaxtı İrəvan şəhəri olmaqla, inzibati cəhətdən 15 mahala bölünürdü: 1) Qırxbulaq mahalı; 2) Zəngibasar mahalı; 3) Qarnibasar mahalı; 4) Vedibasar mahalı; 5) Şərur mahalı; 6) Suran mahalı; 7) Dərək mahalı; 8) Saatlı mahalı; 9) Tala mahalı; 10) Seyidli-Axaclı mahalı ; 11) Sərdarabad mahalı; 12) Qərpi mahalı; 13) Abran mahalı; 14) Dərəçiçək mahalı; 15) Göyçə mahalı[1].

XVIII əsrin ikinci yarısında Azərbaycanda mövcud olan

---

[1] И.И.Шопен. Исторический памятник состояния Армянской области в эпоху ее присоединения к Российской империи. СПб., 1852, стр. 442-446.

başqa xanlıqlar kimi, İrəvan xanlığının da siyasi tarixi ardı-arası kəsilməyən feodal vuruşmaları, qanlı saray çevrilişləri və yadelli işğalçılara qarşı mübarizə ilə bağlıdır. Bu isə minlərlə əhalinin məhv olunmasına, şəhər və kəndlərin dağıdılmasına, istehsal qüvvələrinin zəifləməsinə və istehsalın aşağı düşməsinə gətirib çıxarırdı. Lakin bununla belə, mütəxəssislərin fikrincə, XVIII əsrin ikinci yarısında Azərbaycanda dövrün birinci yarısına nisbətən müəyyən təsərrüfat canlanması nəzərə çarpırdı. Azərbaycanın başqa xanlıqlarında olduğu kimi, İrəvan xanlığında da bu nisbi canlanma müşahidə olunurdu. İrəvan xanlığının iqtisadiyyatında əsas yeri torpaq üzərində mülkiyyət təşkil edirdi. Ölkənin iqtisadiyyatının başlıca sahəsini heyvandarlıq və əkinçilik təşkil edirdi, XVIII əsrin ikinci yarısında başqa Azərbaycan xanlıqlarında olduğu kimi, İrəvan xanlığında da aşağıdakı torpaq mülkiyyəti mövcüd idi:

1.**Divani – dövlət torpaqları.** Qeyd etməliyik ki, XVIII əsrin ikinci yarısında bu torpaqlar əvvəllərdə olduğu kimi, bütövlükdə dövlət xəzinəsinin əlində deyildi. Bu dövrdə dövlət torpaqlarının xan və xan ailəsi üzvlərinin torpaq sahələri ilə qarışması və divan torpaqlarının hesabına xüsusiyyətçi torpaqların artması nəzərə çarpırdı. Bu torpaq mülkiyyəti xan və onun ailə üzvlərinin və yaxın qohumlarının varlanması üçün əsas mənbələrdən birinə çevrilmişdir.

2. **Xalisə torpaqları** – xanın ailə üzvlərinə məxsus torpaq sahələri.

3. **Mülk torpaqları** – iri bəylərə- mülkədarlara məxsus torpaq sahələri. Mülk torpaqları şəxsi mülkiyyət kimi satıla və başqa şəxsə bağışlana da bilərdi. Bu torpaq sahələri hüquqi cəhətdən, adətən nəsildən – nəsilə keçirdi.

4. **Vəqf torpaqları** – dini ocaqlara- məscidlərə, pirlərə, kilsələrə aid torpaq sahələri.

5. **Camaat torpaqları** – bu torpaq sahələri əsasən kənd icmasına məxsus olurdu [1] .Yuxarıda adları çəkilən torpaq mülkiyyətlərinin özünəməxsus xüsusiyyəti vardır. Divan torpaqları dövlətin gəlirinin özəyini təşkil etsə də, xanlar XVIII əsrin ikinci yarısında həmin torpaqları "səxavətlə" bu və ya digər xidmətinə görə, xüsusilə döyüş meydanlarında fərqlənənlərə bir növ bağışlayırdı. Belə torpaq sahələri "tiyul"adlanırdı. Tiyul torpağı almış şəxsin – tiyuldarın bu sahədən yalnız məhsul toplamaq hüququ vardı. Özü də "tiyul" daimi deyildi və nəsildən – nəslə də keçə bilmirdi. Tiyuldan əldə etdiyi məhsulun müəyyən hissəsini xəzinəyə verməli idi. İrəvan xanlığında "vəqf" torpaqları başqa xanlıqlardan bir qədər fərqlənirdi. Bu xanlıqda onlarca məscidlə yanaşı, bir neçə kilsə də var idi. Sayca az olmasına baxmayaraq, kilsə torpaqlarında təsərrüfat geniş miqyasda aparılırdı. Bu sözləri "Üç kilsə" – "Eçmiədzin" monastırına daha çox şamil etmək olar. Ermənilərin bu dini mərkəzinin qol – qanad açmasına adətən, həmin bölgədə daimi hakim olan azərbaycanlı feodallar şərait yaradırdılar. Ermənilərin dini feodallarına təsərrüfatla geniş məşğul olmaları üçün imkan yaradan müsəlmanlar, özləri də bunu dərk etmədən belə hərəkətləri ilə tarixən Azərbaycan ərazisində qüdrətli feodal erməni təsərrüfatının yaradılması üçün zəmin yaradırdılar. Belə ki, Eçmiədzin monastır təsərrüfatı inkişaf edərək, XVIII əsrdə bir növ "dövlət daxilində dövlətə" çevrilmişdir. Xanlıqlar dövründə həmin monastırın 190 xalvar ( 375 hektar) torpaq sahəsi vardı ki, onun hər il 103 xalvarı əkilib becərilirdi[2].

Bu geniş torpaq sahəsinin 40 xalvarında buğda, 10 xalvarında arpa, 15 xalvarında darı, 14 xalvarında çəltik, 3 xalvarında pambıq, 4 xalvarında kətan, 4 ½ xalvarında pərinc (buğda növü), 5 xalvarında isə tərəvəz (çuğundur, noxud, kələm, soğan, sarımsaq, kök və s.)

---

[1] И.П.Петрущевский. К вопросу об иммунитете в Азербайджане в XVII - XVIII вв. Исторический сборник, № 4, М.- Л., 1945, стр. 72.
[2]С.А.Егиазаров. Очерки по истории учреждений в Закавказье, т. Сельская община. Казан, 1889.

əkilirdi[1].

Geniş torpaq sahəsindən savayı Eçmiədzin monastırı ticarətlə də məşğul olurdu ki, buna da "vəqf" kimi müsəlman hakimləri maneçılık törətmirdilər.

Məscidlərin nəzdində olan "vəqf" torpaqlarından alınan gəlir axundların, seyidlərin, mollaların, keşişlərin dolanacağına, həmçinin mədrəsələrin, mollaxanaların məxaricinə sərf edilirdi.

İrəvan xanlığında mövcud olan mülkiyyət formalarından biri də "camaat" torpağı idi. Belə torpaqlar əsasən, kənd icmasının ixtiyarında olurdu.

Xanlıqda mövcud olan torpaq mülkiyyət növlərinin hamısı, "camaat" torpaqları istisna olmaqla, feodalların ixtiyarında idi. Yeri gəlmişkən onu da qeyd edək ki, "camaat" torpaqlarının yalnız adı vardı. Çünki icmalara məxsus olan torpaqlar həm az və həm də becərilməyə qabil deyildi. Feodallar münbit torpaqları öz əllərinə keçirərək, kəndlilərə əkin – biçin üçün yararsız olan dağlıq yerlərdə sahələr ayırırdılar. İrəvan xanlığında torpaq sarıdan korluq çəkən kəndlilər feodalların torpaqlarında işləməyə məcbur olurdular: onlar torpağı becərir, əkir, məhsulunu yığır, feodallar üçün odun qırır, onu lazimi yerlərə daşıyır və qış üçün ehtiyat hazırlayırdılar. Kəndlilər onlara verilən hər qarış torpağı təbiətlə mübarizə şəraitində becərməli olurdular.

XVIII əsr Azərbaycan tarixinin tədqiqatçılarından biri olan V.N.Leviatov yazır ki, maldarlar – elatlar bütün dövrlərdə oturaq həyat sürən əhali üçün bədbəxtçilik gətirirdilər. Belə ki, yaylağa gedərkən və yaylaqdan qayıdarkən elatlar yolların üstündə olan bağları və əkinləri məhv edir və yeri gəldikdə kəndləri də talayırdılar. Maldarlar arasında oturaq əhaliyə nisbətən daha çox oğrular və talançılar əmələ gəlirdi ki, onlar da öz hərəkətləri ilə oturaq əhali içərisində qorxu və həyəcan yaradır, onlarda sabaha inam qoymurdular. Ona görə də bu hadisələr ölkənin ümumi iqtisadi vəziyyətinə pis təsir edirdi.

---

[1] B.M. Arutyunyan. Göstərilən əsəri, səh. 50.

İrəvan xanlığında feodal təsərrüfatının özünəməxsus səciyyəsini iki müxtəlif iqtisadi forma – oturaq əkinçilik və yarımköçəri maldarlıq təşkil edirdi ki, bu da kəndlərdən çoxsaylı vergilərin alınmasına gətirib çıxarırdı.

İrəvan xanlığında kəndlilərdən alınan vergilərin sayı və miqdarı müxtəlif idi. Vergilərin müxtəlifliyi ilk növbədə iqlim şəraitindən və tez-tez baş verən feodal ara müharibələrinin vurduqları zərərdən də aslı idi. Məlum olduğu kimi, XVIII əsrin ikinci yarisinda Azərbaycanın bütün xanlıqları çox ağır siyasi şəraitlə qarşılaşırdılar.Tez-tez baş verən hərbi yürüşlər, saray çevrilişləri kəndli təsərrüfatına ağır zərbə endirirdi. Belə bir şəraitdə feodallar istər-istəməz yaşayış mənbəyi olan kəndli əməyini qorumağa məcbur olurdular. Professor İ.P.Petruşevskinin göstərdiyi kimi... xanların əsas məqsədi ondan ibarət idi ki, yerli əhalini həddindən artıq həyəcanlandırmasın, feodal istismarını son həddə çatdırmasın və kəndliləri məlum olan patriarxal vəziyyətdə saxlasın.Xan bəzi hallarda kənd icmasının hüququnu və adətlərini, habelə yarımköçəri tayfaların hüquqlarını müdafiə etməyə çalışırdı.

İrəvan xanlığında da iki əsas sinif-feodal və kəndli sinfi mövcud idi. Məcazi mənada iyerarxiya pilləkəninin ən yüksək zirvəsində xan, xandan sonra aşağıya doğru xanın vəziri və yaxud, baş mirzə adlanan şəxs, sonrakı pilləkəndə isə müxtəlif vəzifə daşıyan bəylər-divan bəyləri, sərkərdələr, əmirlər və bu kimi şəxslər dururdular. Feodal sinfinə, həmçinin ali ruhanilər, maldarlıqla məşğul olan, yarımoturaq həyat tərzi keçirən elatların – maldarların qəbilə başçıları – elbəyilər də daxil idilər.Elbəyilər bəzi hallarda müəyyən xidmətlərinə görə, adətən müharibələr vaxtı göstərdikləri igidliyə görə, xandan mükafat əvəzinə yarımoturaq və ya oturaq əhalisi olan torpaq sahəsi alır və beləliklə, özləri də bilavasitə əkinçiliklə məşğul olurdular. Elbəyilərin xanın qarşısında ümdə vəzifələri – müharibə zamanı tabeliklərində olan elatlarla birlikdə, silahlanmış halda hazır olmaqdan ibarət idi.

Ruhani təbəqəsi də iki qrupa bölünürdü: birinci – şeyx-ül-islam, mücdəhid, axund, seyidlər; ikinci – ruhanilər (adı

mollalar,mədrəsədə və mollaxanada dərs deyən və məhəllə mollaları).

Bir qayda olaraq, feodalların hamısı vergi və mükəlləfiyyətdən azad idilər. Kəndli sinfini əsas etibarilə rəiyyət, rəncbərlər və elatlar təşkil edirdilər ki, onlar da qoyulan vergiləri məcburi ödəməli və mütləq mükəlləfiyyət daşımalı idilər.

Kəndli sinfinin özəyini təşkil edən rəiyyətlər kənd icması tərəfindən ayrılmış torpağı becərir və əldə etdikləri məhsulun $^{16}/_{1}$ -dən hissəsinə qədərini renta şəklində feodala verirdilər. Bəzi rəiyyətlər öz torpaqları yararsız olduğundan və suvarma cəhətdən korluq çəkdiklərinə görə feodaldan daha ağır şərtlərlə sahə icarəyə götürür və əldə etdikləri məhsulun $^{1}/_{2}$-dən üç hissəsinə qədərini feodala verməyə məcbur olurdular

Rəiyyətlər nəinki torpaqların becərilməsi ilə məşğul olur, həm də feodal torpaqlarında bir sıra tikinti işləri görürdülər. Rəiyyətlərin vəziyyəti həm də ona görə ağırlaşırdı ki, feodaldan aldıqları əmək alətləri, toxum və s. üçün əldə etdiyi məhsulun müəyyən hissəsini də feodala verməli olurdular.

Kəndlilərə becərdikləri feodal torpaqlarını atıb başqa yerlərə getməyə hüquqi cəhətdən icazə verilirdi. Lakin təcrübədə çox nadir hallarda bu cür köçmə əməliyyatı baş tuturdu. Belə hallarda onlar bir sıra çətinliklərlə qarşılaşırdılar ki, bu da rəiyyətlərin könüllü şıkildə köçmələrinə imkan vermirdi; köçməzdən əvvəl rəiyyət öhdəsinə düşən bütün işləri başa çatdırmalı, torpaqla bağlı olan bütün mükəlləfiyyətləri yerinə yetirməli idi. Rəiyyət başqa bir yerə köçəcəyi barədə neçə ay əvvəl feodala xəbər verməli, öz borclarını və vergiləri vaxtında ödəməli idi. Göründüyü kimi, rəiyyətlərin feodal torpaqlarından köçmələri bir sıra ciddi çətinliklərlə qarşılaşırdı.

Beləliklə, yuxarıda deyilənlərdən aydın olur ki, kəndlilərin şəxsi azadlığı nəzərdə tutulsa da, əslində onlar feodal torpağında təhkim olunmuş kimi idilər. Kəndlilərin hüquqi cəhətdən torpağa təhkim olunmaları rəsmi sənədlərlə öz əksini tapmasa da, əslində feodalların özləri rəiyyətlərin müqəddəratını həll edirdilər. Bəzi

hallarda torpaqlarla birlikdə rəiyyətlər də başqa feodalların ixtiyarına verilirdi.

Rəncbər qrupuna məxsus olan kəndlilər daha ağır vəziyyətdə yaşayırdılar. Nə torpağı, nə də əmək aləti olmayan rəncbərlər xan, sultan, məlik, bəy və digər feodalların torpaqlarında işləyir və əldə edilmiş məhsulun, adətən $^{1}/_{3}$ hissəsini alırdılar.

Rəncbərlərin əməyindən nisbətən ağır işlərdə - çəltiklə, pambıqçılıqla və ipəkçiliklə bağlı işlərdə istifadə edilirdi. Rəncbərlər üzərində feodal hüququ heç nə ilə məhdudlaşdırılmırdı. Belə ki, feodal rəiyyətdən fərqli olaraq rəncbəri torpaqla birlikdə istədiyi adamlara həmişəlik verə də bilərdi. Bəzən vəzifə sahibləri xidmətdən getdikdən sonra onun ixtiyarında olan rəncbərlər həmin vəzifəyə yeni təyin edilmiş şəxsə verilirdi.

Rəncbərlər müxtəlif vergiləri verməklə yanaşı, həm də torpağı şumlamalı, məhsulu yığmalı, çəltik plantasiyalarını becərməli, çəltikləri arıtmalı, təsərrüfat üçün lazım olan ağac məmulatları, habelə odun gətirməli və kənd təsərrüfatı məhsullarını lazım olan yerə çatdırmalı idilər.

Kəndlilər bu cür çətinliklər qarşısında qaldıqları üçün bəzən başqa yerlərə qaçmağa məcbur olurdular. Rəncbərlərin sırası bir çox amillərə görə çoxalırdı. Bəzi hallarda aclığa məruz qalan və iflasa uğrayan rəiyyət məcbur olurdu ki, özünün kiçik torpaq sahəsini satsın. Beləliklə də, vaxtilə rəiyyət hesab olunan kəndli rəncbərə çevrilirdi. Bəzən başqa ölkələrdən və xanlıqlardan qaçqın kəndlilər də rəncbərə çevrilirdilər[1].

Xanlar məmnuniyyətlə qonşu xanlıqlardan gələn qaçqınları qəbul edir, sonradan isə onlardan ən ağır işlərdə istifadə edərək, üzərlərində nəzarəti artırırdılar. Son dərəcə az gəlir əldə edən rəncbərlər öz ailələrini yaşada bilmir və yaranmış ağır şəraitdən yaxalarını qurtarmaq üçün yeganə vasitəni qaçmaqda görürdülər[2].

Kəndlilərin öz doğma yurdlarını qoyub qaçmaları sinfi

---

[1] İ.P.Petruşevski. Göstərilən əsəri, səh. 13.

[2] Gürcüstan Respublikası Mərkəzi Dövlət Tarix Arxivi, fond 3, iş 52, vər. 10.

mübarizənin passiv formalarından biri idi. Belə hallar tez-tez baş verdiyindən feodallar qaçqın kəndlilərin öz yerlərinə geri qaytarılmaları haqqında biri-biri ilə razılaşırdılar[1].Kəndlilərin digər qrupu olan elatların vəziyyəti heç də rəncbərlərdən fərqlənmirdi. Onlar da rəiyyətlər və rəncbərlər kimi müəyyən vergi verməli və bir sıra mükəlləfiyyətləri yerinə yetirməli idilər.

Yuxarıda göstərildiyi kimi, xanlığın təbəələri xəzinə üçün tələb olunan vergiləri məcburi verməli və hər cür mükəlləfiyyəti daşımalı idilər. Vergi və mükəlləfiyyətlər kəndlilər kimi, şəhər əhalisinə də aid idi. İrəvan xanlığının siyasi tarixi Azərbaycanın digər xanlıqlarından müəyyən qədər fərqli olduğundan bununla əlaqədar olaraq vergi toplamaq üsulu da fərqlənirdi. Bu xanlıq 1797-ci ildən etibarən müstəqilliyini itirmiş və 1828-ci ilə kimi İrəvan xanlığında İran hakimiyyəti bərpa olmuşdur. Odur ki, burada həmin dövrdə vergilər Azərbaycan xanlıqlarında olduğu kimi deyil, mərkəzdən gələn əmrlər əsasında aparılırdı.

İrəvan xanlığında vergilər əhalidən həm məhsulla, həm də pul ilə alınırdı. Pul ilə toplanılan vergilər iki qrupa bölünürdü: vasitəsiz və vasitəli.

Vasitəsiz vergilər ildə bir dəfə taxılçılardan, şəhər əhalisindən, elatlardan, “Üç kilsə” (“Eçmiədzin”) monastırından alınırdı[2].

Xanlıqlar dövründə pul ilə toplanılan vergilərin miqdarı barədə hələlik heç bir sənəd əldə edilməmişdir. Lakin İrəvan xanlığı Rusiya tərəfindən işğal edildikdən sonra çar Rusiyası xanlıqlar dövründə nə kimi vergi sisteminin, qayda-qanunun mövcud olması ilə maraqlanmış və öz məmurlarına bu yerlərin statistik təsvirini tərtib etməyi tapşırmışdır. Beləliklə, rusdilli tarixi ədəbiyyatda başqa xanlıqlarla yanaşı, İrəvan xanlığı haqqında da yazılar işıq üzü görmüşdür.

Belə yazılardan biri İ.Şopenin əsəridir ki, İrəvan xanlığı

---

[1] Акты Кавказской Археографической Комиссии (bundan sonra - AKAK), t. III, док. 1081, стр. 726.

[2] B.M. Arutyunyan. Göstərilən əsəri, 1940.

Rusiya tərəfindən işğal edildiyi ilk çağlarda tərtib edilməyə başlamış və 1831-ci ildə tamamlanmışdır. Həmin əsərdə olan məlumata əsasən İrəvan xanlığının əhalisi vergi vermək siyahısında səkkiz qrupa – cəmiyyətə bölünmüşdür:

**Birinci cəmiyyətə** daxil olanlar:

a)Müsəlmanlar cəmiyyəti – şahın xəzinəsinə 1200;

b) Erməni cəmiyyəti – 2 440 tümən;

c) Qaraçılar 30 tümən vergi verməli idilər.

Göründüyü kimi, müsəlmanlar, daha doğrusu, azərbaycanlılar İrəvan xanlığında əhalinin böyük əksəriyyətini təşkil edirdilər.

**İkinci cəmiyyətə** "Üç kilsə" mənastırı aididi. Şahzadə Abbas Mirzənin sərəncamı ilə bu dini müəssisə hər cür vergidən azad edilsə də, XVIII əsrın sonu, XIX əsrin əvvəllərində İrəvan xanı – sərdar Hüseyn xan erməni dindarlarını ildə 400 tümən vergi verməyə məcbur edirdi.

**Üçüncü cəmiyyətə** İ.Şopen Maku xanlığından pulla toplanılan vergiləri daxil etmişdir. Çox güman ki, İran hakimiyyəti illərində Abbas Mirzə Maku xanlığını İrəvan xanlığına qatmış və ümumi idarəni İrəvan xanı sərdar Hüseyn xana həvalə etmişdir. Maku xanı Əli xana tiyul hüququ əsasında ona verilən Ərəblinski, Qara Həsənli və Diadin kəndləri, habelə Şərur mahalından İrəvan xanlığı ildə 300 tümən verməli idi.

**Dördüncü cəmiyyətə** elatlar aid edilmişdir:

a) Azərbaycanlı elatlardan

Böyük çoban – qara elatları – 350 tümən

Sər – 150 tümən

Dəmirçili – 50 tümən

Kərimbəyli - 130 tümən

Qafarlı – 200 tümən

Şıxlar – 100 tümən

Milli – 300 tümən

Qaraçarlı – 300 tümən

Əlikenli – 300 tümən

Seyidli – 200 tümən

Ağsaxlı – 240 tümən
Ayrımlar – 1040 tümən
b) Kürd ailələrini təşkil edən
Zömlan ailəsi – 400 tümən
Cal-Əli ailəsi – 267 tümən
Sakentli ailəsi – 219 tümən
İsa ağanın tabeliyində olan kürd ailələri – 174 tümən
Xali-xanlı ailəsi – 280 tümən
Qızılbaş uşağı kürdləri–127 tümən
Misir kəndli kürdləri – 151 tümən
Şərur qaraçı kürdləri – 10 tümən

**Beşinci cəmiyyətə** əhalinin binaçı adlanan, vergi verən qismi daxil edilmişdir (binaçı – bina sözündən olub maddi cəhəddən binası – bünövrəsi olan ailələrdən alınırdı). Yeri gəlmişkən qeyd etməliyik ki, bu vergi barədə başqa tarixi ədəbiyyatda hələlik məlumat əldə edilməmişdir.

İran tərəfindən İrəvan xanlığına hakim təyin edilmiş sərdar Hüseyn xan binaçı pullarını ən yaxın iki nəfər köməkçisi vasitəsilə toplayırdı. Bununla belə, sərdar Hüseyn xan özü şəxsən hər bir kəndin vəziyyəti, torpağın münbitliyi, suya olan ehtiyacı ilə maraqlanmış və beləliklə də, kəndlərdə binaçı vergisini verməyə qadir olan həyətləri müəyyən etmişdir.

Binaçı vergisi icbari olsa da, bəzən quraqlıq düşdükdə və yaxud dolu yağdıqda, əkin sahələrinə çəyirtkə üz verdikdə və çay daşqını əkin sahələrini basdıqda rəiyyətlərdən binaçı vergisi alınmırdı. Lakin vəziyyət bir qədər düzəldikdə və əhalinin maddi-rifah halı yaxşılaşdıqda sərdar bu verginin məbləğini də bilirdi. Elə hallar olurdu ki, bu və ya digər təqsir üzündən kənd əhalisini cəzalandırmaq əvəzinə sərdar binaçı verginin miqdarını əvvəlkinə nisbətən xeyli artırırdı. Bəzi mahallarda əhali binaçıdan azad edilirdi. Məs.: Şərurda əhali əldə edilən məhsulu sərdarla tən yarı bölüşdürdüyünə görə binaçı vergisini bir daha vermirdi.

Sonuncu İrəvan xanı sərdar Hüseyn xan bəzi hallarda başqa xanlıqlardan olan qaçqın kəndlilər üçün öz torpaqlarında işləmək

məqsədilə şərait yaradır, onlara əkin istehsal alətləri və qoşqu heyvanları verməklə müəyyən vaxt onları vergidən azad edirdi. Sonralar xüsusi vergi siyahısına daxil edilərək həmin kəndlilərdən tələb olunan vergilər toplanılırdı.

İrəvan xanlığında binaçı vergisi verən kəndlilər iki qismə bölünürdülər: bəhrəkərlər və yarımkərlər.

Bəhrəkərlər sərdarın xəzinəsinə ildə 10 tümən məbləğində binaçı verməli idilər.Yarımkərlər isə üç tümən binaçı verməklə kifayətlənirdilər. Ermənilər azərbaycanlılardan fərqli olaraq sərdarın xəzinəsinə daha çox məbləğdə binaçı verməli idilər.

**Altıncı cəmiyyətə** pul ilə ödənilən "hədiyyələr" daxil edilmişdi. Bütün Şərq aləmində olduğu kimi, İrəvan xanlığında da bu vergi iki qismə bölünürdü: peşkəş və rüşvət. Peşkəş hörmət naminə və ya digər şəxsə verilirdi. Rüşvət isə müəyyən məqsədə çatmaq məqsədi ilə vəzifəli şəxslərə "hədiyyə" adı altında verilirdi. Peşkəş adətən, bayram günləri. Xüsusilə Novruz bayramı zamanı təqdim olunardı. İrəvan xanı sərdar Hüseyn xan əhalidən aşağıdakı qaydada peşkəş alırdı.

Maku hakimi Əli xan – 200 tümən
Eçmiədzin monastırı – 150 tümən
İrəvan əhalisi:
Azərbaycanlılar – 70 tümən
Ermənilər – 30 tümən
Zəngibasar və Qırxbulaq mahallarında azərbaycanlılar – 70 tümən
Ermənilər – 18 tümən
Qarnibasar və Vedibasar mahallarından – 70 tümən
Şərur mahalından- 70 tümən

Yuxarıda qeyd edilən peşkəşdən savayı İrəvan əhli sərdara ildə 60 ədəd kəllə qənd verməli idi. Şərur əhalisi bəzən pul vergisini buğda və çəltiklə əvəz edirdi.

Dərakənd və Saatlı mahallarının ağsaqqalları ildə sərdara dəyəri 20 tümən olan dayça verməli idilər.

**Yeddinci cəmiyyətə** ermənilərin üzüm bağları daxil edilmişdi.Şəriət qanunlarına görə müsəlmanlara spirtli içkiləri hazırlamaq və içmək qadağan edilmişdisə, sərdar Hüseyn xan və onun yaxın adamları xudmani məclislərdə şərabdan imtina etmirdilər. Lakin buna baxmayaraq xarici və daxili bazarda böyük gəlir əldə edən şərab hazırlayan ermənilərdən sərdar lazimi vergiləri toplayırdı.

Qırxbulaq mahalının Çalmaqçı kəndinin üzüm sahələrindən 150 tümən, Kanaqzir kəndindən 100 tümən, Qızılqaya kəndindən 90 tümən, Zəngibasar mahalının Şirabad kəndindən 100 tümən, Qarnibasar mahalının Aştaraki kəndindən isə 240 tümən vergi toplanılırdı.

Üzüm bağları olan azərbaycanlılardan şərab hazırlamadıqlarına görə vergi də alınmırdı.

**Səkkizinci cəmiyyətə** pul ilə toplanılan müxtəlif vergilər daxil edilmişdi: həmin vergi əsas etibarilə xanın məmurlarının xeyrinə toplanılırdı. Bu silsiləyə xanın yaxın adamları daxil idilər-mirzələr, mahal bəyləri-raiblər və mirablar.

Suya və suvarmya böyük ehtiyac olduğundan mirablar nəqd puldan savayı, həmçinin süni suvarmadan istifadə edən kəndlilərdən müəyyən miqdarda buğda, arpa və pambıq da alırdılar.

İrəvan xanlığında kəndlərdə vergi toplayan məmurların xeyrinə olaraq əhalidən xüsusi olaraq “Qulluq pulu” və yaxud “qulluği” adı ilə xüsusi vergi toplanılırdı.

Kənd əhlindən fərqli olaraq şəhərlilər “keşıkçı pulu”adı ilə xüsusi vergi verirdilər ki, keşıkçılər onların gecə və gündüz əminamanlıqlarını təmin etsinlər.

İrəvan xanlığından pul ilə toplanılan vergilərdən biri da “rahdari” gömrüyü idi. Bu vergi haqqında bir qədər aşağıda bəhs olunacaq.

**Torpaqla əlaqədar vergilər.** Belə vergilər buğda ilə ölçülürdü. İrəvan xanlığında da bu vergi Naxçıvan xanlığında olduğu kimi, “bəhrə” adlanırdı. Taxılçılıqla məşğul olan rəiyyətlər üçün “bəhrə” məcburi vergi idi. Hər il məhsul yığıldıqdan sonra xan

nökərlərini kəndlərə göndərirdi ki, taxılın miqdarını müəyyənləşdirsinlər. Heç kimin ixtiyarı yox idi ki, xanın icazəsi olmadan məhsula sahib çıxsın. Taxılın miqdarı müəyyənləşdirildikdən sonra məhsul aşağıdakı qaydada bölüşdürülürdü: xəzinə torpaqlarından toplanmış məhsulun hər 10 hissəsindən 3,5 hissəsi xanın, qalanı isə torpağı becərənlərin idi. Mülkədar torpaqlarından isə toplanmış məhsulun 1,5 hissəsi mülkədarın, iki hissəsi xəzinənin, qalan hissəsi torpağı becərənin payına düşürdü. "Bəhrə"nin iki hissəsi buğda ilə, bir hissəsi isə arpa ilə ödənilirdi.

Natura halında toplanılan verginin miqdarı bəzən vergi toplayan məmurların özbaşınalığı nəticəsində artırılırdı.

**Mal-qaraya görə toplanılan vergi** (gümüş pulla)

Camış üçün -1manat
İnək üçün -50 qəpik
Ulaq üçün -50 qəpik
Dişi ulaq üçün – 1 ma.20 qəpik
Yük daşıyan at üçün – 2 man. 20 qəpik
Dişi at üçün -1 manat

Minik atları heç bir gəlir gətirmədiyindən sahibi vergidən azad olunurdu. Taxılın əkilib becərilməsində öküz və kəllər üçün də vergi alınmırdı.

Qoyun sürüsü saxlayanlar hər baş qoyun üçün bir "pənahabadi" və yaxud 20 qəpik gümüş pul verməli idi[1].

İqtisadiyyatının əsas sahəsini maldarlıq təşkil edən xanlıqlarda maldarlar heyvanlarını dövlətə məxsus çəmənliklərdə otardıqları üçün xəzinəyə "çopbaşı" adlanan xüsusi vergi verirdilər.Ondan eyni zamanda "çobanbəyi" vergisi də toplanılırdı.Bundan başqa maldarlar xana yağ, yun və başqa məhsullar da verməli idilər. Mənbələrin birində bu barədə oxuyuruq "... maldarlardan alınan vergilərdən başqa, sərdar öz mal – qarasını

[1]Şuşada kəsilmiş pul vahidi "pənahabadi" bütün xanlıqlarda işlədilirdi.

saxlamaq üçün də elatlatdan yem alırdı..."[1]. Bundan əlavə, hər bir elatdan ildə sağılan bir baş qoyuna görə yarım batman yağ, sağılan və sağılmayan qoyunlara görə isə yun alırdılar. Göründüyü kimi kəndlilərdən pul ilə vergi toplanılsa da, vergini pul ilə əsasən, şəhər əhalisi verməli idi.

Şəhərlilər aşağıdakı maddələr üzrə də xəzinəyə pul verməli idi:

1. **Mancanaq pulu** – bu vergi dəzgahlarda ipək toxuyan hər bir sənətkardan alırdı.

2. **Toxucu pulu -** bütün il boyu toxuculuqla məşğul olan sənətkarla yanaşı, qış mövsümündə əkin sahələrində işləməyən və sənətkarlıqla, xüsusilə toxuculuqla məşğul olan kəndlilər də xəzinəyə vergi verməli idilər.

3. **Bağpulu** – həmin vergini şəhərdə və şəhər həndəvərində bağı olan şəhərlilər verirdilər.

4. **Bayramlıq** – xüsusilə, Novruz və Qurban bayramları zamanı həm şəhər, həm də kənd əhalisindən alınırdı.

5. **Toyxərci** – həmin vergi həm xanın, həm də rəiyyətin evində toy olarkən xəzinəyə verilirdi.

6. **Dəyirmanpulu** – bu vergini şəhər və kənd əhalisi dəyirmandan istifadə etdiyi üçün verməli idi.

7. Hamamdan, karvabsaradan və dükan binalarından istifadə etmək üçün də müəyyən vergi ödənilirdi.

8. Tacirlər, sənətkarlar xəzinəyə ildə təqribən 400 tümən vergi verməli olurdular.

9. Rəiyyətlər qeyd edilən vergi ilə yanaşı, müəyyən mükəlləfiyyət ə daşımalı idilər. Mükəlləfitə iki şəkildə olurdu- "biyar" və "əvariz".

Kənd təsərrüfatı vergilər kəndlilərin iqtisadi vəziyyətini ağırlaşdırırdı. Xarici işğalçıların və feodala ara müharibələrinin vurduğu ziyana baxmayaraq xanın vergiyığanları, darğalar və digər məmurlar rəiyyətlərdən vergini qamçı ilə alırdılar. Lakin kəndlilər,

---

[1]İ.İ.Şopen. Göstərilən əsəri, səh. 1127.

yaşamaq xatirinə ağır vergilərə dözür, yeganə yaşayış mənbəyi olan torpaqlardan ayrıla bilmirdilər. XVII əsrin axırıncı rübündə kəndlillərin ağır vəziyyətinin şahidi olmuş, səyyah Marşall Fon Biberşteyn yazırdı: " Aramsız müharibələr və əhalinin narahtçılığı əkinçiliyə mənfi təsir göstərsə də, kəndlilər torpaqları becərməyə məcbur olurdular". [1]

Kəndlilər həm əkin həm də məsul yığımı zamanı bir sıra çətinliklərlə qarşılaşırdılar; onları hər an xaricdən təhlükə gözləyirdi. Bəzən hazır məhsul xarici işğalçılara qismət olurdu. Daim gedən müharibələr və soyğunçuluq kəndlilərin həmişə üstlərində xəncər, yaxınlıqda isə silah saxlamağa vadar edirdi.

Xanlığın relyefi ilə bağlı olaraq kəndlilər torpağı işlərkən cüt və toxadan istifadə edirdilər. Cütə bir və ya iki öküz qoşaraq nisbətən yumşaq yerləri, kotanla isə daşlıq yerləri şümlayırdılar. Torpağın suvarılmasına gəldikdə qeyd etməliyik ki, yalnız düzən olmayan yerlərdə kiçik kanallar-arxlar çəkilirdi.

Ucuz və asan başa gəldiyi üçün kəndlilər tədricən əkinçilikdə cütdən istifadə etməyə başladılar. Lakin bu kəndlilərin hamısına nəsib olmurdu. Dağlıq hissələrdə cütdən və işlək heyvandan istifadə etmək olmurdu. Ona görə də kəndlilər yamaclarda torpağı daha primitiv alətlərlə- kərki və bellə şumlayırdılar. Dağlıq yerlərdə əsasən dəmyə əkirdilər. İrəvan xanlığının dağlıq yerlərində az miqdarda kətan becəriliurdi. Kətandan təkcə yağ alınmırdı, ondan həmçinin toxuculuqda da istifadə edirdilər.

İrəvan xanlığının kənd təsərrüfatının əsasının taxılçılıq təşkil edirdi. Taxılçılıqla demək olar ki, əhalinin əksəriyyəti məşğul olurdu. Hətta bəzən maldarlar da öz şəxsi istifadələri üçün yaxıl əkirdilər.

İrəvan xanlığında yazlıq və payızlıq taxıl əkilirdi. Payız əkini sentyabr ayında başlayır, Novruz bayramından yüz gün keçdikdən sonra təqribən iyun ayının ortalarında yığılırdı. Yazlıq buğda isə mart ayının axırında əkilir, payızlıq taxıldan iki həftə

---

[1] AMEA- nın Tarix İnstitunun Elmi arxivi, sənəd 467, səh. 36.

sonra yığılırdı. Rusiya tərəfindən işğal edilməzdən əvvəl İrəvan xanlığında yığılan taxıl təqribən 10 min xalvara bərabər idi.

Kənd təsərrüfatə sahəsində İrəvan xanlığının əhalisinin əsas məşğuliyyətlərindən biri də bağçılıq idi. Bağçılığın əsasını meyvəçilik və üzümçülük təşkil edirdi. İrəvan xanlığının kəndlərinin iqtisadi həyatında bostançılığın da özünəməxsus yeri var.

Əhali ipəkçiliklə də məğşul olurdu. Xanlığın düzənlik yerlərindəki kəndlərində tut ağaclarının cərgəsi genişləndirilirdi ki, onlarla da ipək qurdları yemlənirdi.

Dağlıq yerlərdə yaşayan əhali maldarlıq məşğul olurdu. Varlı maldarların iki yüzə qədər iribuynuzlu mal-qarası, on və yaxud daha çox atı olurdu. İrəvan xanlığının düzən ərazilərində təbii otlar olmadığından əhali süni biçənəklər yaratmağa çalışırdı. Şumlanmış sahələrdə xüsusilə ot-yonca əkilirdi. Yonca atlar üçün ən yaxçı yem sayılırdı.

Öküzlərdən və kəllərdən topağın şumlanmasında və qoşu məqsədi ilə, atlardan və qatırlardan isə minik vasitəsi kimi istifadə olunurdu. Göründüyü kimi, İrəvan zanlığının iqtisadiyhyatında kənd təsərrüfatı mühüm yer tuturdu. Təsərrüftada əsas rolu əkinçilik və maldarlıq oynayırdı. Lakin bu heç də sənətkarlığın və ticarətin əhəmiyyətini azaltmırdı.

Sənətkarlıq və ticarətdən danışmazdan əvvəl xanlığın əsas şəhəri olan İrəvan haqqında məlumat verməyi lazım bilirik. Bu şəhər təkcə şərq mənbələrində deyil, eyni zamanda orta əsr rus arxivlərində çox zaman "Rəvan" adlandırılırdı. Bu da təsadüf deyildi. Şəhər XVI əsrin əvvəllərində dağlarla əhatə olunmuş rəvan yerdə-düzənlik salındığı üçün "Rəvan" adlandırılmışdır. Məlum olduğu kimi həmin bölgədə yaşayan azərbaycanlılar "r" hərfinin əvvəlinə "i" hərfi əlavə edirlər. Məsələn, Rza-İrza, rahat-irahat, "rəhmin gəlsin"-"irəhmin gəlsin" və s. "Rəvan" sözünün əvvəlinə "i" hərfi əlavə olunaraq "İrəvan" adı əmələ gəlmişdir. Sonralar ermənilər azərbaycanca səslənməsin deyə, bu adı "Yerevan" və "Erivan" çağırmışlar. Yeri gəlmişkən onu da qeyd edək ki, erməni

alimlərinin Şərq –müsəlman adlarını “erməniləşdirmələri” onlarda bir peşə olmuşdur.

XVIII əsrin birinci yarısında İrəvan şəhəri Osmanlı əsgərləri tərəfindən zəbt edilmişdir. Osmanlılar 1723-cü ildən 1735-ci ilə qədər şəhəri öz əllərində saxlamışlar. 1735-ci ildə İrəvan qalası Nadir şahın sərbəzları tərəfindən zəbt olunarkən qarətı məruz qalmışdır. İran qoşunları ermənilərin “Məkkə” si sayılan “Üç kilsə” monastına katolikosdan “hədiyyə” almış Nadir şahın göstərişinə əsasən toxunmağa cürət etməmişdilər.

İrəvan şəhəri 1795-ci ildə İrəvan hökmdarı Ağa Məhəmməd xanın qoşunlar, 1827-ci ildə rus qoşunları tərəfindən işğal olunmuşdur.

Xanlıq dövründə mərkəz şəhər olan İrəvan yaşıllıqlara qərq olunmuşdur. Qalanın ətrafında şərq üslubunda ucaldılmış dairəvi hasarın uzunluğu 28 verstə bərabər idi. Qala divarı Zəngişay körpüsü, Dəmirbulaq məhəlləsi, Abbasdarı, Köşəli, Abaqayat, Qarabağ, Zokalqala adlanan adlanan yerlıərdən keçərək Zəngfi çayı tərəfə dönüb bir dairə yaradırdı. Qala daxilindəki sahənin əsasən hissəsini bağlar təşkil edirdi. İrəvan qalası inzibatl cəhətdən üç məhəlləyə bölünürdü: Şəhər məhəlləsi, Topbaşı məhəlləsi və Dəmirbulaq məhəlləsi. Şəhər məhəlləsi ən geniş sahəni tuturdu. Topbaşı məhəlləsi qalanın qərb, Dəmirbulaq məhəlləsi isə qalanın cənub-qərb hissələrini əhatə edirdi. İrəvan su cəhətdən təminatına görə Azərbaycannın digər şəhərlərindən fərqlənirdi. Şirin sulu Qırxbulaq çayı Abbasdərə, Şəhər, Dəmir bulağı və Xosrovabad sahələrdəki bağları suvararaq Zəngi çayına xırdı.

İlk baxışda İrəvan qalası nəzərəçarpacaq heç bir təsir bağışlamırdı. Bu şəhərin xaraixi görünüşü adi şərq şəhərlərindən fərqlənmirdi. Burada da küçəlıər dar və əyri-üyrü idi. Qala daxilindəki evlər hasarlarla əhatə olunurdu. Şəhərin mərkəzlərində axan çaylardan həyətlərə su çəkilmişdi. Həyətlər əsasən, ev və ya həyətyanı bağlardan ibarət idi. Evlərin pəncərləri hündürdə tikilirdi ki, içəriyə baxan olmasın və həmçinin otaqdan keçəni, bayırı görə bilməsinlər, qonşuluq da evdə olmasın.

İrəvan şəhərində 8 məscid müsəlmanlara xidmət edirdi. Şəhərə ictimai müəssisələr az idi. Hər bir məscidin öz məktəbi var idi. Hüseyn Əli xan məscidində 200 şagird təhsil alırdı.

İrəvanda Şəhər və Topbaşı məhəllərləri arasında bazar yerləşirdi. Burada karvansara, tacir və səntkar dükanları var idi. Ümumiyyətlə, qala daxilində yeddi karvansara mövcud idi.

XVIII əsrin ikinci yarısında Azərbaycanda mövcud olan iqtisadi və siyası pərakəndəlik İrəvan şəhərinin də inkişafına öz mənfi təsirini göstərmişdir. Bu təsir o qədər böyek olmuşdur ki, şəhər rus qoşunları tərəfindən işğal edildikdən (1827) sonra da uzun müddət öz simasını dəyişdirə bilməmiş, feodal şəhəri olaraq qalmışdı. Öyrəndiyimiz dövrdə şəhər möhtəşəm bina və abidləri ilə fərqlənmirdi. “Xan sarayı”ndan başqa, demək olar ki, burada evlərin əksərittəi birmərtəbəli, damları isə yastı idi. Şəhər evlərinin çoxu daş və palıçıqla hörülmüş hündür hasarlarla əhatə olunmuşdur[1].

1795-ci ildə İran kökmdarı Ağa Məhəmməd xanın Azərbaycana birinci yürüşü zamanı irəvanlılar düşmənə ciddi müqavimət göstərə bilməmişdilər. Sərbazlar şəhəri dağıdaraq əhalinin bir qismini İrana köçürmüşdülər. Bu hadisəsədn dsonra İrəvan əhalisinin sayı kəskin şəkildə azalmışdı. Birinci və ikinci Rusiya-İran müharibələri dövründə şəhər güclü dağıntıya məəruz qalmışdı. Təkcə bunu qeyd etmək kifayətdir ki, XVII əsrin axırlarına nisbətən XIX əsrin əvvəllərində İrəvan şəhərinin cəmi bir neçə yüz evi var idi. İ. Şopen şəhərin xarici görünüşünü obrazlı şəkildə ifadə edərək yazmışdır: “Buranın görünşü qəddarlıqla zəbt edilmiş şəhəri xatırladır. Şəhərdəki dəhşətli dağıntılar nəticəsində uçurulmuş evlər, ensiz dar küçələr cəhənnəmi andırır. Bəzi yerlərdə palçıqdan hörülmüş divarların qalıqları üzrənidə quşlar yuva salmışdı”. Başqa bir mənbələrdə də təxminən belə bir ifadələrə rast gəlirik: “İrəvanın xarıcı görünüşü İran şəhərlərini xatırladır. Bütün evlər birmərtəbəlidir. Hündür palçıq divarla əhatə olunmuşdur. Küçələr dar, əyri və natəmiz olduğundan şəhər həddindən artıq miskin

[1] Друвиль Гаспар. Путешествие в Персию в 1812 и 1813 годах. М., 1826, стр. 48.

görünür. Küçələri əyri olduğundan nə qədər gəzsən də, hündür divarlardan başqa heç nə görməzsən. Meşə olmadığndan evlərin hamısı palçıqdan hazırlanmış kərpiclərdən hörülmüşdür. Ümumiyyətlə, burada ağacdan tikilmiş evlərə rast gəlmək mümkün deyil".

Şəhərin mərkəzində dördkünc şəkildə bazar var idi. Bu bazarda üç karvansara yerləşirdi. Dükanların hamısı demək olar ki, bazarda mərkəzləşmişdi. Burada adi və memarlıq baxımından sadə, Asiya üslubundan tikilmiş dörd məscid var idi.

XIX əsrin başlanğıcına aid mənbələrin birində deyilir ki, Cənubi Qafqazda Rusiay tərəfindən işğal olunmazdan əvvəlki dövrdə ,demək olar ki, "bütün şəhərlərdə evlər tikilərkən onların gözəlliyinə, düzgünlüyünə, məqsədəuyğun şəkildə tikilməsinə diqqət verilmirdi".[1] Sənətkarların evlərindəki otaqlardan biri emalatxana və ya dükan üçün ayırlırdı. Bu cür evlər Yaxın Şərqin başqa orta əsr evlərindəki evlərdən fərqlənmirdi. Əhalinin əksəriyyəti kiçik və o qədər də hündür olmayan evlərdə və zirzəmilərdə yaşayırdı. Kasıbların bir və ya iki otağı olardı. Bunlar həm yataq otağını, həm də mətbəxi əvəz edirdi. Bu cür evlərdə adətən, pəncərə qoyulmurdu. Ona görə də belə evlər, xüsusilə qış döründə yaşayış üçün əlverişli deyildi. Yoxsulların evinin döşəməsində çörək bişirmək üçün də təndir olurdu.

Evlərin küncündə kiçik ocaqlar düzəldilir, tüstününü çıxması üçün evin tavanında baca qoyulurdu.

Evin daxilində əşyalar aşağıdakı qaydada yığışdırılırdı: divarın yuxarı hissəsindəki düzəldilmiş çıxıntıları-ləmələrin üzərinə şüşə və digər qablar yığılırdı. Döşəməyə palaz və ya həsir sərilirdi. Yorğan-döşəyi və digər zəruri əşyaları divardakı taxçalara yığır və üstünü müxtəlif rəngli parçalarla örtürdülər.

Şəhərin varlılara məsus evlərində otaqların sayı nisbət çox olurdu. Belə evlərdə ocaqlar əvəzinə daşdan hörülmüş buxarılar, sadə

---

[1]О.Евецкий. Статистическое описание Закавказского края в исходе в., XVIII СПб., 1835, стр. 45.

şüşə və ucuz qabların əvəzinə çini qablar, gümüş və qızızlı qab-qacaq, palaz əvəzində xalı-xalçalar, gəbələr olurdu. Yorğan-döşək divarlarda yerləşdirilmiş sandıqların üstünə və ya içinə yığılır, taxta və camaxatanlar pərdələrlə örtülürdü. Bəzi varlıların evlərinin divarları milli naxışlarla bəzədilirdi, pəncərlərə əlvan şüşələr vurlurdu.

İlk mənbə və sənədlərə əsaslanaraq, belə bir qənaətə gəlmək mümkündür ki, XVIII əsrin ikinci yarısı-XIX ərin əvvəllərində İrəvan özünün beynəlxalq aləmdə keçmiş iqtisadi əhəmiyyətini itirmişdi.

XVIII əsrin ikinci yarısında Azərbaycan şəhər əhalisinin sayı və ictimari tərkibi demək olar ki, öyrənilməmişdir. Halbuki, bu məsələlərin tədqiqi şəhərlərin sosial-iqtisadi quruluşunu, ölkənin ioqtisadi vəziyyətini, əhalinin sayca və ictimai tərkibcə öyrənimәsini, sənətkarlıq məhsullarının, ticarətin vəziyyətini və miqdarını, yerli bazarların və şəhər əhalisinin tələbatını müəyyənləşdirməyə şərait yaradırdı.

İrəvan şəhərində əhalinin vəziyyətini dəqiqləşdirmək üçün faktiki material son dərəcə azlıq təşkil edir. Yalnız xanlıq Rusiya tərəfindən işğal edildikdən, çarizm zəbt olunmuş yeni torpaqlarda əvvəllər mövcud qayda-qanunu öyrənmək məqsədilə öz məmurlarına həmin yerləri yazılı surətdə təsvir etməyi tapşırdıqdan sonra müəyyən sənədlər hazırlanmışdı. Rus məmurlarının müstəmləkəçilik baxımından tərtib etdikləri "təsvirlər" və arayışlar hazırda Azərbaycan tarixi üçün əvəzedilməz mənbələrə çevrilmiş və əhalinin ictimai tərkibi haqqında həqiqətə uyğun məlumatlar əldə edilmişdir. Həmin dəlillərdən müəyyən etmək olur ki, İrəvan xanlığı nəinki Rusiyanın işğalı ərəfəsində, həm də Rusiya dövlətinin tərkibində olduğu müddətdə də İrəvan şəhəri xalis feodal şəhəri olmaqda davam etmiş, əhalisinin əksəriyyəti də azərbaycasnlılardan ibarət olmuşdur.

Feodal ara müharibələri və xarici işğalçılsrın tez-tez baş verən basqınları nəticəsində şəhər əhalisi öz doğma evini və ocağını tərk etməyə məcbur olurdu. Qaşqın əhali öz əmlakı ilə birlikdə əlçatmaz

yerlərdə gizlənirdi. Bu zaman şəhərə əhalisinin çox hissəsi soyuqdan və aclıqdan məhv olurdu. Bu cür hadisələr Azərbaycanın şəhərlərində, o cümlədən İrəvanda tez-tez baş verirdi. Bəzi hallarda isə işğalçılar əhalini cəzalandırmaq məqsədilə onları zorla başqa yerlərə köçürdürdülər. Lakin belə siyasi hadisələr şəhər əhalisinin ictimai tərkibində əsaslı dəyişiklik yarada bilmirdi. Əldə olunan məlumata görə, İrəvan xanlığının Rusiya tərəfindən işğal edildiyi dövrdə şəhərdə beş mindən artıq əhali yaşayırdı.

Beləliklə, XVIII əsrin ikinci yarısında və XIX əsrin əvvəllərində İrəvan xanlığında yeganə şəhər İrəvan feodalizminə xas spefisik cəhətləri özündə birlşdirirdi. Burada da sənətkarların və tacirlərin fəaliyyəti, əsasən, kənd təsərrüfatı məhsullarının istehsalı ilə bağlı idi. Belə bir vəziyyət şəhərə əhalisinin ictimai tərkibinə təsir göstərməyə bilməzdi. XVIII əsr və XIX əsrin birinci yarısında burada sənətkar və xırda tacirlərlə yanaşı, kənd əhlinə, feodallara, həmçinin əkinçilərə, maldarlara və qaçqın kəndlilərə də təsadüf edilirdi. Məhz ona görədir ki, kənd təsərrüfatı ilə müqayisədə sənətkarlıq vəı ticarət xanlığın təsərrüfat həyatında mühüm yer tuturdu. Təsadüfi deyildir ki, xanlıqda əhalinin məşğuliyyəti bilavasitə əkinçiliklə bağlı idi. Belə vəziyyət, əksər hallarda natural təsərrüfatın çiçəklənməsi üçün şərait yaradırdı.

Bir çox orta əsr şəhərlərində olduğu kimi, İrəvanın da sənayesinin özyəni sənətkarlıq təşkil edirdi. Kənd yerlərində sənətkarların və kustar sənayenin inkişafında aztorpaqlı kəndlilərin rolu daha böyük idi. Çünki son dərəcə az olan məhsulu yığdıqdan və kiçik torpa sahəsini əkdikdən sonra, xüsusilə qış vaxtı, bekar qalan kəndlilər də istər-istəməz sənətkarlıqla məşğul olurdular.

Çoxsahəli təsərrüfatla məşğul olan kəndlilər ilk növbədə öz ailələrinin və təsərrüfatlarının ehtiyaclarını nəzərə alırdılar. Belə ki, kəndli ailələri çörək bişirir, ipək lifləri açır, yun darayır və rəngləyir, paltar tikir, paltar aşılıayır, ayaqqabı tikir, xalça toxuyur, yaşayış evi, tövlə inşa edir, əmək alətləri hazırlayır, dülgərlik və dəmirçiliklə məşğul olurdular.

İrəvan xanlığında toxuculuqda geniş yayılmışdı. Demək olar ki, hətr bir kəndli ailəsinin əyrici və toxucu dəzgahı var idi. Bu barədə İ.Şopen yazır: "Burada sənətkarların əksəriyyətini toxucular təşkil edir. Hər bir ailənin öz dəzgahı var ki, bu dəzgahlarda qadınlar ipəkdən bez toxuyur və pambıq parça hazırlayırdılar. Toxuculuq məhsulları əsasən, ailənin öz təsərrüfatı və məişət tələbatını ödəyirdi".

Gəbə, palaz, cecim, məfrəş-evi bəzəmək üçün; yun və pambıq parça-üst palatları tikmək üçün, xurcun, çuval-yola çıxanlar üçün; dəridən çarıq, palan və yəhərlər hazırlamaq üçün istifadə olunurdu.

XVIII əsrin ikinci yarısında Azərbaycan şəhərlərində, o cümlədən İrəavan şəhərində belə sənət və peçə növləri müəyyən edilmişdir: dərzi, papaqçı, çəkməçi, başmaqçı, zərgər, sərrac, dəmirçi-misgər, toxucu, boyaqçı, qəssab, çörəkçi, bınna, xarrat, dülgər, şüşəsaz, keçəsi, dabbağ, bəzzaz, kababçı və s.

Azərbaycanın digər şəhlərində olduğu kimi, burada da sənətkarların əksəriyyəti "əsnaf" adlanan sex təşkilatları ətrafında birləşirdi. Lakin əsnaflar sex təşkilatlarının zəif olduqları üçün ölkənin həyatılnda bir o qədər də həlledici rol oynamırdı. Sex başçılarınnı (ustabaşı) hüquqları sex təşkilatının hüquqlarında kənara çıxmırdı. Sex təşkilatlarının zəifliyi üzün dən Azərbaycan şəhərlərinin hamısında "əsnaf" üzvləri ilə yanaşı, fərdi sənətkarlar da fəaliyyət göstərirdilər.

İrəavan xanlığında fərdi sənətkarlıqda xalçaçılıq əsas yerlərdən birini tuturdu. Xalçaçılar həm özləri, həm də satış üçün xalça-palaz hazırlayırdılar. Boyaqçılığın inkişafına da diqqət yetirilirdi. Yunun və müxtəlif ev əşyalarının boyanmasında təbii bitkilərdən istifadə olunurdu.

Dəmirçilər, təkərçilər, metal əşyalardan əmək alətləri, o cümlədən dəryaz, oraq, balta, nal, bıçaq, mismar və başqa şeylər hazırlayırdı.

Arxeoloji qazıntılar nəticəsində əldə olunmuş saxı qab nümunələri burada dulusçuluğun inkişaf etdiyini sübut edir. İrəvan sənətkarları arasında sabunçuların məhsulları da xüsusilə fərqlənirdi.

İrəvan şəhərində şüşəsazlıq sənəti zəif inkişaf etmişdi. Halbuki, burada inşaatda adi şüşlərdən yanaşı, şəbəkələrdən də istifadə olunurdu. “Mətndaran”da saxlanılan mənbələrdən birində məlum olur ki, İrəvan xanlığını hakimlərindən biri-Hüseynəli xan Naxçıvanlı Kəlbəli xandan xahiş etmişdi ki, İrəvan şəhərində tidirdiyi hamamın pəncərə-şəbəkəsi üçün 400 ədəd müxtəlif rəngli şüşə göndərsin[1].

Sənətkar emalatxanaları-dükanalr demək olar ki, bazar meydanlarında mərkəzləşirdi. Xarici, tranzit və yerli ticarət də əsasən, bazarlarda aparılırdı. İrəvan şəhərinin bazarında irili-xırdalı 138 dükan vardı[2]. Tacir və sənətkar düknalarından başqa bazarda həmçinin ərzaq düknaları var idi. Ticarət, xüsusilə yerli ticarət, sənətkarlıqla birlikdə şəhərin iqtisadi həyatının əsasının təşkil edir və əsasən, iki cür aparılırdı: topdansatış və pərakəndə.

Bazarda ticarətin bütün növləri üzərində ağır vergilər, gömrük haqqı qoyulmuşdu. Xanlığın hər bir bucağında-qala qapısında tutmuş çayların keçidlərinə qədər, hətta dini ocaqlara gedən yolların hamısında, rahdarları və bacdarları qurub, gedib-gələnlərdən ağır vergilər alırdılar[3].

Rahdaların və bacdarların hamısı vergi toplayırdı. Lakin buna baxmayaraq, onların fəaliyyətində müəyyən fərq var idi. Bacdarlar gələn tacir və səyyahlardan bir növ “torpaqbasdı” gömrüyü alırdılar. Rahdarlar idə yalnız xanlığın daxilində vergi toplayırdılar.

İrəvan xanlığının ticarətindən bəhs olunarkən qeyd etmək lazımdır ki, ərazidə tez-tez feodal ara müharibələri getdiyindən, xanlıq müharibə meydanına çevrildiyindən və rahat yollar olmadığından daxili ticarət zəif inkişaf etmişdi.

Daxili ticarətdən fərqli olaraq, xanlıqda gəlmə tacirlərin gəlmə hesabına xarici ticarətdə canlanma hiss olunurdu. Xaricdən, xüsusilə Rusiyadan gələn tacirlər ölkələrinə İrəvan ustalarının

---

[1]Məhəmməd Müslüm (Qüdsi). İrəvanlı Hüseyn Əli xanın məktubları (1789- 1791). “Mətndaran” (“Matenadaran”), 233-cü sənəd, vər. 51.

[2] Статистическое описание Нахичеванской провинции. Тифлис, 1833, стр. 96.

[3]“Mətndaran” , 411-ci sənəd, vər. 1.

hazırladıqları nəfiz ipək parçalar aparırdılar. Təsadüfi deyildir ki, Moskvadakı, Nijni-Novqoroddakı yarmarkalarda İrəvanda istehsal edilmiş ipək parçalara və müxtəlif rənglərlə boyanmış saplara təsadüf olunurdu. İrəvan xanlığından bir sıra xarici bazarlara ağ və qırmızı bez parçalar, düyü, şərab və s. məhsullar aparılırdı. Bez əsasən, Qarabağ xanlığına, düyü Mərənd, Xoy və təbriz xanlıqlarına, pambıq, parça Bayazid, Qars, Tiflis, Şuşa və digər şəhələrə ixrac edilirdi.

Ticarətin zəif inkişaf etməsinə baxmayaraq, İrəvan xanları xəzinəni əsasən, ticarətdən yığılan vergilər hesabına doldururdular.

Ona görə də xanlar ticarət vergilərinin toplanmasına ciddi fikir verir, bu məsuliyyətlki işi ən yaxın adamlarına etibar edirdilər. İrəvan xanlığının ticarətində ən çox gəlir “rahdari” gömrüyündən əldə edilirdi. Demək olar ki, bazara gətirilən bütün mal və məhsullardan növündən, cinsindən, sayından asılı olmayaraq “rahdari” gömrüyü alınırdı.

Xanlqlar dövründə “rahdari” gömrüyü xanların ən böyük gəliri hesab olunurdu. İrəvanlı Hüseynqulu xanın məktublarınnı məcmuəsində açıqdan-açığa göstərilirdi ki, xanın gəlirinin əksəriyyətini “rahdari” gömrüyü təşkil edirdi[1].

İrəvan xanlığında “rahdari” gömrüyü toplamaq hüququ başqa sahələrdə olduğu kimi icarəyə verilirdi. Xandan böyük məbləğ (ildə təqribən 1300 tümən) həmin “vəzifəni” almış icarədarın bazara gətirilən mallardan gömrük toplamağa hüququ olurdu. Məsələn, at və dəvə ilə gətirilmiş hər top ipək, boyaq, sap və pambıq yükü üçün sahibkar icarədara 4 manat 20 qəp. verməli idi.

Şəkər, dəmir məlumatları, həna, yağ, bal, tütün, mal piyi və s. satan tacir 2 manat 12 qəpik “rahdari” gömrüyü verməli idi. Boyaqçılara lazım olan qırmız (marena) adlı boyaq bitkisi, həmçinin İrandan gətirilmiş müxtəlif məhsullar üçün tacirdən 1 manat 60 qəpik miqdarında “rahdari” alınırdı. Saxsı qablar üçün də satıcı 25 qəpik gömrük verməli idi. Məhsulun satılıb-satılmamasından asılı

[1]Məhəmməd Müslüm (Qüdsi). Göstərilən əsəri, səh. 242.

olmayaraq, satıcıdan geri qayıdarkən "rahdari" gömrüyü alırdılar. İrandan gətirilən toxunma parçalara görə 2 manat 40 qəpik həcmində gömrük verilirdi. Xanlıqdan aparılan üzüm, noxud və düyü üçün gümüş pulla artıq gömrük alınırdı. Dövlət xəzinəsinə axan gəlirin müəyyən hissəsini boyaqçılıqdan alınan vergi təşkil edirdi. Burada boyaqçılıqdan vergi alınması hüququ da icarəyə verilirdi. Bundan sonra heç kəsin icarədarın icazəsi olmadan və ona müəyyən məbləğ vermədən hər hansı əşyanı boyatmağa ixtiyari yox idi.

Çörək və dənli bitkilər satmaq hüququ da 50 min tümən həcmində icarəyə verilirdi. Bu hüququ almış şəxs-icarıdar satılan hər batman buğda, arpa, darı üçün gümüş pulla 2 qəpik, düyüyə görə isə 4 qəpik gömrük alırdı.

Sabun satışından gömrük toplamaq hüququnu almış icarədar xəzinəyə hər il 60 tümən verməli idi. O, xanlıqda sabunun bişirilməsi və satılması üzərində nəzarət edir və haqqını alırdı. İrəvan xanlığında icarədarın icazəsi olmadan heç kəs sabunu nə bişirə, nə də sata bilərdilər. Başqa xanlıqdan sabun istehsal edənlər öz mallarını yalnız icarədara sata bilərdilər. İcarədar isə həmin sabunu istədiyi qiymətə satırdı.

Tütün satışından gömrük toplamaq hüququ da ildə 15 min tümənən icarəyə verilirdi. Şəhərdə yalnız icarədarın tütün satmağa ixtiyarı var idi. Xanlıqdan kənara tütün aparmaq qadağan edilmirdi və bunun üçün də vergi-gömrük alınmırdı.

Bazarlarda pul, çəki, ölçü vahidlərinin müxtəlifliyi ticarətin normal aparılmasında ciddi çətinliklər törədirdi. İrəvan bazarında İranda, Türkiyədə, Rusiyada və Gürcüstanda, habelə Şuşada, Xoyda, Təbrizdə və b. şəhərlərdə zərb olunmuş pulların dəyəri də bir-birindən fərqlənirdi. Xüsusilə, yerli pul vahidlərinin sabit olmaması ticarətin gedişinin çətinləşdirirdi.

Siyasi hadisələr, habelə yaranmış şəraitlə əlaqədar olaraq xanlar özlərinin pul vahidlərinin dəyərini dəyişməyə məcbur olurdular. Belə hallarda bazarlarda pul dövriyyəsinin ləngidirdi.

Azərbaycanın başqa şəhərlərindən olaraq İrəvanda pul zərb edilmirdi. Ona görə də xanlıqlar dövriyyədə əsasən, İran və

Azərbaycan pul vahidləri işlədilirdi: “tümən”, “yarım tümən”, “sahibqran”, “pənahabadi”, “yarım pənahabadi”, “şahi”, “yarım şahi”, “para”, “mahmudiyyə”, “səksənlik”, “yüzlik” və s.

Tədqiq olunan dövrdə İranda olduğu kimi, Azərbaycanda da “hər vilayətin özünəməxsus ölçü və çəki vahidləri var idi”[1]. Bu sistem şəhər və kəndlərdə elə dərin kök salmışdı ki, hətta Azərbaycan Rusiya tərəfindən işğal edildikdən sonrakı dövrdə də müəyyən müddət bu cür ölçü və çəki vahidləri qüvvədə qalmışdı. Yalnız xeyli vaxt keçdikdən sonra yeni pul sistemi, ölçü və çəki vahidlərinin nizama salınması barədə çar məmurları tərəfindən müəyyən tədbirlər görülrdü.

Xanlıqlar dövründə nəinki ayrı-ayrı, hətta bir xanlığın öz daxilində ölçü və çəki vahidləri fərqlənirdi. Odur ki, alqı-satqı zamanı bəzən ciddi mübahisələr baş verirdi. Hər kəz çalışırdı ki, malı alıb-satarkən öz çəki və ölçü vahidindən istifadə etsin.

---

[1]Д.Томара. Экономическое положение Ирана. СПб., 1895, стр. 114.

# İRƏVAN XANLIĞININ SİYASİ TARİXİ

XVIII əsrin 20-ci illərinin əvvəlində Kartli- Kaxetiya çarlığının öz himayəsi altına götürən və Şimali Qafqazda inquşların şəhəri olan Dzaudjikaunu zəbt edib adını dəyişdirərək "Vladikavkaz" qoyan Rus dövləti, bu bölgəni tamamilə ələ keçirmək niyyətində olduğunu bildirdikdə, buraya yurdsuz – yuvasız köçən ermənilərin sayı xeyli çoxaldı.

XVIII əsrin 80 –ci illərində Cənubi Qafqazda köməyi ilə burada "Ermənistan" dövləti yaratmaq üçün dəridən – qabıqdan çıxdılar. Heç də təsadüfi deyildir ki, İrəvanda eyni adlı xanlığın tarixinə həsr olunmuş yeganə tədqiqat əsəri də XVIII əsrin 80-ci illərini əhatə edir. Bu əsər V.R.Qriqoryanın "XVIII əsrin sonlarında (1780-1800) İrəvan xanlığı" namizədlik dissertasiyasıdır.

Dissertasiyanın avtoreferatı ilə tanışlıq göstərir ki, müəllif xanlığın əmələ gəlməsinin ilk çağları haqqında bir kəlmə də yazmamışdır. Dissertasiyanın ikinci fəslində qeyd edilir ki, İran hakimiyyətinə tabe olan Şərqi Ermənistan – Çuxursəd vilayətində hakimiyyət (sonradan İrəvan xanlığı) XVIII əsrin ortalarında İranda baş vermiş hərc – mərclik üzündən bir neçə dəfə əldən - ələ keçmiş, sonradan xərac verməklə Gürcüstan çarlığından asılı vəziyyətə düşmüşdü (1795). Ermənistanın görkəmli tarixçilərindən hesab olunan A.R.İoannisyan bu fikri daha da "elmiləşdirərək" yazmışdır ki, Gürcüstanın valisi sayılan II İrakli XVIII əsrin 60-70-ci illərində Gəncə xanlığı ilə birlikdə İrəvan xanlığını da bac verməyə məcbur etmişdir.

Müasir rus tarixçisi O.P.Markova, İranda Nadir şahın ölümündən sonra onun dövlətinin dağıldığı zaman Cənubi Qafqazda baş verən hadisələri – müstəqil xanlıqların yaranmasının qeyd etmək əvəzinə yazır: "Nadir şahın öldürülməsindən sonra başlanan dövr Şərqi Zaqafqaziyada Şimali, Cənubi Azərbaycan və Şərqi Gürcüstan hakimiyyətini ələ almaq uğrunda aparılan mübarizə ilə

əlamətdardır.1759-cu ildə zəngin ticarət mərkəzləri olan İrəvan və Gəncə II İrakliyə bac verməyə məcbur olmuşdur.Bu o demək idi ki, 1759-cu ildə İrəvan xanlığı Gəncə xanlığı ilə birlikdə uzun – uzadı mübarizədən sonra Kartli –Kaxetiya xanlığından asılı vəziyyətə düşmüşdür.Halbuki 1759-cu ilə kimi həmin bölgədə müxtəlif xarakterli feodal ara müharibələri baş vermiş, İrəvan və Gəncə xanlıqlarının Kartli- Kaxetiya çarlığının bac vermələri faktı da müvəqqəti xarakter daşımışdır".

İlk öncə onu qeyd etməliyik ki, XVIII əsrin ortalarında, Azərbaycan torpağında yaranan xanlıqların bir çoxunun, o cümlədən İrəvan xanlığının əsası hələ Nadir şahın hakimiyyəti dövründə qoyulmuşdur. Bunu nadir mənbələrdən biri olan "Car müharibələrinin salnaməsi" əsərindən müəyyən etmək olar. Salnamədə yazılmışdı ki,1747-ci ilin əvvəllərində Nadir şah ona tabe olan ölkələrdən aldığı xəracın miqdarını o qədər artırmışdı ki, yerli feodallar ondan üz döndərib silaha əl atmalı olmuşdular. Nəticədə bir çox şəhər, o cümlədən İrəvan İranın tabeliyindən çıxmışdı.

Adı çəkilən mənbələrdə yazılanlar 1747 –ci ildə tərtib olunmuş rus arxiv sənədlərində də təsdiq olunur. 1747-ci il martın 15-də Azərbaycanda olmuş rus dövlətinin nümayəndəsi M.M.Qolitsin mərkəzə göndərdiyi məlumatında yazmışdır: "...hazırda İranın bir çox vilayətlərində təhlükəli vəziyyət yaranıb, hər yerdə çaxnaşmalar baş vermişdir, bir çox şəhərlərdə - Gəncədə, İrəvanda, Naxçıvanda və Tiflisdə ağır vergilərin üzündən nəinki kiçikdən – böyüyə qədər əhali, hətta şəhər hakimləri də üsyan etmişlər, bir çoxları var-dövlətləri və mal-qaraları ilə dağlara çəkilmişdir" [1] . Bu dövürdə Nadir şahın zülmünə qarşı Şəkidə, Şirvanda, xüsusiilə Yeni Şamaxı, Təbrizdə də üsyanlar baş vermişdir. İrəvan üsyanı belə üsyanlardan biri idi[2]. 1747-ci ilin mayında Nadir şahın X orasanda öldürüldükdən sonra İrəvanda üsyana rəhbərlik edən yerli feodal Mir Mehdi xan İranda baş verən hərc-mərclikdən istifadə edərək sabiq Çuxursəd bəylərbəyiliyinin böyük bir hissəsində

[1] RXSA, siyahı 77\ 1, 111-ci sənəd (1747), vər. 77a.

[2] Mirzə Camal Cavanşir.Qarabağ tarixi. Bakı, 1959, səh. 126.

müstəqil xanlıq yaratmaqla yanaşı, daha çox torpaq əldə etmək məqsədi ilə qonşuluqda yaranan xanlıqların ərazisinə də göz dikkdi. Bu məqsədlə o, 1748-ci ilin əvvəllərində Urmiya xanlığına basqın etdi[1]. Bu yürüş zamanı Urmiya xanlığının hakimi Fətəli xan Əfşar Mir Mehdi xana ərazisinin bir hissəsini güzəşdə getməyə məcbur oldu.

Lakin çox keçmədi ki, İrəvan xanlığın özünə təcavüz edildi. 1749-cu ildə qarabağlı Pənah Əli xan, gəncəli Şahverdi xan, şəkili Hacı Çələbi xan, şamaxılı Hacı Məhəmməd Əli xan və başqaları birlikdə Gürcüstana yürüş etməyi qərara aldılar. Lakin yürüşə başlamazdan əvvəl Pənah Əli xan daha çox qənimət əldə etmək məqsədi ilə 4000 qoşunla İrəvan xanlığına basqın etdi. Qarabağ qoşunları əsasən, "Üç kilsə" monastırının ətrafındakı kəndləri qarət edərək bir çox əsir və qənimətlə geri döndülər. İrəvan ermələri bu barədə tezliklə II İrakliyə xəbər verərək kömək istədilər. Gürcü şahzadəsi vaxt itirmədən Pənah Əli xanın qoşunlarını təqib edərək əsirlərin və qənimətlərin geri qaytarılmasına nail oldu. Bu hadisədən sonra İrəvan xanlığında çaxnaşma baş verdi. Çox güman ki, bu, Mir Mehdi xan gürcülərlə əlaqə saxlayan, erməni feodallarla divan tutduğundan baş vermişdir. 1749-cu il avqustun 12-də ermənilər yenidən Teymurazla II İrakliyə müraciət edib gürcüləri İrəvana dəvət etmiş, onlara tabe olacaqlarını və hərəyə 5 manat dəxi verəcəklərini vəd etmişdilər. Sonradna həmin məbləğ 40 manata qaldırıldı. Rus tarixçisi P. Q. Butkov yazır ki, ermənilər həmişə bir xiristiyan kimi II İrakliyə ümüd bəsləyirdilər. 1749-cu il sentyabrın 29-da Gürcüstandan gələn qoşunların İrəvan xanlığının bir kəndini zəbt etməsiylə xanlıqda bir növ sabitlik yarandı. Xan müharibənin baş verəcəyindən ehtiyat edərək erməni feodallarının təqibi siyasətini dayandırdı. Beləliklə də, Gürcüstandan gələn qoşunlar geri döndülər. Lakin bu vəziyyət çox davam etmədi.Mir Mehdi xanın zəiflik göstərməsindən istifadə edən ata və oğul- Teymuraz və II İrakli 1751-ci il sentyabrın 19-da İrəvan xanlığına basqın edərək, qələbə

---

[1] H.Ə.Dəlili. Azərbaycanın cənub xanlıqları.Bakı, 1979, səh. 111.

çalmış, oradan isə Təbrizə qədər getmişdi.

Gürcüstana qayıtdıqdan sonra Teymuraz bütün Cənubi Qafqazda yerli feodalları özünə tabe etmək fikrinə düşdü. Lakin o, Şimali Azərbaycanda günü – gündən qüvvətlənən şəkili Hacı Çələbi xandan ehtiyat edirdi. Gürcü feodalları kimi, bir sıra Azərbaycan xanları da Şəki xanının qüvvətlənməsi ilə razılaşa bilmirdilər.Bundan istifadə edən Teymurazla II İrakli həmin xanları öz tərəflərinə çəkməyi qərara aldılar.Beləliklə, təqribən 1751-ci ildə II İrakli İrəvan və Gəncə xanları, habelə onun tabeliyində olan Borçalı, Şəmşədil və Qazax məlikləri ilə birlikdə 6000 qoşunla Şəki xanlığına basqın etdi.Toqquşma zamanı Hacı Çələbi xanın döyüşçüləri birləşmiş qoşunların üzərində qələbə çaldılar[1].Bu hadisədən sonra azərbaycanlı hakim feodallar II İraklidən üz çevirdilər[2]. Gürcü çarları bundan təşvişə düşərək, yeni hiylələrə əl atmaq barədə fikirləşərkən yeni bir təhlükə ilə qarşılaşmalı oldular.

Məsələ burasındadır ki, İranda iki il hakimiyyət başında olan İbrahim şah öldürüldükdən sonra ölkədə yeni hərc-mərclik başladı.

Bundan istifadə edən Nadir şahın sabiq sərkərdəsi, əfqanlılardan təşkil edilmiş hərbi qüvvələrin başçısı Azad xan, öz qoşunları ilə Cənubi Azərbaycanda müvəqqəti də olsa bir sıra xalqları özünə tabe edib Təbriz şəhərini özünə iqamətgah seçdi[3].

Vaxtilə İrəvan xanı Mir Mehdi xana məğlub olmuş Fətəli xan Əfşar intiqam almaq məqsədi ilə özündən nisbətən qüvvətli olan Azad xanın hərbi gücündən istifadə etməyi qərara aldı. Hər iki hakim feodal arasında aparılan danışıqlar nəticəsində birləşmiş qoşunlar İrəvan xanlığı istiqamətində hərəkət etdilər. İlkin yürüşdə əfqanlı

---

[1]"Sank- Peterburq xəbərləri".Bax: П. Г. Бутков. Материалы для новой истории Кавказа с 1722 по 1802 гг. СПб., 1869, прил. "Н", стр. 390.
[2]Yenə orada.
[3]P.Q.Butkov. Göstərilən əsəri, səh. 238.

qoşunlarını Fətəli xanın sərkərdələrindən biri müşayiət edirdi. Həmin yürüşdə Azad xanın məqsədi hərbi qənimət əldə etməkdən, Fətəli xanın məqsədi isə irəvanlılardan intiqam almaqdan ibarət idi.

Cənubdan yaxınlaşan təhlükənin qarşısını almaq üçün Mir Mehdi xan İrəvan qalasının müdafiə qabiliyyətini möhkəmləndirdi. İrəvanda yaşayan ermənilərin əllərinə girəvə düşdü. Onlar xanlıqda hakim mövqe tutmaq məqsədi ilə Kartli və Kaxetiya çarlıqlarına-Teymuraza və II İrakliyə müraciyyət edərək onları İrəvana dəvət etdilər ki, yaxınlaşan təhlükəni sovuşdurub,"xristianların" vasitəsilə hakimiyyəti ələ alsınlar. İrəvan ermənilərinin müraciəti gürcü çarlarının ürəyindən oldu. Odur ki, tezliklə gürcü qoşunları II İraklinin başçılığı altında İrəvan xanlığı istiqamətində hərəkət etdilər. Artıq bu zaman əfqan və əfşar qoşunları İrəvan qalasını mühasirəyə almışdılar. Lakin Gürcüstandan gələn döyüşçülər sayca çox olduqları üçün cənubdan gələn qoşunlar İrəvan qalasının mühasirəsini tərk edib geri dönməyə başladılar. Mənbələrin verdiyi məlumata görə "gürcü" qoşunlarının əksəriyyətini Qax və Borçalı mahallarından səfərbər edilmiş azərbaycanlılar təşkil edirdilər[1]. Gürcü qoşunlarının avanqardını irəli göndərən II İrakli Qırxbulaq yüksəkliyində dayanaraq rəqim qoşunlarının toqquşmasının nəticəsini müşahidə edirdi.

Gürcü tarixçisi Keronti Kikodzenin yazdığına görə Gürcüstandan gələn döyüşçülər əfqan- əfşar qoşunlarını İrəvan ətrafından qovaraq, hətta İrəvan qalasına da daxil olmuşdular.

---

[1]T.M.Musəvi. Orta əsr Azərbaycan tarixinə dair farsdilli sənədlər. Bakı, 1977, səh. 200. Yeri gəlmişkən qeyd etməliyik ki, 1736 –ci ildə Muğan qurultayında tacqoyma mərasimində Gəncə feodalları şah olmaq üçün Nadir Qulu xanın namizədliyinin əleyhinə çıxmışdılar. Həmin qurultayda gürcü və erməni feodalları əksinə, gələcək şahın namizədliyini dəstəkləmişdilər. Nadir Qulu xan şah seçildikdən sonra Gəncənin feodallarına cəza vermək üçün onları hakimiyyətdən uzaqlaşdırmış, bir sıra Azərbaycan torpaqlarının, o cümlədən Qazax və Borçalının idarəsini Kaxetiya çarı I Teymuraza həvalə etmişdir.O ermənilərə "azadlıq" bəxş etmiş, onları Azərbaycan tabeliyindən azad etmişdi.

İraklinin əmrilə İralisə göndərmişdilər[1]. Məğlubiyyətdən xəbər tutan Azad xan çoxsaylı qoşunla İrəvan tərəfə hərəkət etmişdi. Çox güman ki, II İrakli daha artıq hərbi qüvvələrlə gələn Azad xanla döyüş meydanında toqquşmaqdan ehtiyat edib İrəvan qalasından uzaqlaşmışdı.Azad xan asanlıqla İrəvan qalasına daxil olmuş, Mir Mehdi xanı Həsən xanla əvəz etmişdi. İrəvanda bir qədər istirahət etdikdən sonra Azad xan qoşunları ilə II İraklinin düşərgəsi istiqamətində irəliləmişdi. Lakin rəqib qoşunları arasında döyüş çox davam etmədi, II İrakli saziş bağlamağı təklif etdi. Danışıqlar zamanı şərtləri çox güman ki, Azad xan diktə etmişdi. Çünki görüşdən sonra rəqiblər ayrılarkən Azad xan 200 gürcü döyüşçüsünü, habelə iki nüfuzlu knyazı-Zal bəyi və Aslan bəyi də özü ilə girov kimi aparmışdır[2]. Elə məlumat da vardır ki, girovların arasında II İraklinin bacısı da var imiş[3]. İrəvan yürüşündən sonra Azad xan təxminən bir il İrəvanda qalmışdı. İrana yola düşərkən sərkərdələrdən biri olan Xəlil xan Özbəyi müəyyən qədər döyüşçü ilə İrəvanda qoyub hakimiyyəti ona tapşırmışdır. Erməni mənbəyi olan "Cambrda" yazılmışdır ki, 1750, 1751, 1752, 1753, 1754-cü illərdə "Eçmiədzin" katolikoslarından Minas və Aleksandr Azad xandan və onun nümayəndəsi Xəlil xandan mülklərinin maaf olduğu haqqında rəqam almışlar[4]. Müasir rus tarixçisi O. P. Markova əfqan-əfşar qoşunları ilə müharibədə Azad xanın məğlub olduğunu və onun II İrakliyə əsir düşdüyü barədə məlumat verir. Onun yazdığına görə Gürcüstanla İran arasında münasibətlər düzəldikdən sonra II İrakli Azad xanı İran hökmdarı vəkil Kərim xana təhvil vermişdir (1763)[5].

---

[1]K. Kikodze. II İraklinin apardığı müharibələr. Tbilisi, 1943, səh. 36 (gürcü dilində).
[2]P.Q.Butkov. Göstərilən əsəri, səh. 239.
[3]H.Ə.Dəlili. Göstərilən əsəri, səh. 132.
[4]S.Yerevantsi. Göstərilən əsəri, səh. 207.
[5]О.П.Маркова. Россия Закавказье и международные отнощение в XVIII в. М., 1966 стр. 132.

Gürcü tarixçisi Kerenti Kikodze isə tarixi həqiqəti daha artıq bayağılaşdırmışdır. O yazır ki, Azad xanın qoşunları üzərində qələbə çalan II İrakli 12 top, 200 falkonet, 200 at və dəvə, habelə 2500 çadır ələ keçirmişdir[1].Keronti Kikodzenin belə fikir söyləməklə heç bir mənbə və ədəbiyyata istinad etməməsi bizə onun gətirdiyi "dəlilləri" etibarsız saymağa əsas verir.

Əslində İrəvandan qayıdan Azad xan İranda hakimiyyət uğrunda mübarizə aparan Kərim xan Zənd ilə yaxınlaşmaq təşəbbüsündə olmuşdur. Yeri gəlmişkən onu da qeyd edək ki, müəyyən müddətdən sonra İranda hakimiyyəti ələ alan Kərim xan Zənd şah titulundan imtina edərək özünü vəkil elan etmişdi. Bu da səbəbsiz deyildi. Həmin dövrdə qondarma halında olsa da İranda III İsmail adı ilə Səfəvi sülaləsinin nümayəndəsi Mirzə Abu Təbəri şah elan edilmişdi. Özünü şah elan etməsə də Kərim xan Zənd tacqoyma fikrindən yayınmamışdı. Bu barədə Rusiyanın İrandakı konsulu M.Sulyakovun mərkəzə göndərdiyi məlumatında belə yazılmışdır: "Üzümüzə gələn yay ayında Kərim xan Muğan çölündə tacqoyma mərasimi keçirib İran taxtında oturmaq fikrindədir"[2]. Lakin çox güman ki, şiələrdən ehtiyat etdiyinə görə Kərim xan ömrünün axırına kimi "vəkil" titulu ilə məhdudlaşıb, özünü şah elan edə bilməmişdir.Kərim xan Zənd Azad xanı nəinki dövlət işlərinə yaxın belə buraxmamış, hətta onun üçün elə şərait yaratmışdı ki, o İranı büsbütün tərk etmək fikrinə düşsün. Məhz buna görə də Azad xan bir qədər bundan əvvəl saziş bağladığı və girovlarını saxladığı II İraklinin yanına pənah gətirməli olmuşdur. Girovları geri aldıqdan sonra, II İrakli Kərim xanla münasibətlərini yaxşılaşdırmaq məqsədi ilə Azad xanı qəbul etməyib, yenidən İrana getməyə məcbur

---

[1]K.Kikodze. Göstərilən əsəri, səh. 37.
[2]RXSA, f. (1763-1767), iş 13, vər.68.

etmişdir.

Azad xan İranda öz əcəli ilə vəfat etmişdir.

Azad xan Azərbaycandan getdiyi zaman burada bir sıra mühüm hadisələr baş vermişdir. Azad xanın Azərbaycandan uzaqlaşmasından hər kəsdən əvvəl II İrakli istifadə etdi. O, bir qədər əvvəl məğlub olduğu Hacı Çələbi xandan intiqam almağı qərarlaşdırdı.II İrakli yaxşı bilirdi ki, həmin vaxt şəkili Hacı Çələbi xanın günü-gündən qüvvətlənməsi Azərbaycanın şimalında yerləşən bir sıra xanlıqları da narahat edirdi. Bundan istifadə edən ikinci İrakli yeni bir hiyləyə əl atdı. O öz məqsədinə çatmaq üçün ilk növbədə böyük qüvvəyə malik olan qaradağlı Pənah Əli xanı inandırdı ki, şəkili Hacı Çələbi xanın əl-qolunu yığışdırmasaq, hamımızın axrına çıxacaq. II İraklinin əsil məqsədi Hacı Çələbidən intiqam almaqla yanaşı, Azərbaycan xanlarını özünə tabe etmək və ərazisini genişləndirməkdən ibarət idi. O həmişə Rusiyaya müraciət etdikdə deyərdi: "Siz Azərbaycanı tutsanız, bizədə müəyyən ərazi verəcəyinizə əminəm". Azərbaycanın xanları II İraklinin "səmimiyyətinə" inanıb onun təklifi və tərtib etdiyi plan əsasında hərəkət etdilər. V. N. Leviatovun yazdığına görə II İraklinin təklifi ilə yaranmış ittifaqa Şahverdi xan, qarabağlı Qasım xan, irəvanlı Hüseyn Əli xan, naxçıvanlı Heydər Qulu xan və nəhayət, qarabağlı Pənah Əli xan daxil idilər[1]. Tarixi ədəbiyyatdan məlumdur ki, II İraklinin fırıldağı ugursuzluqla nəticələndi və gürcü şahzadəsinin məkrli niyyətinə uyan Azərbaycan xanları kor-peşman öz evlərinə döndülər. Geri qayıdan xanların arasında İrəvan xanı da var idi.

II İrakli ilə Azərbaycan xanlarının arasında baş verən hadisəyə inanmamağa heç bir əsasımız yoxdur. Bunu gürcü

---

[1] В. Н. Левиатов. Очерки из истории Азербаиджана в XVIII в. Баку 1942. стр. 122-123.

mənbələrində də təsdiq edirlər[1]. Lakin İrəvan xanlığının hakimi kimi bu əməliyyatda kimi iştirak etməsi bir qədər mübahisəlidir. Məsələ berasındadır ki, V. N. Leviatovun yazdığına görə bu yürüşdə irəvanlı Hüseyn Əli xanın iştirak etməsi qeyd olunur. Bu hadisə isə 1753-cü ildə baş vermişdir. Həmin vaxt Hüseyn Əli xan İrəvanda hakimiyyət başında deyildi. İrəvan xanlığının taxtında Hüseyn əli xan yalnız 1759-cu ildə oturmuşdur. O, İrəvan xanlığını 1755-ci ildən idarə edən qardaşı Həsən Əli xanın varisi olmuşdur[2].

Beləliklə, V. N. Leviatovun Hüseyn Əli xanın ünvanına yazdıqlarını şübhə altına almağa əsasımız var. Bu sözləri yazmaqla biz heç də Hacı Çələbi xanın üzərinə edilən yürüşdən İrəvan xanının iştirakını təkzib etmək fikrində deyilik. 1753-cü il noyabrın 23-də Sankt-Peterburqda çıxan qəzetdə də ("Sankt-Peterburqskie vedomosti") bu barədə məlumat vardır. Lakin müəllif İrəvan xanını adını yazmır. Qəzetdə dərc olunmuş məqalədə sadəcə olaraq belə yazılmışdır: "İran vilayətinin beş xanı, o cümlədən Qazaxın xanı, Borçalının xanı, Şəmşədilin xanı, İrəvanın xanı və Gəncənin xanı gürcü çarı ilə birləşib öz qoşunları ilə şəkili Hacı Çələbinin üzərinə yürüş etmişlər. Döyüş zamanı İraklinin 6000 qoşunu həlak olmuş və əsr alınmışdır. Keçən il də çar İrakli 6000 qoşunla Hacı Çələbi xanın üzərinə hücüm etmiş, yenə də qoşunlarını itirmiş və az saylı döyüşçü ilə geri dönmüşdür, hazırda adı çəkilən xanlar-İrəvan, Gəncə, Qazax, Şəmşədil və Borçalı xanları II İraklidən üz çevirib Hacı Çələbi ilə birləşdilər".

Beləliklə, elə qənaətə gəlmək olar ki, 1752-ci ildə baş vermiş bu hadisədə nə Hüseyn Əli xan və nə də Həsən Əli xanın iştiraki ilə olmamışdır. Çox güman ki, II İraklinin tərtib etdiyi Şəki yürüşündə

---

[1] S. Yerevantsi. Göstərilən əsəri, səh. 306.
[2] Yenə orada, səh. 207.

İrəvanda Azad xan tərəfindən taxda oturdulmuş Xəlil xan Özbək iştirak etmişdir. Lakin Xəlil xan Özbək İrəvanda hakimiyyət başında çox qala bilmədi. 1755-ci uldə yerli feodallarda Həsən Əli xan Qacar, Xəlil xan Özbəyi müdafiə edən Azad xanın İranda Kərim xan Zəndin yanında heç bir nifuz sahibi olmamasından istifadə edib, İrəvanda saray çevirilişi edərək, İrəvan xanlığında hakimiyyəti ələ aldı. Bundan əvvəl Azad xan və Xəlil xan Özbəyə itaət edən "Üç kilsə" monastırının başçısı Aleksandr bu dəfə yeni xana tabe olub, ona yazılı surətdə xahişlə müraciət edərək bildirdi ki, Azad xan başqa monastırlardan vergi aldığı halda "Üç kilsə"ni həmişə vergi verməkdən azad etmişdir. Xahiş edirik ki, bizədə belə səlahiyyət verəsən. Həsən Əli xan "Üç kilsə " monastırının xəlifəsi Aleksandrın xahişinə əməl etmiş və monastırı hər cür vergidən azad etmişdir. Həsən Əli xanın bu barədə verdiyi fərmanına divanbəyləri, şeyx-ül-islam və digər müsəlman zadəganları öz möhürlərini vurmuşlar. Bu da təsadüfi deyildi. Məsələ burasındadır ki, Çuxursəd torpağında İrəvan xanlığı yaranar-yaranmaz özlərini çar adlandıran gürcü knyazlarından Kaxetiya hakimi II Teymuraz və onun oğlu Katli hakimi II İrakli bu xanlığı zəbt etməyə çalışmışlar. Bu məqsədlə də onlar İrəvan xanlığının tərkibində olan və İrəvan xanına itaət edən "Üç kilsə" monasdırının xəlifəsi-katolikosu ilə əlaqə saxlayır, İrəvan xanlarına onun əli ilə zərbə endirməyə çalışırdılar. Çox güman ki, bunu nəzərə alan İrəvan xanları, "Üç kilsə" xəlifələrinə güzəşdə gedirmişlər. İrəvan xanlarından Hüseyn Əli xan 1763-cü ildə "Üç kilsə" xəlifəsi Akop Şemaxensinin təklifi ilə İrəvan xanlığındakı torpaqsız kəndliləri də zorla "Üç kilsə" monastırının torpaq sahələrinə köçürmüş və sözləşmişlər ki, əldə edilən məhsulu öz aralarında bölüşdürsünlər[1]. "Üç kilsə" monastırı təkcə erməni-

[1] С.Ереванци. Göstərilən əsəri, səh 43

Qriqoryan kilsəsinin başçısı deyildi. Böyük maliyyə əməliyyatı aparan bu monastırın geniş torpaq sahələri və kəndləri də vardı. Lakin buna baxmayaraq, İrəvan xanlığında yaşayan erməni feodalları, başda katolikos olmaqla, azərbaycanlılardan ibarət hakim feodallara tabe idilər. Maraqlı burasındadır ki, katolikosu da bilavasitə İrəvan xanı təyin və təsdiq edirdi. Lakin belə tabelik zahiri xarakter daşıyırdı. Erməni katolikosları qəlbən Rus dövlətinə rəğbət bəsləmiş və ondan həmişə imdad istəmişlər. XVIII əsrin 60-cı illərində "Üç kilsə" monastırının başçıları kömək almaq məqsədi ilə bir neçə dəfə II Yekaterina hökümətinə müraciət etmişlər. 1768-ci ildə II Yekaterina həmin vaxt "Üç kilsə" monastırının xəlifəsi (katolikosu) Simona məktub göndərərək bildirmişdir ki, o həmişə "Üç kilsə" monastırını, onun xəlifəsinin varislərini müdafiə edəcəkdir[1]. Rusiya ilə yaxınlıq etdiklərindən xəbər tutan İrəvan xanı "Üç kilsə" xəlifələri ilə münasibətini daha da yaxşılaşdırmağa çalışdı. 1765-ci və 1769-cu illərdə Hüseyn Əli xanın "Üç kilsə" xəlifəsi ilə xoş münasibəti öz bəhrəsini verdi. Həmin illərdə II İrakli iki dəfə İrəvan xanlığına yürüşə hazırlaşmışdı. Lakin hər dəfə düşmənin yaxınlaşdığını eşidən Hüseyn Əli xan ətraf kəndlərin əhalisini İrəvan qalasına toplamış, qalanın ətrafındakı xəndəyi dərinləşdirmiş və su ilə doldurmuşdur. Müdafiəyə hazır olmasına baxmayaraq əbəs yerə qan tökülməsin deyə, o, "Üç kilsə" monastırı ilə II İrakli arasında olan dostluq münasibətindən istifadə edərək xəlifədən-katolikosdan xahiş etmişdir ki, II İrakli ilə görüşüb onu işğalçılıq fikrindən yayındırsın. Xəlifə Hüseyn Əli xanın ona etdiyi yaxşılıqları nəzərə alıb II İraklini yürüş zamanı qarşılamış, onu "Üç

[1] А. Р. Ионнисян. Россия и армянское освободительное движение в 80 –х годах XVIII столетия, Ереван, 1947, стр. 15.

kilsə" monastırına dəvət etmiş və ibadət zamanı ondan geri dönməyi xahiş etmişdir. II İrakli xalifənin sözünə qulaq asıb geri dönmüşdür[1]. Lakin II İrakli boş-boşuna geri dönməmişdir. O yalnız öz xeyrinə olaraq Hüseyn Əli xanla müqavilə bağladıqdan sonra Tiflisə qayıtmışdır. Çox güman ki, Hüseyn Əli xanın hər il II İraklinin xəzinəsinə göndərdiyi bac da bununla əlaqədardır[2]. II İraklinin belə hərəkəti və Hüseyn Əli xanın ona bac verməsi heç də Kərim xan Zəndin xarici siyasətinə uyğun gəlmirdi.II İraklinin qüvvətlənməsini arzulamayan Kərim xan Zənd Hüseyn Əli xandan tələb etdi ki, o II İrakliyə nəinki bac verməsin, hətta lazım gəldikdə ona müqavimət də göstərsin. Müasirlərin dediklərinə görə, İrəvan uğrunda Kərim xan Zənd ilə II İraklinin toqquşmaları təhlükəsi də gözlənirdi[3].Şübhəsiz, II İrakli Kərim xanla döyüş meydanında görüşməyə cəsarət edə bilməzdi. Odur ki, Hüseyn Əli xan Kərim xana arxalanaraq II İrakliyə bac verməkdən imtina etdi. Lakin Kərim xan Zənd vəfat etdikdən sonra (1779) bütün bölgədə vəziyyət bir qədər dəyişdi. İranda hakimiyyət uğrunda mübarizə getdiyi zaman, Azərbaycanda da feodal ara müharibələri yeni qüvvə ilə kəskinləşdi. Həmin dövrə aid olan arvix sənədlərinin birində deyilirdi: "Azərbaycanda Təbriz, Xoy və Urmiyə xanlıqları arasında müharibələr davam etməkdədir"[4]. Başqa bir arxiv sənədində də bu barədə məlumat vardır: "-Azərbaycanın (feodal) hakimləri bir- birinə ziyan verməkdən çəkinmirdilər.Zərrə qədər xeyir üçün aralarındakı müqavilələri

---

[1] А. Р. Йоннисян . Россия и армянского ае освободительное движение в 80 –х годах XVIII столетия, Ереван, 1947, стр. 111.
[2] O. P. Markova. Göstərilən əsəri, səh. 129
[3] RXSA. İranın Rusiya ilə əlaqələri fondu, 111-ci sənəd, var. 70
[4] Центральный Государственный Военно Историчечский Архив (sonradan Mərkəzi Dövlət hərbi Tarix Arxivi- MDHTA), 52-ci fond, 331-ci siyahı, 1-ci sənəd, vər.25.

pozur, bir-biri ilə birləşərək üçüncünü qarət edirlər”[1].

Göründüyü kimi, Azərbaycanda xanlıqları zəiflədən feodal ara müharibələrinin ardı-arası kəsilmirdi. Bundan istifadə edən II İrakli yenidən İrəvan xanlığından bac tələb etdi. Lakin bir sıra Azərbaycan xanlıqlarına güvənən irəvanlı Hüseyn Əli xan Kartli-Kaxetiya çarının tələbini rədd etdi. Bunu görən II İrakli iyirmi minlik ordu ilə qəflətən İrəvan qalasına hücum edib şəhərə soxulmağa can atdı. Hüseyn Əli xan ciddi müqavimət göstərdiyindən, II İrakli xanlığın bir çox kəndlərini qarət edib, böyük qənimətlə geri dönərkən İrəvan xanlığından Gürcüstana “1600 xristian və 700 müsəlman” ailəsini də Hüseyn Əli xanın vermədiyi bac əvəzinə apardı. Düşmən qüvvələri İrəvandan uzaqlaşdıqdan sonra xana çatdırıldı ki, II İraklinin qoşunları İrəvana yaxınlaşdıqları zaman şəhərdə olan bir sıra erməni ailələri “xristianların” İrəvanı almalarını arzulamışlar. Bundan xəbər tutan Hüseyn Əli xan həmin ermənilərə divan tutmağı qərara aldı. Bu dövrdə İrəvan şəhərində baş verən hadisələr haqqında Simonun qardaşı oğlu, “Üç kilsə” monastırının sakini Xubov öz xatirələrində belə yazmışdır: “İrəvan qalasında qalanların (müəllif erməniləri nəzərdə tutur – F.Ə.) aqibəti acınacaqlı olmuşdur. Ölkəyə mənsub olanlardan otuz nəfərini Hüseyn Əli xan ciddi cəzalandırdı. Onların mal-dövləti qarət olundu və bir nəfər ermənini, satqınlıqda günahlandırıb qətlə yetirdi. Patritsi Simon qohumunun ölümünü görüb xeyli qəhərləndi. O, bu bədbəxtlərin günahından keçməyi xahiş etdi. Xan onun xahişinə əməl edib, cəzanı cərimə ilə əvəz etdi. Cərimənin də böyük hissəsini özü verməli oldu[2].

Sonrakı iki ildə İrəvan xanlığında gərginlik azalmadı. Hüseyn Əli xanla II İrakli arasında ədavət davam edirdi. Bunun nəticəsi idi

---

[1] MDHTA, 52-ci fond, 218-ci sıyahı, 25-ci sənəd, vərəq, 61.

[2] P.Q.Butkov Göstərilən əsəri, II cild, səh. 74; M.Ə.İsmayılov, F.M.Əliyev. İrəvan xanlığı // Azərbaycan, 12.06.1991.

ki, İrəvan xanlığına gələn yollar demək olar ki, bağlanmışdı.

Xanın məmurları açıqdan-açığa xanlığa xəyanət edən ermənilərin yaşadıqları kəndləri qarət edirdilər. Bu baxımdan "Üç kilsə" monastırında yerləşən Vaqaşapat kəndinin əhalisinə daha çox cəza verildi ki, II İrakli dübarə hücum etdiyi vaxt ərzaq məhsullarından məhrum olsun. Hüseyn Əli xan Osmanlı Türkiyəsinə arxalanaraq həmçinin II İraklinin İrəvan xanlığından zorla Gürcüstana köçürtdüyü ailələrin geri qaytarılmasını tələb etdi. Məlum olduğu kimi, orta əsrlərdə hər bir kəndli ailəsi feodala vergi verir, onun torpağını becərir və mal-qarasına baxırdı. Odur ki, kəndlinin feodal malikanəsində rolu böyük idi. Ona görə də II İrakli İrəvandan məktub gətirən nümayəndələrə müsbət cavab versə də sözünə əməl etmədi[1]. Bunun əvəzində II İrakli İrəvan xanlığını xarici basqınlardan guya müdafiə edəcəyinə söz verdi. Hüseyn Əli xan da öz növbəsində başqa Azərbaycan xanlıqları ilə yaxınlaşıb II İraklidən heç bir asılılığı olmadığını bildirdi.

Bundan xəbər tutan II İrakli Azərbaycan xanlıqlarından ehtiyat edərək Hüseyn Əli xana olan münasibətini dəyişməyə məcbur olub, hətta xanla ittifaq bağlamağa hazır olduğunu bildirdi.

Həmin dövrdə İrəvan xanlığının qonşuluğunda olan Naxçıvanda hakimiyyət əldən-ələ keçirdi. İrəvanda öz hakimiyyətini bir qədər möhkəmləndirən Hüseyn Əli xan Naxçıvan xanlığının daxili işlərinə də müdaxilə etdi. O zaman Xoylu Əhməd xan Naxçıvanda hakimiyyət başında olan Abbasqulu xandan iki kəndini-Nazik və Şükürlü kəndlərini ona güzəştə getməyi tələb etmişdi. Rədd cavabı aldığı üçün Əhməd xan öz qoşunlarını Naxçıvan xanlığının sərhədlərinə yetirdi. Əhməd xana müqavimət göstərə bilməyəcəyini dərk edən və yerli əyanlar tərəfindən müdafiə olunmayan Abbasqulu

---

[1]MDHTA 52-ci fond, I/ 194-cü siyahı, (1781), 234-cü sənəd, vər. 14.

xan, Naxçıvanı tərk etməyə məcbur oldu və Sisianda özünə sığınacaq tapdı. Lakin Əhməd xan Naxçıvanı tuta bilmədi. Çünki irəvanlı Hüseyn Əli xan hədələyici məktub göndərərək Əhməd xandan tələb etdi ki, o öz ordusunu təcili surətdə Naxçıvan qalasından uzaqlaşdırsın. Həmin xanlığa özü sahib olmaq istədiyini də məktubunda açıqlayırdı[1]. Əhməd xan Hüseyn Əli xanın tələbini qəbul etsədə öz fikrindən əl çəkmədi.

Tezliklə Naxçıvan qalası yaxınlığında İrəvan xanı Hüseyn Əli xanın qoşunu göründü. Lakin Naxçıvanda qalmaq ona da qismət olmadı. Hüseyn Əli xan hansı məqsədləsə burada qalmaq istəməyərək ordusunu Naxçıvandan geri çəkdi[2]. Beləliklə Naxçıvan qalası başçısız qaldı. Bu yaranmış vəziyyətdən istifadə edən Abbasqulu xan Naxçıvana tələsdi.

Hüseyn Əli xanın belə sərbəst xarici siyasət aparması, xüsusilə II İraklinin gözü olduğu Naxçıvan xanlığını özünə tabe etmək cəhdləri, heç də Kartli-Kaxetiya çarlığının başçısını təmin etmədi. O yenə də Hüseyn Əli xanı İrəvanda taxtdan salıb onun əvəzinə üzüyola bir şəxsi xan təyin etməyi qərara aldı. Bundan xəbər tutan Hüseyn Əli xan bir daha "Üç kilsə" xəlifəsinə vasitəçilik etməyi və II İraklini yürüşdən yayındırmağı tapşırdı[3]. Hüseyn Əli xandan daima güzəştlər alan "Üç kilsə" katolikosu Simon Tiflisə gedib II İrakli ilə Hüseyn Əli xan arasında vasitəçilik etdi[4]. Nəticədə, II İrakli ilə Hüseyn Əli xan müqavilə bağlamalı oldular. Hüseyn Əli xan ildə II İrakliyə yenə də 30.000 rubl verməyi öhdəsinə götürdü[5].

---

[1]MDHTA 52-ci fond, I/ 194-cü siyahı, 331 –ci sənəd, I hissə (1738), vər. 42.
[2] Yenə orada.
[3] Yenə orada, 218-ci sənəd (24 may 1780), vər.25.
[4] MDHTA 52-ci fond, 218-ci sənəd (24 may 1780), vər.25.
[5] Yenə orada, vər. 32.

Rus tarixçisi P.Q.Butkovun yazdığına görə II İrakli həmin məbləğin miqdarını 50.000-ə çatdırmağa nail oldu[1]. Lakin Hüseyn Əli xan yenə də verdiyi sözə əməl etmədi, həmin dövrün arxiv sənədlərinin birində yazılmışdır ki, "İrəvan xanlığı Kartli- Kaxetiya çarlığının əleyhinə siyasət apararaq, onun tabeliyindən çıxmağa çalışırdı"[2].

Gürcü qoşunlarının tez –tez İrəvan xanlığını narahat etmələrinə nə Osmanlı Türkiyəsi, nə də ali erməni din xadimləri biganə baxa bilməzdilər.Buna görə də Ahalsixdə yerləşən Türkiyə paşası və erməni patriarxı II İraklini tənbeh etdilər.

Belə bir tarixi şəraitdə Azərbaycan xanlıqlarından, xüsusilə Osmanlı Türkiyəsindən ehtiyat edən II İrakli II Yekaterina hökümətinə müraciət edərək əbədi olaraq Rusiya dövlətinin himayəsinə keçmək arzusunda olduğunu bildirdi. II Yekaterinaya müraciət etməklə, II İrakli eyni zamanda, bir sıra Azərbaycan torpaqlarını, o cümlədən İrəvan xanlığını da Rusiyanın köməyi ilə öz dövlətinə birləşdirmək məqsədini güdürdü. Bunu II İraklinin knyaz İ. Baqration və knyaz Xavçavadze vasitəsilə Rusiyaya göndərdiyi müqavilənin layihəsindən də müəyyən etmək olar.Həmin lahiyədə II İrakli özünü aşağıdakı şəkildə qələmə verirdi: ""'Kartli və Kaxetiya çarı, Samsxesaatabad knyazı, Qazax knyazı, Borçalı knyazı, Şəmşədil knyazı, Kax knyazı, Şəki knyazı, Şirvan knyazı, Gəncə və İrəvan hakimi..."[3]. Sankt – Peterburqa belə məzmunda məktub göndərən II İrakli eyni zamanda Azərbaycan xanlıqlarının bir qisminin qəzəbindən də ehtiyat edirdi. Məhz buna görə də onun Rusiyaya göndərdiyi müqavilə lahiyəsilə bərabər məktubda yazırdı ki, müqavilə imzalandıqdan sonra Gürcüstana rus qoşunları

---

[1] P.Q.Butkov Göstərilən əsəri, II c., səh. 75.

[2] MDHTA 52-ci fond, 218-ci sənəd, vər.25 və 61.

[3]RXSA. Traktatlar fondu, 2 (465a)-ci siyahı, 177-ci sənəd, vər. 4; В.Махарадзе Георгиевский трактат. Тбилиси, 1983, стр. 66.

göndərilərsə, o zaman “müsəlman”, yəni Azərbaycan xanlarına da “xəbərdarlıq” göndərilməlidir ki,onu tənbeh etməsinlər və ona qarşı münasibətlərini dəyişməsinlər[1].

Rusiyanın hakim dairələrində də sanki belə məzmunda məktub gözləyirdilər. Həmin dövrdə İranda Kərim xan Zənd öldükdən sonra (1779) Rusiyanın Şərq ölkələri ilə ticarətinə ağır zərbə vurulmuşdu. Eyni zamanda Rusiyanın Cənubi Qafqazda, xüsusilə Xəzər dənizində hakim mövqe tutmaq cəhdləri də heç bir nəticə verməmişdi. 1782-ci ildə Xəzər dənizinə Rusiya ekspedisiya demək olar ki, geriyə əliboş qayıtmışdı. Bu hadisə Rusiyanın hakim dairələrini o qədər hiddətləndirdi ki, komandanlıq silaha əl atmağı qərara aldı. Elə bu zaman Cənubi Qafqazda erməni dövləti yaratmaq üçün dəridən – qabıqdan çıxan Moskvadakı erməni kilsəsinin başçısı İosif Arqutinski II Yekaterina hökümətində Şərq siyasətilə məşğul olan P.S.Potyomkinə yazdığı lahiyəni təqdim etdi. O, erməni dövləti yaratmaq üçün rus qoşunlarına Cənubi Qafqaza yürüş etmələrini məsləhət bilirdi.

Belə bir tarixi şəraitdə - 1783-ci ildə Georgiyevsk şəhərində Kartli-Kaxetiya və Rusiya arasında himayədarlıq haqqında müqavilə bağlandı. Bundan sonra Rusiyanın hakim dairələri tərəfindən Azərbaycanın bütün xanlıqlarına “xəbərdarlıq” məktubu, həmçinin formal olaraq “hədiyyələr” də göndərilərək, Azərbaycan xanlarına təklif edildi ki, II İraklini belə bir addım atdığına görə tənbeh etməsinlər və onunla dostluq əlaqəsi saxlasınlar. Elə güman etmək olar ki, Rusiyanın hökümət üzvləri düşünürdülər ki, onların bu növ “sülhsevər” siyasəti Azərbaycan xanlıqlarına da sirayət edəcək və onlar da II İrakli kimi addım atacaqlar.

---

[1] MDHTA 52-ci fond, 194-cü siyahı,286-cı sənəd, 11-ci hissə, vər. 117-118; V.Maxaradze. Göstərilən əsəri, səh. 43.

1783-cü il Georgiyevsk traktatına əsasən Kartli-Kaxetiya çarlığının Rusiyanın himayəsinə keçməsi müəyyən dərəcədə Cənubi Qafqazın və Cənubi Azərbaycan xanlıqlarının xarıcı siyasətinə təsir göstərdi. Azərbaycanın ərazisində mövcud olan dövlət qurumlarının-xanlıqların başçılarının əksəriyyəti Rusiyanın müstəmləkəçilik siyasətini ilk öncə dərk etmədən çarizmin vədlərinə inanır və sadəlövhlüklə Rusiyaya ümüd bəsləyirdilər. Diplomatik münasibətlərdə çox ehtiyatlı olan Rusiya hökümətinin Gürcüstanda müqavilə bağladıqdan sonra "müsəlman xanlarına" hədiyyələrlə yanaşı göndərdiyi xəbərdarlıq da öz rolunu oynadı: Rus dövlətinin "xəbərdarlığından" sonra Azərbaycan xanlarının əksəriyyəti Rusiyadan daha çox ehtiyat edərək, Kartli-Kaxetiya çarlığı ilə münasibətlərini nizama salmaqla, Rusiya tərəfindən də öz əmin-amanlıqlarını təmin etməyə çalışırdılar. Bəzi Azərbaycan xanlıqlarından, o cümlədən İrəvan xanlığından Rusiyaya göndərilən cavab məktublarının əsli hazırda Mərkəzi Dövlət Hərbi Tarix arxivində hifz olunur. Həmin məktubların məzmunundan müəyyən etmək olur ki, Azərbaycan xanları təhlükə qarşısında Georgiyevsk traktatını "bəyənməyə" məcbur olmuşlar[1].

Belə məktublardan birini də, Hüseyn Əli xan şəxsən 1783-cü il noyabrın əvvəllərində Rusiya hökümətinin xəbərdarlıq məktubunu İrəvana gətirən qraf Apraksinə təqdim etmişdir[2].

Məktubda Hüseyn Əli xanın II İraklinin atdığı addımı bəyəndiyindən, Kartli-Kaxetiya çarının Azərbaycan xanları ilə yaxşı münasibətdə olduğundan bəhs edilirdi. Məktubun bir yerində belə deyilirdi: "Çar İraklinin əlahəzrət ümumrusiya taxtına sədaqətli olması mənədə xoşdur.Məni Çar İraklinin belə hərəkəti ruhlandırır.

[1] MDHTA 52-ci fond, 194-cü siyahı,286-cı sənəd, 1-ci hissə, vər.354.
[2] Yenə orada, vər. 299.

Xahiş edirəm ki, nəslim və əyalətlərimlə birlikdə Rusiya taxtına sadiq olacağımı qəbul edəsiz. Ömrümün axırına kimi sizə xəyanət etməyəcəm. Hazırda İrəvanda sakitlik və bolluqdur”[1]. Hüseyn Əli xan məktuba möhürünüdə vurmuşdu

İrəvanlı Hüseyn Əli xana Rusiya hökümətinin göndərdiyi məktubun məzmunu açıq-aydın göstərir ki, 1783-cü il Georgiyevsk müqaviləsi bağlanan zaman və ondan sonrada İrəvan xanlığının Kartli-Kaxetiya çarlığından heç bir asılılığı yox idi. Rusiya dövlətinin, Türkiyənin sərhədində olan İrəvan xanlığına münasibətinə Osmanlı Türkiyəsi biganə qala bilməzdi. Odur ki, İrəvanda vəziyyəti öyrənməkdən ötrü Sultanın əmri ilə Qars şəhərindən İrəvana buğda almaq bəhanəsilə üç nəfər türk “taciru” göndərildi. Onlar irəvanlılara möhkəm olmağı təklif etdilər və bildirdilər ki, azərbaycanlılara çatdırmaq məqsədi ilə İstanbuldan Qarsa xeyli top gətirilmişdir[2]. İstanbuldan Qarsa top gətirilməsini Trabzonda yerləşən erməni arxiyepiskopu da İrəvan ermənilərinə bildirdi [3] .Türkiyədən Azərbaycana, xüsusilə İrəvan xanlığına göndərilən məktubların birində belə yazılmışdı: “Siz irəvanlılar təbiətcə türksünüz. Əgər qüvvələr İrəvan qalasını almaq istəsələr, müdafiə olunaraq müsəlman qanunçuluğunu qorumalısınız. Sultan Qars, Bəyazid paşalarına sizi həmişə müdafiə etməyi tapşırmışdır.

Ən qədim dövrlərdən biz qonşu və dost olmuşuq. Biz həmişə qanunu qorumağa hazırıq”[4].

Həmin dövrə aid olan rus arxiv sənədlərindən birində yazılmışdı ki, Türkiyənin elçiləri Azərbaycana səpələnmişlər.Onlar

---

[1] Yenə orada.

[2]Yenə orada, I hissə, vər. 360.

[3] MDHTA 52-ci fond, 194-cü siyahı,286-cı sənəd, VII-ci hissə, vər.22.

[4]Yenə orada, 331-ci sənəd, VI hissə, vər. 20.

çalışırlar ki, qoşun toplasınlar və rusların qarşısını kəsib, onları Cənubi Qafqaza buraxmasınlar.Həmin sənədin başqa bir yerində yazılmışdır ki, Azərbaycan xanlıqıları Rusiyanın təbəəliyini qəbul etməyib,Türkiyə və İranla müqavilə bağlamışlar ki, cənuba yürüş edə biləcək rus qoşunlarına müqavimət göstərsinlər[1].Türkiyə elçilərinin Azərbaycanda olmaları və onların xanlara müraciəti haqqında məlumat, Axalsix və Qars paşalarının, xüsusilə İrəvan xanına göndərilən məktublarının surəti hazırda Moskva Dövlət Hərb Tarixi arxivində (MDHTA) bu günə kimi hifz olunur.

Axalsix hakimi Süleyman paşanın İrəvan xanına göndərdiyi məktubda yazılırdı: “Sizi doğma oğlum hesab edərək həmişə sizin əmin – amanlığınız üçün çalışmışam. Əlahəzrət hökmdarın və Asak vəzirin məktubu əsasında Qapıçıbaşı Saloxar Mehmed Sal bəyin vasitəsilə sizə və Azərbaycanın digər xanlarına pul və hədiyyələr göndərilmişdir. Onları bu yaxında alacaqsınız. Əgər siz bizim dövlətə sadiqsinizsə, və bizimlə dostluq münasibətində olmaq istəyirsinizsə o zaman ali Türkiyə bundan xəbərdar olmalıdır. Siz nəinki bizim sadiq bəndəmiz olacaqsınız, Sultanın da sizə hörməti artacaq, əgər sözlərimə inansanız, mənim də sizə qarşı məhəbbətim artacaq, iltifatlı oğlum və dostum, bu məktubu gətirəni yubanmadan göndər”[2].

Qars paşasının İrəvan xanına göndərdiyi məktubda deyilirdi: “Bizim şöhrətli hakimimiz sizə və Azərbaycanın digər xanlarına Qapıçıbaşı Saloxar Mehmed Sal bəyin göstərişi ilə axalsixli Süleyman paşa vasitəsilə puk və hədiyyələr göndərilmişdir.Tezliklə siz onları alacasınız. Allahın köməyi ilə biz həmişə sizinlə dost olacağıq və bu dostluğu nə olursa olsun saxlamalıyıq. Sizə nə

[1] Yenə orada, 366- cı sənəd.
[2]Yenə orada.

lazımdırsa əmr edin"[1]

Rus tarixçisi O.P.Markova arxiv sənədlərinə əsaslanaraq yazır ki, Axalsix, Ərzurum, Qars və Bəyazid paşaları İrəvan və Azərbaycanın başqa xanları ilə əlaqə saxlayır və onları II İrakliyə qarşı çıxmağa çağırırdılar[2].

Bu həqiqətən belə idi. Türkiyə sultanın İrəvan xanına göndərdiyi – arxivdən əldə etdiyimiz məktubda deyilirdi: "Bizə gəlib çatıbdır ki,Tiflis çarı Rusiya ilə birləşərək Azərbaycan xanlarının arasını vurmağa, onların arasında Rusiyaya təmayül yaratmağa çalışır... Siz bizimlə birləşməyə səy edin. Bizim məqsədimiz odur ki, çar İrakli sizə zərər verə bilməsin. Düşməni dəf etmək üçün birləşsin, onu öldürün, dağıdın və güllələyin"[3].

Osmanlı Türkiyəsinin Azərbaycan xanlıqlarına münasibətindən Cənubi Qafqaz xristianları, xüsusilə ermənilər narahat olmuşdu. Buna görə də İrəvandakı erməni icması 1784-cü ildə öz nümayəndəsi StepaniSaakovu Sankt – Peterburqa göndərməli oldu. Onun Rusiyanın hakim dairələrinə təqdim etdiyi məktubda deyilirdi ki, türklər ardı- arası kəsilmədən irəvanlılara yazırlar ki, möhkəm dursunlar və xristianlara qarşı mərd olsunlar. Biz həmməzhəb (dindaş) olduğumuz üçün başqa dinə mənsub olmaqdansa sizinlə ittifaqda olmağı daha üstün tuturuq. Mümkünsə bizə kömək əlinizi uzadın.

Daha sonra Stepan Saakov bildir ki, hazırda İrəvanda iki partiya yaranmışdır: "bu partiyalardan biri İrəvan qalasında oturan Hüseyn Əli xanın oğlunundur ki,Əhməd xanı müdafiə edir, digəri isə Maku sultanı Əhməd sultnındır. Onlar öz aralarında rəqabət aparır,

---

[1] MDHTA 52-ci fond, 366-cı sənəd.

[2] O.P.Markova. Göstərilən əsəri, səh. 202; MDHTA 52-ci fond, 194-cü siyahı, 330-cu sənəd, vər.2-3.

[3] MDHTA 52-ci fond, 331- ci sənəd, VIII hissə (1784), vər. 54-55.

bir – birinin qonşuluğunda olan kəndləri darmadağın etdiklərindən, kəndlilər əkin sahələrini başlı – başına buraxıb Türkiyəyə qaçmışlar. Onların əkdikləri taxıl suvarılmadığına görə yanıb qurumuşdur. Əkinin salamat qaldığı sahələri isə süvari qoşunları məhv etmişdir. Ararat vadisi təlatümlü dənizdə qalmış adaya bənzəyir.

Lakin rus hökuməti bu dəfə Stepan Saakovun İrəvandan gətirdiyi məktuba məhəl qoymadı. Məsələ burasındadır ki, həmin dövrdə Rusiya təkcə İrəvan xanlığını deyil, bütün Cənubi Qafqazı qan tökmədən ələ keçirmək üçün səy göstərirdi. Məsələ burasındadır ki, həmin dövrdə Azərbaycan xanlıqlarından bir qismini ələ keçirmək sahəsində İranda da az iş görülmürdü. Kərim xan Zəndin ölümündən sonra İranda müvəqqəti hakimiyyət başına gələn "şahlar" da gözlərini Azərbaycana dikmişdi. Bu cəhətdən Əli Murad xan daha artıq fərqlənirdi. O, şah olmaq arzusu ilə dəridən – qabıqdan çıxırdı. İsfahanda oturan Əli Murad xan İranda hakimiyyət başında möhkəmlənmədiyi və şah titulunu rəsmən qəbul etmədiyi halda Azərbaycanın bir sıra xanlıqlarına fərmanlar göndərib tabeçilik rəmzi olaraq onlardan girov və ya qiymətli daş- qaş tələb edirdi. Əli Murad xan hətta 1784-cü ildə Rusiyanın Yaxın Şərqdə rəqibi olan Osmanlı Türkiyəsinə qarşı mübarizə aparmaq üçün Rusiyadan kömək almaq və özünü şah kimi tanıtmaq məqsədi ilə Moskvaya nümayəndə də göndərmişdi. O, nümayəndəsi Məhəmməd xana tapşırmışdı ki, göstəriləcək kömək əvəzində vaxtilə Rusiyanın tərkibində olan torpaqlardan savayı [1] "Qaradağ, Qarabağ, Naxçıvan və İrəvan vilayətlərini" [2] Rusiya imperiyasına "güzəştə" getməyə hazırdır. Göründüyü kimi, Əli Murad xan Azərbaycan xanlıqlarına heç bir hüququ olmadığı halda halda həmin xanlıqları rus dövlətinə verməyi

---

[1] 1722-1723-cü illər Xəzər boyu əyalətlərinin Rusiya tərəfindən işğal olunmuş ərazisi nəzərdə tutulur.

[2] P.Q.Butkov. Göstərilən əsəri, II c., səh. 148; O.P.Markova. Göstərilən əsəri, səh. 191.

vəd edirdi. Əvəzində isə onu İranın şahı kimi tanımağı Rusiya dövlətindən xahiş edirdi. Bu məsələyə toxunan gürcü tarixçisi V. Maxaradze yazır ki, həmin dövrdə İrəvan və Gəncə xanlıqlarının əhalisi onsuz da himayə haqqında II İrakli vasitəsilə Rusiyaya müraciət etmişdi[1].Bizcə, V. Maxaradze yazsaydı ki, Rusiyaya və II İrakliyə həmin xanlıqlarda sığınacaq tapıb yaşayan ermənilər müraciət etmişdilər, bu həqiqətə daha uyğun olardı.

Rusiya Əli Murad xanla Cənubi Qafqazı bölüşdürmək haqqında danışıqlar aparmaq məqsədi ilə İsfahana polkovnik V.S.Tamaranın başçılığı altında nümayəndə heyəti göndərdi. V.S.Tamara yol üstündə - İrəvana çatar- çatmaz İranda Əli Murad xanın 1785-ci il fevral ayının 12-də qəfildən ölməsi xəbərini aldı. Lakin bu xəbərin həqiqətə uyğun olub- olmamasını bilmək üçün səfərini Xoy şəhərinə qədər çatdırdı.O burada eşitdiyi xəbərin dəqiqliyini müəyyənləşdirdikdən sonra İran taxtına müvəqqəti də olsa yiyələnən Cəfər xana məktub göndərərək onu Əli Murad xanın siyasətini davam etdirməyə çağırdı. Lakin Cəfər xan hakimiyyət uğrunda müvəffəqiyyətlə mübarizə aparan Ağa Məhəmməd xan Qacardan ehtiyat edərək tezliklə İsfahdan Şiraza qaçdı. Beləliklə də Rusiyanın Azərbaycanı İranla bölüşdürmək cəhdi baş tutmadı.

Rusiya dövlətinin Kartli – Kaxetiya dövlətinin müraciətinə laqeyd münasibəti heç də II İraklini təmin etmirdi. Əli İrəvan xanlığından çıxan, II İrakli hələ 1783-cü ildə Tiflisdə olan rus qoşunlarına arxalanıb Hüseyn Əli xanı devirmək və yerinə ona müti olan xan təyin etmək qərarına gəlmişdi. Bu məqsədlə o, Hüseyn Əli xanın qardaşı Məhəmməd Həsən xanla ümumi danışıq apardı. Hakimiyyət başında olmaq arzusu ilə yaşayan Məhəmməd Həsən xan II İrakli ilə razılığa da gəlmişdi.

---

[1]V.Maxaradze. Göstərilən əsəri, səh. 37.

Lakin nə II İrakli və nə də Məhəmməd Həsən xan arzularına çatmadılar. 1783-cü ilin sonunda İrəvanda baş verən üsyan nəticəsində Hüseyn Əli xan və qardaşı Məhəmməd Həsən xan qətlə yetirildilər.

Birdən – birə xan nəslindən iki şəxsin öldürülməsi İrəvandan böyük iğtişaşa səbəb oldu. Bu isə ilk növbədə İrəvanda yaşayan erməniləri və həmçinin İrəvanı əlində saxlamağa cəhd edən II İraklini daha çox narahat edirdi. İrəvan ermənilərin nümayəndəsi Mirzə Qurgen çalışırdı ki, İrəvan xanlığının taxtına II İraklinin köməyi ilə İrəvan zadəganlarından ən varlısı olan Sultan Əhməd sahib olsun.Onun Kartli – Kaxetiya çarına göndərdiyi məktubunda deyilirdi ki, əgər Sultan Əhməd xan olmasa, "İrəvan qalası əlimizdən çıxacaq".

Mirzə Qurgenin məktubundan sonra II İrakli vaxt itirmədən öz qaynı Baqrationu gürcü qoşunları ilə İrəvana göndərdi ki, Sultan Əhmədə taxta çıxmaqda kömək etsin. Lakin II İrakli gecikmişdi. İrəvanda, hakimiyyət başına mövcud qayda- qanuna uyğun olaraq, Hüseyn Əli xanın böyük oğlu Qulam Əli gəldi (1783- 1785). Bu anda İrəvana çatan Baqration əlacsız qalıb, Qulam Əli xanı hakimiyyət başına gəlməsi münasibətilə təbrik edib geri qayıtmalı oldu. Knyaz Baqrationun İrəvan xanlığında Qulam Əli xanın oturması ilə razılaşmasını İrəvan zadəganları birmənalı qiymətləndirərək elə güman etdilər ki, bu işdə II İraklinin əli vardır. Odur ki, yeni xana o qədər də etibar etmirdilər[1]. Əhalinin Qulam Əli xanla hesablaşmamasını bilən II İrakli P.S.Potyomkinə yazdıöı məktubda əsassız olaraq loğvalıqla bildirdi: "İrəvanda ölmüş xanın əvəzində əhali onun kiçik oğlunu xan etmək istəyirdi. Lakin biz buna

[1] MDHTA 15-ci fond, 197- ci sənəd, vər. 24.

razı olmadığımızı bildirdik”[1]

Qulam Əli xan İrəvan xanlığının taxtına çıxdıqdan sonra hakimiyyətə can atan zadəganlardan biri – Əhməd Sultan İrəvanı tərk etməli oldu. İrəvan xanlığında baş verən qarışılıqdan öz xeyrinə istifadə etməyə çalışan II İrakliyə məlum idi ki, İrəvanın ən nüfuzlu əyanlarından olan Əhməd Sultanın İrəvan xanlığında ən zəngin və nüfuzlu feodallardan biridir.Onun Araz çayının o tayından zəngin malikanəsi vardır. Odur ki, II İrakli ona sadiq olan ermənilərdən Mirzə Qurgenə tapşırdı ki, Əhməd Sultana bildirsin ki, II İrakli onun İrəvan xanlığının hakimi olmağını arzulayır və ona kömək etməyə hazırdır[2].

II İrakli Əhməd Sultana kömək edəcəyinə söz verməklə bərabər, İrəvanın yeni xanı Qulam Əli xanı da əlində saxlayırdı. Ona hakimiyyət başına gəlməkdə maneçilik törətmədiyi üçün II İrakli Qulam Əli xana sifariş göndərdi ki, o öz qoşunları ilə birlikdə Naxçıvana gedib orada müdafiə etdiyi Abbasqulu xana Naxçıvan taxtını ələ keçirməkdə kömək etsin[3]. Qulam Əli xan öz qoşunları ilə Naxçıvana tərəf hərəkət etdiyi zaman Naxçıvanda hakimiyyət başında olan Cəfərqulu xan kömək üçün Xoy xanlığına müraciət etdi[4].Odur ki, Qulam Əli xan İrəvana qayıtmalı oldu.

Qulam Əli xanın İİ İrakliyə xidmət göstərməsi İrəvan zadəganlarını heç də təmin etmədi. Bu isə 1785 –ci ildə II İraklinin təşkil etdiyi saray çevrilişi zamanı Qulam Əli xanın qətli ilə nəticələndi.

Yeni xanın öldürülməsi, Türkiyə sultanını cəld hərəkət

---

[1] MDHTA 52-ci fond, I/194-cü siyahı,331-ci sənəd, VII hissə, vər.40.
[2] Yenə orada.
[3] Yenə orada, 286-cı sənəd, I hissə, vər. 359.
[4] Yenə orada, 331-ci sənəd, III hissə, vər. 29.

etməyə məcbur etdi. Gürcülərin və rusların əlinə keçməsin deyə o, qoşunları İrəvan xanlığı istiqamətində hərəkət etdirdi. Bu yürüşdə Türkiyə sultanı Xoy xanlığı qoşunlarından da istifadə edirdi. Məlum olduğu kimi, İrəvanlı Hüseyn Əli xan vaxtaşırı da olsa II İrakliyə ildə müəyyən məbləğdə bac verirdi. 1783- cü ildə Hüseyn Əli xanın ölümündən sonra hakimiyyət başına gələn Qulam Əli xanın saray əyanları arasında heç bir nüfuza malik olmadığından istifadə edən Türkiyə sultanı, uzaqgörənlik siyasəti işlədərək, Hüseyn Əli xanın azyaşlı oğlu Məhəmməd ağaya özündən 30 yaş böyük Xoy xanının qızını "almağa" nail olmuşdur. Bu isə Türkiyəyə meyil edən Xoy xanlığının gələcəkdə İrəvan xanlığının işlərinə müdaxilə etmək üçün əsaslı zəmin idi. Qulam Əli xan öldürüldükdən, Məhəmməd ağanı İrəvan taxtına oturtduqdan sonra Türkiyə sultanı Əbdül-Həmid yaranmış vəziyyətdən Kartli – Kaxetiya çarlığının əleyhinə istifadə etməyi qərara aldı[1].Sultan Əbdül- Həmidin İrəvan xanına göndərdiyi məktub bu cəhətdən səciyyəvidir: "...yaçca böyük olan və ləyaqətli Xoy xanına sipəhsalar rütbəsi verir, bütün xanlara fərman göndərərək bildirmişik ki, bizim paşa və vəzirlərə İraklinin hərəkətləri barədə xəbər versinlər"[2].Həmişə olduğu kimi, bu dəfə də sultan Qafqazın müsəlman feodal hakimiyyətlərinə qiymətli hədiyyələr və pul mükafatı göndırdi. Eyni zamanda Axalsix, Qars və Bəyazid paşalarına əmr olundu ki, qoşunları ilə İrəvan xanlığı istiqamətində hərəkət etsinlər. Bu məqsədlə Axalsix hakimi Süleyman paşanın azyaşlı irəvanlı Məhəmməd xana yazdığı məktubunda deyilirdi: "Sizi özümə oğul hesab edərək, həmişə səmimiyyətimi isbat etməyə çalışacağam. Vəzir Aslanın göstərişi əsasında Sizə Mehmed Sal bəy

---

[1] MDHTA 52-ci fond, I/194-cü siyahı,331-ci sənəd,IX hissə, vər. 108.
[2] MDHTA 52-ci fond, I/194-cü siyahı, 336-cı sənəd,IX hissə, vər. 55.

vasitəsilə pul və hədiyyə göndərirəm"[1].

Demək olar ki, Qars paşası da İrəvan xanlığına və digər xanlıqlara eyni məzmunlu məktub göndərmişdi: "Bizim şövkətli hakimimiz tərəfindən Sizə və digər Azərbaycan xanlarına Qapıçıbaşı Mehmed Sal bəyin vasitəsilə Axalsix paşası Süleymana pul və hədiyyə göndərilmişdir ki, Sizə bu yaxınlarda çatdırılsın"[2]. Hər iki məktubda pul və hədiyyə əvəzində Azərbaycan xanlıqlarından Türkiyə ilə birlikdə ümumi düşmənə - Rusiya dövlətinə qarşı çıxmaq tələb olunurdu.

Türkiyə tərəfindən İrəvan xanlığını ələ keçirmək cəhdindən tezliklə Rusiyada və Kartli – Kaxetiya çarlığında xəbər tutdular. İrəvan xanlığının Türkiyə tərəfindən zəbt olunması, təkcə Gürcüstanda deyil, bütün Cənubi Qafqazda Rusiyanın yürütdüyü siyasətə ağır zərbə endirə bilərdi. P.S.Potyomkinin göstərişi ilə II İrakli sərhədə rus qoşunları ilə birlikdə daha iki mindən ibarət qoşun göndərdi. Bu hadisədən sonra nahaq qan tökülməməsi üçün Türkiyə sultanı öz qoşunlarının geri dönməsi barədə əmr verdi.

Hərbi qüvvə əvəzinə, 1785-ci ildə Türkiyədən Cənubi Qafqaza Qapıçıbaşı İbrahim əfəndinin başçılığı altında nümayəndə heyəti göndərildi. Həmin nümayəndə heyətinin məqsədi özünün Cənubi Qafqazda xristian dövlətləri – Ermənistan və Albaniya yaratmaq əleyhinə koalisiya yaratmaqdan ibarət idi. Lakin Türkiyə sultanının bu cəhdi baş tutmadı. Yeri gəlmişkən qeyd edək ki, Rusiyanın təşəbbüsü də uğursuz oldu.

Qapıçıbaşı İbrahim əfəndinin Cənubi Qafqazdakı fəaliyyəti barədə bilavasitə arxiv sənədlərində təsadüf etmişik. Qarabağ ermənisi Nikita Yakovlev Ənzəlidə olarkən rus konsulu Skiliçə

---

[1] Yenə orada.

[2] Yenə orada, IV hissə, vər. 209.

bildirmişdir ki, eşitdiyinə görə keçən il qubalı Fətəli xan, qarabağlı İbrahim Xəlil xan, xoylu Əhməd xan və başqaları... Azərbaycan xanlarından və Dağıstan hakimlərindən cəmi 17 nəfər, Türkiyə sultanının sarayına vəkillərini və habelə məktub göndərmişlər. Müsəlmanlar sultana xəbər göndərmişlər ki, Rusiyanın Qafqazda xristian dövləti yaratmaq niyyətini pozmaq üçün kifayət qədər qoşunları var, lakin onların pulları azdır[1].

Yuxarıdakılardan belə qənaətə gəlmək olar ki, İbrahim Əfəndi Cənubi Qafqazda olarkən Azərbaycanın və Dağıstanın bir sıra hakim feodallarını Rusiyanın əleyhinə səfərbər etməyə nail olmuşdur. Bunu aşağıdakı arxiv sənədlərindən də müəyən etmək olar. Sənəddə deyilir ki, Türkiyədən "qubalı Fətəli xanın, şuşalı İbrahim xanın, xoylu Əhməd xanın hərəsinə yüz manat çervon, kürk üçün samur xəzi, daş- qaşla bəzənmiş saat"[2] göndərilmişdir. Gilanlı Hidayət xanın, urmiyalı Əhməd Qulu xanın... şamaxılı Məhəmməd Səid xanın, lənkəranlı Qara xanın, bakılı Mirzə Məhəmməd xanın hərəsinə beş min manat pul və bir ədəd saat verilmişdir". Siyahıda daha bir neçə Dağıstan feodal hakiminin adı çəkilir[3]. Başqa bir arxiv sənədində deyilir ki, yuxarıda qeyd edilənlərdən əlavə Şimali Azərbaycanda böyük nüfuza malik olan qubalı Fətəli xan üçün daha 4 min çervon pul ayrılmışdı[4]. Rusiyanın Kartli- Kaxetiya çarlığındakı nümayəndəsi polkovnik S.Burnaşovun verdiyi məlumata görə Qapıçıbaşı İbrahim Əfəndi Cənubi Qafqaza gələrkən Azərbaycanda və Dağıstanda paylamaq üçün özü ilə qırx ədəd dörd minlik çervon gətirmişdir[5].

---

[1]MDHTA 52-ci fond, I/194-cü siyahı,331-ci sənəd, vər. 51.

[2]Yenə orada,350-ci sənəd, V hissə, vər. 24-25.

[3] MDHTA 52-ci fond, I/184-cü siyahı,350-ci sənəd, V hissə, vər. 24-25.

[4] RXSA. Rusiyanın Türkiyə ilə əlaqələri fondu, 625-ci sənəd, vər. 27.

[5] RXSA. Rusiyanın Türkiyə ilə əlaqələri fondu, 625-ci sənəd, vər. 27.

Qapıçıbaşı İbrahim Əfəndi Cənubi Qafqazda olarkən bir çox yerli hakim feodallara təsir göstərə bilmişdi: belə ki, Türkiyədən qiymətli hədiyyələr alan Dağıstan feodalları Gürcüstana basqınlarını bərpa etmişdilər. O ki qaldı Azərbaycan xanlarına, onlardan Şamaxı, Şəki, Xoy, Qarabağ xanlıqlarının başçıları, habelə bir sıra Dağıstan feodalları ittifaq yaradıb Rusiyanın təcavüzünə qarşı birgə müqavimət göstərəcəklərinə söz vermişdilər. Bu ittifaq çox da uzun sürməsə də sultanın əmri ilə Trabzon, Ərzurum, Axalsix və Qars şəhərlərində türk əsgərləri Cənubi Qafqaza yürüş etmək üçün hazır vəziyyətə gətirildilər. Türkiyədə belə bir fikir yayılmişdı ki, 1783-cü ildə Gürcüstana gələn rus qoşunlarını məqsədi bu bölgədə Türkiyəyə zərbə endirməkdən ibarətdir. Axalsix,Ərzurum, Qars və Bəyazid paşaları İrəvan və digər Azərbaycan xanlıqları ilə sözləşərək Tiflis şəhərinə hücum etməyə hazırlaşdılar.Türkiyənin Gürcüstana basqın etməyə hazırlıq görməsi artıq hərbi sirr deyildi. Rusiyanın Ənzəlidəki konsulu Tumanovskinin 18 aprel 1784-cü ildə Həştərxan qubernatoru Jukova yazdığı məktubunda deyilirdi ki, Ərzurum və Bəyazid paşaları Gürcüstana hücum etmək üçün xeyli qoşun toplayaraq Azərbaycan və Dağıstan hakimlərini də bu işə cəlb etməyə çalışırdılar. Onlar bu yürüşdə iştirak edən döyüşçülərin hər birinə ildə 200 manat verməyə boyun olmuşlar[1].

P.S.Potyomkinin knyaz Potyomkinə yazdığı məktubda isə deyilirdi ki, türklər burada hər tərəfə qığılcım yağdırırlar ki, yanğın əmələ gətirsinlər.Sultan buraya Xəlil əfəndinin başçılığı ilə nümayəndə heyəti göndərmişdir ki, azərbaycanlılarla dağıstanlıların Gürcüstan əleyhinə ittifaqını yaratsın. Məktubla bərabər, sultan

---

[1] MDHTA 52-ci fond, I/194-cü siyahı,330-cu sənəd, vər. 2-3.

Cənubi Qafqazın müsəlman hakimlərinə və Dağıstana Georgiyevsk müqaviləsinin sürətini də göndərmişdi.

Xəlil Əfəndi Dağıstan, Şirvan və Qarabağda olduqdan sonra bir müddət İrəvanda qaldı. Bu da təsadüfi deyildi. İrəvan qalası Cənubi Qafqazın bu bölgəsində böyük strateji əhəmiyyət daşıyan qalalardan idi. Osmanlı Türkiyəsi bundan əvvəl də bir neçə dəfə İrəvan qalasını tutmaq təşəbbüsündə olmuşdur[1]. Xəlil Əfəndinin İrəvandakı fəaliyyəti bu xanlığı Gürcüstanın əleyhinə qaldırmaqdan ibarət idi. Məhz Osmanlı Türkiyəsinə arxalanaraq İrəvan xanlığı Kartli – Kaxetiya çarlığına göndərdiyi bacdan imtina emişdi. Bu hadisədən sonradan P.S.Potyomkin II İrakliyə İrəvana hücum edib bu şəhəri zəbt etməyi məsləhət gördü.Bu zaman artıq Axalsix, Qars, Ərzurum və atasının vəfatı münasibəti ilə başsağlığı verməkdən ibarət idi. Əslində isə məqsədləri Azərbaycanın digər xanlıqlarını İrəvan xanı vasitəsilə Rusiya və Gürcüstan əleyhinə qaldırmaq idi.

Lakin Osmanlı Türkiyəsinin bu təşəbbüsü baş tutmadı. 1784-cü ilin yayında Qulam Əli xan qardaşı ilə qətlə yetirildi. İrəvan xanlığının taxtı Qulam Əli xanın 12 yaşlı oğlu Məhəmmədə qismət oldu. Yeri gəlmişkən qeyd etməliyik ki, Məhəmməd xanın anası gürcü olduğundan II İraklinin Məhəmməd xana təsiri xeyli artdı. Axalsix hakimi Süleyman paşa bundan narahat oldu. O, Irəvan qalasının II İraklinin əlinə keçməyindən ehtiyat edərək İrəvanın yerli feodallarından Əhməd Sultan və Xoy hakimi Əhməd xanla İrəvan qalasını ələ keçirmək barədə razılığa gəldi. O, İrəvana sultan Əbdül – Həmidin fərmanını və digər türk paşalarının məktublarını da göndərdi. Həmin məktubların məzmunu irəvanlıları II İrakli ilə müharibəyə səfərbər etməkdən ibarət idi. Türkiyə sultanı tərəfindən eyni zamanda Ərzurum paşasına pul, Axalsix, Bəyazid və Qars

---

[1] MDHTA, 2-ci sənəd, vər. 39.

paşalarına fərmanlar göndərildi ki, onlar İrəvanı II İraklinin təcavüzündən müdafiə etsinlər.

Osmanlı Türkiyəsi həmin dövrdə özünü, həm də İranın və müsəlmanların "müdafiəçisi" kimi də qələmə verirdi. Sultanın İrəvana göndərdiyi məktubunda müsəlmanlar birliyə çağırılır və deyilirdi ki, "Tiflis çarı" Azərbaycan xanlarını "ruspərəst" etməyə və beləliklə də, onları "məhv" etməyə çalışır. Fərmanda eyni zamanda bildirilirdi ki, xoylu Əhməd xan birləşmiş qoşunların baş sərkərdəsi təyin edilmişdir[1].

Süleyman paşa bütün Azərbaycan xanlıqlarına İrəvan xanlığına kömək etməyi tapşırmışdı[2].

Türklərin İrəvan qalasını zəbt etmələri Rusiya-Gürcüstan münasibətlərinə ağır zərbə endirə bilərdi. Buna nə II İrakli, nə də II Yekaterina hökuməti razı ola bilməzdi. İrəvan şəhərində bu hadisəyə birmənalı baxılmırdı. Burada Gürcüstan və Türkiyə tərəfdarları arasında mübarizə gedirdi. Bundan xəbərdar olan II İrakli tərəfdarlarına kömək məqsədilə İrəvana iki minlik qoşun göndərdi. İrəvanlı gürcüpərəst ermənilər, II İrakliyə məktub göndərərək öz sevinclərini bildirirdilər. İrəvanlı Məhəmməd xan Süleyman paşaya məktub göndərərək bildirdi ki, o, II İraklini müdafiə edəcəkdir. Beləliklə, rus diplomatları bir növ "İrəvan məsələsindən" arxayın oldular.

Məhəmməd xanın belə hərəkəti Osmanlı Türkiyəsini Cənubi Qafqazda öz fəaliyyətini genişləndirməyə məcbur etdi. 1784-cü ilin payızında Cənubi Qafqazda İstanbuldan çoxsaylı (60 nəfər) nümayəndə göndərildi. Bu dəfə də Türkiyə Dağıstanın hakim feodallarına qiymətli hədiyyələr göndərmişdi.

---

[1] Yenə orada, vər. 54-55.

[2] Yenə orada, vər. 56.

Sultan Əbdül Həmidin fərmanında müsəlmanlar rusların əleyhinə müqəddəs müharibəyə - cihada çıxmağa çağırılırdılar[1].

İbrahim Əfəndinin Cənubi Qafqazda olması 1785-ci ildə Axalsix şəhərində azərbaycanlılarla dağıstanlıların Rusiyanın əleyhinə ittifaq bağlaması ilə nəticələndi. Həmin ittifaqı Şamaxı, Şəki, Qarabağ, Xoy xanlıqlarının nümayəndələri və Car camaatının ağsaqqalları imzaladılar. Lakin bu ittifaqın kağız üzərində qalmasına baxmayaraq, Türkiyənin Azərbaycanda apardığı təbliğat müəyyən qədər öz bəhrəsini verdi. İlk növbədə irəvanlı Hüseyn Əli xan Tiflisə göndərdiyi məbləğdən tamamilə imtina etdi.

Rusiyanın əleyhinə Azərbaycan xanlıqlarını birləşdirmək siyasətini Türkiyə hökuməti Axalsix paşası Süleyman paşa vasitəsilə hələ 1784-cü və 1785-ci illərdə qaldırmışdı. Rusiyanın Türkiyədəki səfiri Bulqakov II Yekaterinanın göstərişi əsasında Türkiyə sultanından Axalsix paşasının əl-qolunu yığışdırmağı təkidlə tələb etdi. İstanbulda Bulqakova müsbət cavab verilsə də, Türkiyə hökuməti öz fəaliyyətini Cənubi Qafqazda və Cənubi Dağıstanda genişləndirməkdən qalmırdı. Sultan öz emissarlarını tez-tez pul və hədiyyələrlə Qafqaza göndərməkdə davam edirdi.

Georgiyevsk müqaviləsindən sonra Azərbaycan xanları Rusiyadan göndərilən məktublara, əsasən, müsbət cavab vermişdilərsə, artıq 1785-ci ildə qarabağlı İbrahim Xəlil xan, qubalı Fətəli xan, xoylu Əhməd xan Türkiyə sultanına məktub göndərərək Osmanlı Türkiyəsinin himayəsi altında olmağı arzuladıqlarını bildirdilər[2].

Azərbaycan xanları Türkiyədən müsbət cavab aldılar. Türkiyə sultanı hətta Qarabağ və Xoy xanlıqlarının başçılarına tapşırdı ki,

---

[1] MDHTA 52-ci fond, I/194-cü siyahı, 350-ci sənəd, II hissə, vər. 4.

[2] A.R.İoannisyan. Göstərilən əsəri, səh. 165.

onlar tezliklə İrəvan şəhərini alsınlar və rusları bu şəhərə heç zaman buraxmasınlar[1].

Türkiyədən gələn müsbət cavabdan ruhlanan Azərbaycanın hakim xanları II İrakliyə qarşı çıxaraq onun ruspərəst hərəkətini pislədilər. İrəvan xanlığı Kartli-Kaxetiya çarlığına bac verməkdən tamamilə imtina etdi. Lakin İrəvan xanı bu hadisədən sonra sanki yağışdan çıxıb, yağmura düşdü; çünki Axalsix paşası Süleyman paşa İrəvan xanından yetmiş min rubl, erməni dindarlarının başçısından isə qırx min manat bac tələb etdi. Əks təqdirdə o, "Üç kilsə" monastırını xarabazarlığa çevirəcəyi ilə hədələdi.

1786-cı ilin aprelində Türkiyə qoşunlarının tərkibində olan Ömər xan Dağıstana qayıdarkən İrəvan xanlığının ərazisindən keçməli oldu.Bu əhali arasında böyük təşviş yaratdı.O, "Üç kilsə" xəlifəsi ilə birlikdə yenidən İrəvan qalasında sığınacaq tapmağa məcbur oldu. Ləzgilərin gəlişi bu dəfə o qədər də dəhşətli olmadı. Onlar İrəvan şəhərinə yaxınlaşmadan, qarşılarına çıxan kənd və obaları qarət edə -edə Gəncə istiqamətində hərəkət etdilər.

Lakin bu hadisə də irəvanlıları sakit etmədi. Tezliklə İrəvan qalasını Təbriz xanlığının qoşunları mühasirəyə aldılar. Lakin İrəvan döyüşçüləri ciddi müqavimət göstərərək düşməni geri çəkilməyə vadar etdilər[2].

Bu hadisədən sonra Osmanlı Türkiyəsi yenidən böyük strateji əhəmiyyətə malik olan İrəvana sahib olmaq fikrinə düşdü. Türkiyənin hakim dairələri İrəvan şəhərini zəbt etməkdə Kartli-Kaxetiya çarlığından və Rusiyadan daha çox ehtiyat edirdilər. 1787-ci ilin iyunda Türkiyədən Xoy xanlığının yeni hakimi Hüseyn Qulu xana göndərilən fərmanda deyilirdi: "Tiflisin valisi (II İrakli – *F.Ə.*)

---

[1] MDHTA 52-ci fond, 32-ci sənəd, vər. 159-160.

[2] MDHTA, f. VUA, 4252-ci sənəd, vər. 126.

rusları Azərbaycanı və bizim torpaqları qarət etmək üçün dəvət etmişdir. Lakin o unutmuşdur ki, bizim hakimi olmayan dövlət qurmağa ixtiyarımız var. Biz heç zaman İrəvanın darmadağın və qarət olunması ilə razılaşa bilmərik. Odur ki, Bəyazid, Van və Muşun rəislərinə əmr etmişik ki, sizə qoşun gərək olsa göndərsinlər: əgər Tiflis valisi sərhədi keçmək fikrinə düşsə, o zaman Ərzurum paşası Mustafa kömək edəcəkdir".

Bundan xəbər tutan general- poruçik P.S.Potyomkin mərkəzə məktub göndərərək soruşdu ki, türklər İrəvan tərəfə gəlsələr nə edim, onlarla hələ ki, müharibə etmirik?[1]

Rus arxiv sənədlərinin birində bu dövrdə baş verən hadisələr barədə başqa bir məlumat da var. 1787 –ci il iyul ayının 8-də polkovnik S.Burnaşovun P.S.Potyomkinə göndərdiyi məktubda deyilir: yeni məlumatlar əldə etmək məqsədilə onun İrana göndərdiyi knyaz Çavçavadze bildirmişdir ki, Türkiyədən Azərbaycan xanlarına göndərilən fərmanda sultan onları həmişə müdafiə edəcək, İrəvan şəhəri Azərbaycana mənsub olduğu üçün onun heç zaman Gürcüstanın tabeliyində olması ilə razılaşmayacaq. Sultan Ərzurum paşası və digər sərhəddə yerləşən paşalara tapşırmışdır ki, nəyin bahasına olursa olsun rus qoşunlarının qarşısına çıxsınlar. Çavçavadzenin məlumatında həmçinin deyilirdi ki, Umma xan, İbrahim Xəlil xan və digər Azərbaycan xanlıqları əbədi olaraq İrəvanı Kartli-Kaxetiya çarlığının təqibindən azad etmək üçün birləşmişlər. Bu xəbərlə əlaqədar olaraq S.Burnaşov P.S.Potyomkindən həmin xanlıqların döyüşçülərinin əleyhinə qoşun çıxarmasına icazə vermişdir[2].

Çavçavadzenin verdiyi xəbərin nə ilə nəticələndiyi haqqında

---

[1] MDHTA, f. VUA, 4252-ci sənəd, vər.361.

[2] Yenə orada, 52-ci fond, I/194-cü siyahı, 416-cı sənəd, I hissə, vər. 354.

arxiv sənədlərində hələlik məlumat əldə edilməmişdir.

1780-ci ilin sonlarında İranda demək olar ki, Zənd sülaləsinin hökmranlığına son qoyuldu. Həmin vaxt Qacar sülaləsinin banisi Ağa Məhəmməd xan İran torpaqlarını (Xorasandan savayı) özünə tabe edərək sabiq geniş əraziyə malik Səfəvi dövlətini bərpa etmək fikrinə düşdü. O, ilk növbədə Cənubi Qafqaz ölkələrinə - Azərbaycana, Ermənistana və Gürcüstana sahib olmağı arzulayırdı.Onun bu tədbiri müəyyən dərəcədə tac qoymaq mərasimi ilə də əlaqədar idi. Bu da ondan irəli gəlirdi ki, İran şahları uzun müddət bütün Cənubi Qafqaz ölkələrinə sahib olmuşdular. Əslində isə Ağa Məhəmməd xan tacqoyma mərasimini bəhanə edib Cənubi Qafqaz xalqlarını əsarət altına almaqla, öz hakimiyyətini qarət hesabına möhkəmlətməyə can atırdı.

Mənşə etibarilə türk olan Ağa Məhəmməd xan Qacar elə güman edirdi ki, Azərbaycan xanları ilə asanlıqla ümumi dil tapa biləcəkdir. O hələ İranda mövqeyini əsaslı surətdə möhkəmlətmədiyi halda Azərbaycan xanlıqlarını özünə tabe etmək təşəbbüsündə olmuşdur. Bu məqsədlə Ağa Məhəmməd xan hər bir Azərbaycan xanlığına nümayəndələrini göndərib itaət əlaməti olaraq xanlığın ən yaxın adamlarından girovlar tələb edərək [1] onları ciddi şəkildə hədələdi. Ağa Məhəmməd xanın belə tədbiri Cənubi Qafqazda da siyasi vəziyyətin ciddi şəkildə dəyişməsinə səbəb oldu. Bu hadisə ilə əlaqədar olaraq Azərbaycanda biri-birinin əksinə olaraq iki rəqabət aparan cəbhə yarandı: İran tərəfdarları və İrana zidd çıxanlar. Birinci cəbhənin özəyini Gəncə, Şəki və Quba xanlıqları təşkil edirdilər. Adları çəkilən xanlıqların hakimləri həm II İraklinin apardığı ruspərəst siyasəti bəyənmir və həm də Rusiyanın Cənubi Qafqazda

[1] RXSA. Rusiyanın İranla ilə əlaqələri fondu, siyahı77/6, 484-cü sənəd, vər. 339-348; P.Q.Butkov. Göstərilən əsəri, II c., səh. 320.

apardığı siyasətdən ehtiyat edirdilər.Belə xanlar müstəqilliklərini itirməkdən daha çox qorxurdular.

Onlardan fərqli olaraq ikinci cəbhədə Qarabağ, Naxçıvan, İrəvan, Talış xanlıqlarının başçıları və Kartli-Kaxetiya çarı birləşmişdilər.

Şimali Azərbaycana yürüş edən Ağa Məhəmməd xanın 80000-lik ordusu üç istiqamətdə hərəkət etdirdi.İran sərbazlarının bir qismi Muğam, bir qismi İrəvan və üçüncü qismi isə Qarabağ istiqamətlərində yürüşə başladılar.

Ağa Məhəmməd xan Qacarın 1795-ci ildə Azərbaycana yürüşü haqqında tarixi ədəbiyyatda material çox olduğundan biz bu məsələnin üzərində dayanmağı lazım bilmirik.Lakin İrəvan xanlığının İran sərbazları tərəfindən zəbt edilməsi barədə demək olar ki, yazılmamışdır. Mövcud ədəbiyyatda isə nöqsanlara yol verilmişdir.

Bu barədə yuxarıda adını çəkdiyimiz rus tarixçisi O.P.Markova belə yazır: "Ağa Məhəmməd xanın Zaqafqaziyaya yürüşü 1795-ci ilin baharında başladı.Gəncə və İrəvan müqavimət göstərmədən düşmənə tabe oldu"[1].

Əslində isə bu belə olmamışdır.İlk öncə qeyd etməliyik ki, İran sərbazları 1795-ci ildə heç Gəncə xanlığına tərəf hərəkət etmişdilər, çünki gəncəli Cavad xan Ağa Məhəmməd xanın Cənubi Qafqazdakı hərəkətlərini dəstəkləmiş və öz qoşunları ilə birlikdə İran hökmdarının tərəfinə keçmişdi.

İrəvan xanlığına gəldikdə isə qeyd etməliyik ki, İrəvan xanlığının hakimi Məhəmməd xan hələ Ağa Məhəmməd xan Qacarın fərmanını alarkən bir növ diplomatik addım atmışdı.O, İran hökdarlarının hüzuruna sevmədiyi qardaşını itaət rəmzi kimi girov göndərdiyini halda, düşmənə müqavimət göstərmək məqsədilə İrəvan

---

[1] O.P.Markova. Göstərilən əsəri, səh. 288.

qalasında ciddi hazırlıq işləri aparmışdı.

Ağa Məhəmməd xan irəvanlı Məhəmməd xanın hiyləsindən agah olsa da onun nümayəndəsini zahirən yaxşı qarşıladı. Lakin o, belə hərəkəti üçün irəvanlı Məhəmməd xanı cəzalandırmağı da unutmadı. 1795-ci ildəki yürüş zamanı o, doğma qardaşı Əli Qulu xanın başçılığı altında İrəvan xanlığını zəbt etmək üçün 20000 sərbazdan ibarət qoşun göndərdi.

İrəvanlı Məhəmməd xan düşmənə müqavimət göstərmək üçün ciddi hazırlıq görmüşdü. O,ilk növbədə İrəvan qalasını yeddi illik ərzaq ehtiyatı ilə təmin etmişdi.Qalaya yerli əhalidən əlavə, kəndlərdən daha yeddi min qoşun səfərbər etmişdi[1]. Onlardan dörd mini azərbaycanlı, üç mini isə ermənilərdən ibarət idi.Darısqallıq üzündən onların hər birinə İrəvan qalasına yalnız arvadlarını gətirmək icazəsi verilmişdi. Onların digər ailə üzvləri kəndlərdə qohum- əqrəbalarının evlərində saxlanılmışdı[2].

Şübhəsiz, belə müdafiə üslubu çox davam edə bilməzdi.Kənd yerlərindən gəlib uşaqlarını, qoca valideynlərini, var- yoxlarını orada qoyan döyüşçülər düşmənə uzun müddət müqavimət göstərə bilmədilər. Düşmən qoşunlarının ətraf kəndlərdə qarət və soyğunçuıuqla məşğul olmaları xəbəri İrəvana çatdıqda kəndlərdən səfərbər olunmuş müdafiəçilər öz ev- eşiklərinin və uşaqlarının hayına qalıb qalanı tərk edərək kəndlərinə dağılışmışdılar[3]. İrəvan qalasının müdafiəçilərinin sayı xeyli azaldı. İrəvanlı Məhəmməd xan kömək üçün II İrakliyə müraciət etdi. Həmin vaxt Kartli- Kaxetiya çarlığı ağır siyasi və iqtisadi böhrana məruz qalmışdı. Odur ki, II İrakli irəvanlı Məhəmməd xana heç bir kömək etmədi.

---

[1] MDHTA, f. VUA, 199-cu sənəd, vər.76.

[2] Жизнеописание Аге- Могамед хана Каджара // Сын отечества № 23, 1835

[3] MDHTA, f. VUA, 299-cu sənəd, vər.73.

Tezliklə İran sərbazları yaxşı müdafiə olunmuş İrəvan qalasına yaxınlaşıb şəhəri hər tərəfdən mühasirəyə aldılar.

İrəvanlılar otuz baş gün düşmənə müqavimət göstərdilər. Qala mühasirədə olduğu zaman Əli Qulu xan qoşunlarının bir qismini qarət məqsədilə ətraf kəndlərə göndərdi. İran sərbazları kəndlilərin təsərrüfatını bərbad hala salıb evlərini yandırdılar. Belə özbaşınalığın qarşısını almaq məqsədilə irəvanlı Məhəmməd xan müqavimət göstərməkdən əl çəkib düşmənə tabe olmağa məcbur oldu. 1775-ci ilin avqustunda İrəvan qalası düşmən əlinə keçdi. İrəvan xanı tabelik rəmzi olaraq Ağa Məhəmməd xanın düşərgəsinə yaxın adamlarındangirov göndərməyə razılıq verdi. Bundan əlavə, xan İranın xəzinəsinə 8 funt qızıl və 80000 manat miqdarında xərac verməli oldu.Eyni zamanda lazım gəldikdə xan öz qoşunları ilə birlikdə İran hökmdarının sərəncamında olmalı idi.

İrəvanın yaxınlığında yerləşən “Üç kilsə” monastırının xəlifəsi (katolikosu) Əli Qulu xana (İran xəzinəsinə) 4000 tümən verməklə öz malikanəsini təhlükədən xilas etdi.

İrəvan xanlığından sonra İran sərbazları Ağa Məhəmməd xanın şəxsən rəhbərlik etdiyi ordu ilə birləşib əvvəlcə Qarabağ, sonra isə Kartli- Kaxetiya çarlığına basqın etdilər.

1795-ci ildə İran hökmdarı Ağa Məhəmməd xanın Azərbaycana basqın etməsi xəbəri Türkiyədə alqışlarla qarşılandı. 1774-cü il Küçük Qaynarça və 1791- ci il Yassı müqaviləsi əsasında rəsmi surətdə Cənubi Qafqazdan əlini çəkməli olan Türkiyə bu zaman bir növ düşməni “başqasının əli” ilə vurmaq siyasətini yürüdərək, rusların buraya edəcək təcavüzünün qarşısını almaq üçün İrana kömək etmək qərarına gəldi. Türkiyə sultanın Gürcüstan və İrəvan xanlığı sərhədlərində Anadolu və Axalsixdə külli miqdarda qoşun toplaması barədə məlumat vardı. Həmin dövrdə Türkiyə ərazisindən keçərək Azərbaycana qayıdan tacirlər xəbər vermişdilər

ki, türk əsgərləri Bəyaziddə, Vanda, Qarsda və Ərzurumda toplaşıblar, onlar Ağa Məhəmməd xana kömək etmək fikrindədirlər.Tarixi ədəbiyyatda belə bir məlumat var ki, Ağa Məhəmməd xan 1795-ci ilin sentyabrında Tiflisi talan etsə də qoşun demək olar ki, azuqəsiz qalmışdı; ərzaq məhsullarına böyük ehtiyacı olan Ağa Məhəmməd xan yardım üçün Osmanlı Türkiyəsinə müraciət etməyə məcbur olmuşdu. Tezliklə İran hökmdarının nümayəndələri Türkiyədən müsbət cavabla qayıtdılar. Az bir vaxt içində Türkiyədən İran sərbazları üçün kifayət qədər buğda, yağ, qoyun və ordu üçün zəruri olan ləvazimat göndərildi.[1]

Sultandan aldığı kömək əvəzinə Ağa Məhəmməd xan onun hərəmxanasına 50 nəfər gözəl gürcü qızı, habelə türk zabitləri üçün P.Q.Butkovun sözləri ilə desək dəxi "Bir neçə bədbəxtləri yola saldı".[2]

Türkiyə sultanının tərəddüd etmədən Ağa Məhəmməd xana kömək etməsi, əslində Rusiyanın Qafqazdakı siyasətinin əleyhinə çıxmaq kimi qiymətləndirilməlidir.

Tezliklə İran dövləti İrəvan xanlığının daxili işlərinə müdaxilə etməyə başladı. İran sərbazlarının Cənubi Qafqaza yürüşü yerli əhaliyə baha başa gəldi. Bununla belə, həmin yürüşdən İrəvan xanlığı müəyyən qədər xeyir əldə etdi, Kartli – Kaxetiya çarlığının təqibindən yaxa qurtardı. Lakin bu da İrəvan xanlığına tam müstəqil olmağa imkan vermədi.

Yeri gəlmişkən qeyd etməliyik ki, İran sərbazlarının Cənubi Qafqaza yürüşü Rusiyanın buradakı mövqeyini xeyli zəiflətdi.Məhz buna görə də Rusiya Cənubi Qafqaza qoşun göndərməyi qərara aldı. Rus qoşunlarının Cənubi Qafqaza yürüşə hazırlaşmaları xəbəri

[1] MDHTA, f. VUA, 299-cu sənəd, (1795), vər.860.
[2]P.Q.Butkov. Göstərilən əsəri, səh. 343.

İrəvan xanlığındakı erməniləri ruhlandırdı. Onlar Rusiyaya müraciət edərək müsəlmanların himayəsi altından çıxmaq arzusunda olduqlarını bildirdilər. II Yekaterinanın höküməti Osmanlı Türkiyəsindən ehtiyat etdiyinə görə İrəvan xanlığına hələlik qoşun göndərməyib, bu işi II İrakliyə həvalə etdi[1]. Lakin II İrakli İran sərbazları tərəfindən məğlubiyyətə uğradıqdan sonra İrəvan xanlığına yürüş etmək iqtarında deyildi.

Əlacsız qalan Rusiya öz mövqeyini nəyin bahasına olursa olsun Cənubi Qafqazda, xüsusilə Azərbaycanda və Gürcüstanda möhkəmlətmək məqsədilə buraya qoşun göndərməyi qərara aldı. II Yekaterinanın höküməti Cənubi Qafqaza çoxsaylı qoşun göndərmək üçün hazırlıq görərkən vaxt itirmədən noyabrın sonlarında polkovnik Sıroxnevin başçılığı altında Gürcüstana iki rus batalyonu, Cənubi Dağıstan və Şimali Azərbaycana general – mayor Savelyevin komandası altında üç rus piyada batalyonu göndərdi.

Rus qoşunlarının Cənubi Qafqaza yürüş xəbərini eşidən Ağa Məhəmməd xan Cənubi Qafqazı tərk etməli oldu.

Çoxsaylı rus qoşunları yalnız 1796-cı ilin aprelində general V.Zubovun başçılığı altında Cənubi Azərbaycana yürüş etdilər.Qeyd edək ki, rus qoşunları bir – birinin ardınca Şimali Qafqaz xanlıqlarını özlərinə tabe etdirdikləri zaman, İran istismarına məruz qalmış İrəvan xanı rus qoşunlarının komandanı V.Zubovla məktublaşaraq ondan Ağa Məhəmməd xanın əleyhinə imdad istədi. V.Zubov irəvanlı Məhəmməd xanın ona göndərdiyi məktub barədə mərkəzə ətraflı şəkildə məlumat vermişdir.

1796-cı il dekabrın 13-də rus qoşunları Gəncə xanlığını işğal etdikdən sonra Rusiyanın müttəfiqi olan II İraklinin Cənubi

---

[1] MDHTA, f. VUA, 2799-cu sənəd, vər.1.

Qafqazda nüfuzu bir qədər artdı. O, yenidən İrəvan xanlığını öz təsiri altına almağa çalışdı[1]. Bundan xəbər tutan Ağa Məhəmməd xan Təvəkkül xan adlı sərkədələrindən birini 400 sərbazla İrəvana göndərib, qeyri- rəsmi olsa da xanlığın idarəsini ona tapşırdı[2]. Sonradan Ağa Məhəmməd xan Qacar İrəvan şəhərinin müdafiəsini möhkəmləndirmək üçün ora əlavə olaraq daha bir dəstə sərbaz göndərdi.İrəvanda baş verə biləcək üsyanın qarşısını almaq məqsədilə Tehrandan İrəvana böyük dəstə ilə Əli Qulu xan da səfərbər edildi[3].

Bu hadisədən sonra irəvanlı Məhəmməd xan V.Zubova məktub göndərib İrəvanda yerləşdirilmiş İran sərbazlarını və Təvəkkül xanı qovmaq üçün ondan 1000 nəfərlik rus döyüşçülərini göndərməsini xahiş etdi[4].V. Zubovun Məhəmməd xana göndərdiyi cavab məktubunda deyilirdi ki,tələsməyin mənası yoxdur, səbir etmək lazımdır[5]. Əslində isə V.Zubovun mərkəzin icazəsi olmadan İrəvana qoşun göndərmək ixtiyarı yox idi.Bu ilk növbədə Türkiyə ilə bağlanan müqaviləyə zidd idi. Bununla belə, Təvəkkül xan başda olmaqla İrəvanda məskunlaşmış sərbazlar V.Zubovu narahat etməyə bilməzdi.Məsələ burasındadır ki, sultanın əmri ilə sərəsgər Yusif paşa beş min qoşunla İrəvan xanlığına yaxınlaşaraq burada yerləşən İran ordusunun komandanı Təvəkkül xanın yanına öz nümayəndələrini göndərib, rusların əleyhinə çıxmağı onlara təklif etmişdi[6]. Türkiyə sultanı eyni zamanda Kartli – Kaxetiya çarlığının Azərbaycan xanlıqlarına qarşı hazırladığı təcavüzün də qarşısını

---

[1]Очерки истории СССР (вторая половина XVIII в.). М., 1956, стр. 735.
[2] "Mətndaran", 1331-ci sənəd, vər. 89.
[3] Е.Хубов. Описание достопамятных происществий в Армении случивщихся в последние тридцать лет, СПб., 1811, стр. 8.
[4] RXSA. Rusiyanın İranla ilə əlaqələri fondu, 77/1- ci siyahı. 158-ci sənəd, vər.188 .
[5] Yenə orada.
[6] RXSA, F. 77/I, 485-ci sənəd, vər. 81.

almağı məqsədəuyğun hesab edərək, onları II İraklinin fitnəsinə uymamağa çağırırdı.

V.Zubov İrəvanda cəmləşən düşmənlərinin əleyhinə II İraklidən istifadə etmək istədi. Lakin II İrakli hələlik belə bir tədbiri həyata keçirmək iqtidarında deyildi.

1796-cı ildə rus qoşunlarının V.Zubovun başçılığı altında Azərbaycana daxil olub, bir çox şəhər və əyalətləri tutmaları xəbəri sultan III Səlimi xeyli narahat etdi. Türkiyə hər cür vasitə ilə rusların Cənubi Qafqazdakı əməliyyatına mane olmağa çalışırdı. Məhz buna görə də Türkiyə hərbi dairələri rus ordusunun marşrutu və cəmləşdiyi yerlərlə maraqlanır və bununla əlaqədar olaraq, öz məxfi agentlərini Azərbaycana göndərirdilər. Həmin agentlər burada olan rus qoşunlarının sayı və gələcəkdə hansı istiqamətdə hərəkət etmələrini öyrənməli idilər.

II Yekaterinanın vəfatından sonra (1796-cı il, noyabr) hakimiyyətə gəlmiş I Pavel rus qoşunlarını Cənubi Qafqazdan geri çağırdı. Bundan istifadə edən Ağa Məhəmməd şah[1]Cənubi Qafqaza ikinci dəfə yürüş etməyə hazırlaşdı. Bununla əlaqədar İrəvan xanlığı haqqında onu deyə bilərik ki, Ağa Məhəmməd şah Qacar irəvanlı Məhəmməd xana min nəfərlik qoşunla onun hüzuruna gəlməyi əmr etdi.Əlacsız qalan irəvanlı Məhəmməd xan kömək üçün II İrakliyə müraciət etdi.Lakin Ağa Məhəmməd xanın birinci yürüşündən sonra zəifləmiş və rus ordusu  Rusiyaya qayıtdıqdan sonra qüvvətli arxasını itirən II İrakli daima gözü olduğu İrəvan xanlığına kömək edə bilmədi. Yalnız bundan sonra irəvanlı Məhəmməd xan şahın əmrinə itaət edərək min nəfərlik döyüşçü ilə Tehrana getməyə məcbur oldu. Ağa Məhəmməd şah irəvanlı Məhəmməd xanı ona xəyanət edərək

[1] Cənubi Qafqazdan qayıtdıqdan sonra Ağa Məhəmməd xan özünü İranın şahı elan edərək, tacqoyma mərasimini keçirmişdi.

Cənubi Qafqaza gələn rus qoşunlarının baş komandanı V.Zubovla məktublaşmaqda təqsirləndirərək ondan 500000 minmanat cərimə tələb etdi. Məhəmməd xan 200000 manat nəqd pul verib, qalan hissəsini ödəmək üçün öz əmlakını saymalı oldu[1]. Buna baxmayaraq, şahın əmri ilə irəvanlı Məhəmməd xan həbs olunub, ailəsi ilə birlikdə Qəzvinə göndərildi [2] . Bu hadisədən sonra İrəvav xanlığında hakimiyyət büsbütün Əli Qulu xanın əlinə keçdi.

1797-ci ilin baharında Ağa Məhəmməd şah Cənubi Qafqaza, xüsusilə Azərbaycana ikinci dəfə qoşun yeritdi. Onun məqsədi 1795-ci ildə ona tabe olmaqdan imtina edən Azərbaycan xanlarını cəzalandırmaq idi. Bu dəfə o, Şuşa qalasını işğal etməyə nail olsa da, təqribən bir həftədən sonra öz yaxın adamları tərəfindən qətlə yetirildi. Başsız qalan İran sərbazları qeyri – mütəşəkkil halda Cənubi Qafqazı tərk etməyə məcbur oldular. Bu hadisədən sonra İrəvanda hakimiyyət başında olan Əli Qulu xan mövqeyini möhkəmlətmək məqsədilə yerli əhalini sıxışdırmağa başladı. Lakin buna nail ola bilmədi. Əli Qulu xan üsyana başlayan irəvanlıların təzyiqi altında İrana qaçmağa məcbur oldu[3].

Ağa Məhəmməd şahın ölümündən sonra hakimiyyət başına gələn Fətəli şah da Cənubi Qafqazda İranın nüfuzunu bərqərar etmək üçün tədbirlər gördü. Yeni şah Qəzvində saxlanılan İrəvan xanlığının sabiq hakimi Məhəmməd xanı həbsdən azad edib "öz adamı" kimi İrəvan göndərdi. Lakin Məhəmməd xan Fətəli şahın etimadını doğrultmadı. İrəvana gəldikdən sonra Məhəmməd xan İrana tabe olmaqdan imtina etdi. 1797- ci ilin sonlarında şahın əmrinə itaət etməyən Məhəmməd xan yenidən kömək üçün II İrakliyə müraciət etdi. Lakin bu dəfə də o, Gürcüstandan heç bir kömək ala bilmədi.

---

[1]Н. Дубровин. История войны и владычества русских на Кавказе, стр. 207.

[2] P.Q.Butkov. Göstərilən əsəri, səh. 428; V.N. Leviatov. Göstərilən əsəri, səh. 149.

[3] "Mətndaran", 4001-ci sənəd, səh. 459-460.

Bunun əvəzində isə Xoy xanlığının hakimi Cəfərqulu xanla ümumi dil tapa bildi. Çünki bu zaman Cəfərqulu xan da Fətəli şaha tabe olmaqdan imtina edirdi.

İrana qarşı belə ittifaqların yaranmasının qarşısını almaq məqsədi ilə Fətəli şah şahzadə Abbas Mirzənin və sərdar Süleymanın başçılığı altında Azərbaycana sərbaz göndərdi. İrəvanlı Məhəmməd xan və xoylu Cəfərqulu xan qüvvələrini birləşdirib müqavimət göstərsələr də, döyüş meydanında məğlubiyyətə uğradılar.

Bir ildən sonra şahzadə Abbas Mirzə yenə də İrəvan xanlığı ərazisinə soxuldu və İrəvan qalasını mühasirəyə aldı. Eyni zamanda Abbas Mirzə dünyasını dəyişmiş II İraklinin vəliəhdi XII Georgiyə fərman göndərərək ondan Kartli – Kaxetiya çarlığının İrana tabe olamasını təsdiq edən sənəd tələb etdi. Əks təqdirdə Gürcüstanı viranəyə döndərəcəyini bildirdi. Yalnız Rusiyanın gördüyü əks tədbirlər bu təhlükəni sovuşdurdu.

İran sərbazları tərəfindən İrəvan qalasının mühasirəsi qırx gün davam etdi. Həmin müddət ərzində İrəvan qalasına soxula bilməyən İran sərbazları ətrafda yerləşən el- obaları, kəndləri və kənd təsərrüfatını talan etməklə məşğul oldular. Bunun qarşısını alsın deyə, Məhəmməd xan İran sərbazlarına müqavimət göstərməkdən imtina edərək, Abbas Mirzə ilə sülh bağlamağa razılaşdı. Məhəmməd xan Abbas Mirzəyə tələb olunan miqdarda təzminat və həmçinin, tabelik rəmzi olaraq girovlar verməyə məcbur oldu.

Abbas Mirzənin yürüşü bir daha göstərdi ki, İran hələ də Cənubi Qafqaza sahib olmaq fikrindən əl çəkməyib. Bu yürüş eyni zamanda Rusiyaya bir növ xəbərdarlıq idi ki, o, silah gücü ilə də olsa mövqeyini Cənubi Qafqazda möhkəmlətməlidir.

İran sərbazlarının İrəvan yürüşü İranın bu bölgədə nüfuz dairəsini genişləndirə bilərdi. Rusiyada I Pavelin ölümündən sonra yenicə hakimiyyətə gəlmiş I Aleksandr (1801-1825) hələ I Pyotrun

zamanından başlamış Cənubi Qafqazı ələ keçirmək siyasətini bərpa etməklə fəaliyyətə başladı. 1801-ci il sentyabrın 12-də Georgiyevskidə bağlanan yeni müqaviləyə əsasən Şərqi Gürcüstan Rusiyanın tərkibinə daxil edildi. Qafqaz xalqlarının taleyində bu tarixi akt mühüm rol oynadı. Bu hadisədən sonra çar Rusiyası Cənubi Qafqazı işğal etmək siyasətini həyata keçirməyə başladı. Bu baxımdan Rusiyanın qarşısında duran ümdə vəzifələrdən biri də Osmanlı Türkiyəsi və İranın sərhədlərində yerləşən İrəvan xanlığını ələ keçirməkdən ibarət idi.

İmperator I Aleksandr bu çətin və məsuliyyətli vəzifəni Rusiyanın Qafqazdakı qoşunlarının komandanı K.F.Knorinqə həvalə etdi. Lakin yerli hakim feodalların çar Rusiyasının belə məkrli siyasətindən xəbəri yox idi. Belə olmasaydı, İrəvan xanlığı xarici siyasətini fəallaşdırmazdı. Bu işdə irəvanlı Məhəmməd Məhəmməd xanın qohumu, Naxçıvan xanlığının sabiq hakimi Kəlbəli xanın da rolu olmuşdur. Məsələ burasındadır ki, Ağa Məhəmməd şahın ölümündən sonra irəvanlı Məhəmməd xanla yanaşı, İranda həbsxanada saxlanılan, gözü İran şahı tərəfindən 1797- ci ildə çıxarılmış Kəlbəli xan da azad olmuşdu[1]. Kəlbəli xan həbsxanadan azad olsa da İran şahı ona Naxçıvanda deyil, İrəvanda yaşamağa icazə vermişdi.

Gözlərini itirsə də siyasi aləmdə mübarizə aparmaqda ruhdan düşməyən təcrübəli Kəlbəli xan tezliklə irəvanlı Məhəmməd xanın etimadını qazandı. O, İrəvan xanlığında da ən nüfüzlu şəxsiyyətlərdən birinə çevrildi. Naxçıvandan İrəvana Kəlbəli xanın xeyli tərəfdarları köçdü.

Bu zaman qonşuluqda yerləşən Osmanlı Türkiyəsində

---

[1] Daha ətraflı b a x: Fuad Əliyev, Mirabdulla Əliyev. Naxçıvan xanlığı (1747-1828). Bakı, 1996.

gözlənilmədən belə bir hadisə baş verdi: Axalsix paşası Şərif paşa mərkəzi hökumətə tabe olmaqdan imtina edərək sultanın əleyhinə qiyam qaldırdı. Bundan istifadə edən irəvanlı Məhəmməd xan Şərif paşaya məktubla onu dəstəklədiyini və lazım gələrsə ona hərbi kömək göstərməyə hazır olduğunu da bildirdi. Sultan Şərif paşanın qiyamını yatırtmağı Ərzurum paşasına həvalə etdi.

Elə bu zaman başqa bir hadisə də beynəlxalq vəziyyətin dəyişməsinə səbəb oldu.

Napoleonun Misirə hücumu və tez –tez baş verən saray çəkişmələrindən təşvişə düşən Osmanlı Türkiyəsi özünün sabiq rəqibi çar Rusiyası ilə yaxınlaşmağı qərara aldı. Türkiyənin belə bir addımı Rusiyada məmnuniyyətlə qarşılandı. Belə ki, Rusiya Türkiyəyə ayrı – ayrı paşaları "sakitləşdirmək" üçün hətta hərbi qüvvə ilə kömək etməyə hazır olduğunu da bildirdi.

Şərif xanın qiyamını yatırda bilməyən Ərzurum paşası bundan istifadə edərək kömək almaq məqsədilə Tiflisdəki rus komandanlığına müraciət etdi. Tiflisdə baş komandan K.F.Knorinqin olmadığına görə general İ.P.Lazerev, gürcü şahzadələrindən David Borçalını və Qazaxdan səfərbər etdiyi dəstələri Türkiyəyə göndərdi. 1801-ci ildə Ərzurum paşası Şərif paşa ilə mübarizəni davam etdirmək üçün yenidən K.F.Knorinqə müraciət etdi. O, eyni zamanda bildirdi ki, Şərif paşaya irəvanlı Məhəmməd xan da ciddi kömək edir. Bununla əlaqədar olaraq Ərzurum paşası K.F.Knorinqdən xahiş edirdi ki, o Məhəmməd xanı belə hərəkətlərdən yayındırsın[1]

Yeri gəlmişkən qeyd edək ki, bu vaxta qədər Rusiya İrəvan xanlığını zor işlətmədən ələ keçirmək üçün tədbirlər hazırlayırdı. Lakin Türkiyə ilə dostluq münasibəti yaradıldıqdan sonra Rusiya

---

[1] AKAK, Ic., sənəd 1031.

İrəvan xanının əleyhinə çıxmağa məcbur oldu ki, o bir daha qiyamçı türk paşasına kömək etməsin. Bununla əlaqədar olaraq, rus qoşunları Qars paşasının dəstələrilə birləşərək 1802-ci ilin mart – aprel aylarında Türkiyənin ərazisinə daxil olan naxçıvanlı Kəlbəli xanla İrəvan xanlığının döyüşçülərinin üzərində qələbə çalıb onları geri oturtdu. Bu qələbədən sonra Qars paşası ruslara İrəvan qalasını işğal etməyi məsləhət gördü. Lakin rus ordusunun komandanlığı bu təklifə əməl etməyib bildirdi ki, onlara yalnız Gürcüstanın ərazisini qorumaq tapşırılmışdır. onu da bildirdi ki, lazım gələrsə, İrəvan xanını da öz torpağında cəzalandıra bilər.

Uğursuz yürüşünə baxmayaraq, bir qədər keçdikdən sonra, 1802- ci ilin mayında Məhəmməd xan bu dəfə qoşunları ilə Pəmbək və Qars paşalığı istiqamətində hərəkət etdi.

Bundan xəbər tutan K.F.Knorinq düşmənin hücumunu dəf etməyi polkovnik Karyaginə tapşırdı ki, öz hərbi qüvvələrini rus qoşunları ilə birləşdirsin[1].

Mayın ortalarında rus soldatları türk əsgərləri ilə birlikdə ikinci dəfə irəvanlı Məhəmməd xanın döyüşçülərini məğlubiyyətə uğratdılar. Bu zaman Qars paşasının təkidinə baxmayaraq rus komandanlığı İrəvan qalasını silah gücü ilə almaqdan imtina etdi. Halbuki Qars paşası İrəvana hücum olunarsa, o, rus qoşunlarını hər cür zəruri olan ərzaq və sursatla təmin edəciyinə söz vermişdi[2].

Birləşmiş Naxçıvan və İrəvan qoşunları geri qayıtdıqdan sonra, İran qoşunlarının sərkərdələrindən biri- Pirqulu xan 4000 nəfərlik sərbaz ilə Naxçıvanda göründü[3].O, İrəvan xanına fərman göndərərək tələb edirdi ki, "...Naxçıvandan (İrəvana) köçənləri geri

---

[1] AKAK, Ic., səh. 709.
[2] AKAK, IIc., səh. 631; P.Q.Butkov. Göstərilən əsəri, səh. 527.
[3] P.Q.Butkov. Göstərilən əsəri, səh. 527.

qaytarsın. Əks təqdirdə yüz min manat məbləğində cərimə verməlidir". Lakin Pirqulu xanın qoyduğu tələb təkcə yuxarıda deyilənlərlə məhdudlaşmırdı. Şahın göstərişi ilə o, Azərbaycan xanlarının hamısına fərman göndərərk onlardan tabe olmaq rəmzi kimi girovlar tələb etdi. Eyni zamanda Pirqulu xan Gürcüstana hücum etmək tədbirləri də hazırladı. Lakin bu bölgədə Rusiyanın fəallaşması İran bir qədər sakitləşdirdi. Strateji baxımdan böyük əhəmiyyət kəsb edən İrəvan xanlığını zəbt etmək üçün tədbirlər hazırlayan Rusiya öz fəaliyyətini genişləndirərək həmin xanlığın tərkibində olan Pəmbəki işğal etməklə özünün Cənubi Qafqazda həyata keçirdiyi siyasəti bir növ düşmənləri qarşısında nümayiş etdirdi. Rusiyanın belə siyasəti, Azərbaycan xanlıqlarını, o cümlədən torpaqlarının bir hissəsi (Pəmbək) işğal olunmuş İrəvan xanlığını heç də təmin edə bilməzdi. Azərbaycan xanlarının əksəriyyəti, xüsusilə Rusiyanın təzyiqini hiss edən irəvanlı Məhəmməd xan və naxçıvanlı Kəlbəli xan heç cür razılışa bilmirdilər ki, müsəlmanlar xristianların himayəsi altına düşsünlər[1].Bunun qarşısını almaq üçün hər iki feodal əks tədbirlərə əl atdı. İlk növbədə onlar Kartli- Kaxetiya çarlığından qaçmış və çar olmaq arzusu ilə yaşayan II İraklinin övladlarından biri- şahzadə Aleksandrla əlaqə yaratmağa çalışdılar. Onlar Aleksandrın əli ilə rusları Pəmbəkdən qovmaq istəyirdilər. Eyni zamanda irəvanlı Məhəmməd xan öz agentlərini Pəmbəkə göndərib yerli feodalları Rusiyanın əleyhinə üsyan etməyə çağırırdı. İrəvandan Tiflisə gəlmiş "Üç kilsə"nin arxiyeskopu Qriqori buradakı rus ordusunun komandanlığına bildirmişdir ki, "...İrəvan xanı ruslara yalnız zahirən meyil göstərir, daxilən onlara nifrət bəsləyir"[2]. Qriqori

---

[1] Gürcüstan Respublikası Mərkəzi Dövlət Tarix Arxivi (MDTA), 2-ci fond, 1801, 8-ci sənəd, vər. 104-105; AKAK, Ic., 838-ci sənəd, səh. 617-618.
[2] Yenə orada.

sonra demişdir ki, "...İrəvan xanı naxçıvanlı Kəlbəli xana bel bağlayaraq çalışır ki, Pəmbək mahalını Rusiyanın təbəəliyindən çaxartsın"[1].

Məhəmməd xanın Pəmbək feodalları ilə əlaqəsini eşidən rus ordusunun Gürcüstanda olan zabitlərindən biri, mənşəcə erməni olan İ.P.Lazerev öz qoşunları ilə Pəmbəkə tələsmiş və burada hazırlanan "qiyamın" qarşısını almışdır. Bu hadisədən sonra Pəmbək feodallarının bir qismi İrəvana qaçmışdır.

İrəvanlı Məhəmməd xanın hərəkətlərinə mənfi münasibət bəsləyən Rusiyanın Qafqazdakı qoşunlarının baş komandanı K.F.Knorinq qan tökmədən İrəvan qalasını ələ keçirmək məqsədi ilə 18 aprel 1802-ci ildə Məhəmməd xana əlavə olaraq məktubla müraciət edib, ona Rusiyanın təbəəliyini qəbul etməyi təklif etdi[2].

Bu zaman artıq İran hökümətində müəyyən dirçəliş yaranmışdı. Həmin dövrdə İran İngiltərə və xüsusilə, Rusiyanın rəqabət apardığı Fransa tərəfindən dəstəklənirdi. Bu isə İran dövlətini Rusiyaya qarşı çaxması üçün ürəkləndirirdi. Onu da qeyd edək ki, Rusiya işğalçı qoşunlarının Qafqazda görünmələri adı çəkilən Qərb ölkələrini təşvişə salmışdı.

Vəziyyətin belə şəkil alması imperator I Aleksandr hökümətini narahat etməyə bilməzdi. Cənubi Qafqazı büsbütün ələ keçirmək fikrində olan I Aleksandr 24 aprel 1802-ci ildə Gürcüstanda yerləşən rus qoşunlarının baş komandanı K. F. Knorinqə yeni təlimat göndərdi. Həmin təlimatın məzmunundan istər-istəməz Rusiyanın İrəvan xanlığına verdiyi əhəmiyyəti müəyyən etmək çətin deyil. Təlimatda K. F. Knorinqə tapşırıq verilir ki, o, Gürcüstanda olan rus qoşunlarının sıralarını möhkəmləndirsin

---

[1] Yenə orada.

[2] Gürcüstan Respublikası MDTA, 2-ci fond, 22-ci sənəd, vər. 29; AKAK, Ic.,sənəd 840, səh. 618-619.

və hazır vəziyyətdə saxlasın. İran sərbazlarının İrəvan xanlığına edilə biləcək basqınlarının qarşısını alsın və çalışsın ki, İrəvan xanının Rusiyanın təbəəliyini qəbul etməsinə nail olsun. K. F. Knorinq eyni zamanda heç də strateji əhəmiyyətə malik olmayan Gəncə xanlığını da işğal etməli idi. Bu əməliyyat Gürcüstanın əmin-amanlığını büsbütün təmin edə biləcəkdi[1].

Tiflisə I Aleksandrın təlimatını gətirən qasid yolda olarkən irəvanlı Məhəmməd xan da öz növbəsində sərhəddə yerləşən rus qoşunlarının üzərinə hərəkət edirdi. Bundan xəbər tutan K.F.Knorinq 17 may 1802-ci ildə yazılı surətdə Məhəmməd xandan belə hərəkət etməsinin səbəbini izah etməyi tələb etdi [2]. Məhəmməd xan K.F.Knorinqi sakit etmək üçün qeyri-səmimi olsa da bildirdi ki, o müharibə aparmaq fikrində deyil, hətta ruslarla dostluq əlaqəsi yaratmaq arzusundadır. Naxçıvanlı Kəlbəli xan da eyni məzmunda məktubu rus ordusunun qərargahına göndərdi

Əslində isə hər iki xan bir neçə dəfə Rusiyanın təbəəlik barədə təklifini rədd etmiş, hətta "Üç kilsə" monastırında Rusiya tərəfindən namizədliyi irəli sürülən Danili qəbul etməyib, özlərinə xidmət edən Davidə toxunmamışdılar[3].

Cənubi Qafqazda rus ordusunun baş komandanı K.F.Knorinq P.D. Sisianovla əvəz olunduqdan sonra Rus dövlətinin Cənubi Qafqaz bölgəsində siyasətinin istiqaməti də dəyişdi. Rusiyanın hakim dairələri dövlətin cənub sərhədlərini Kür və Araz çaylarına, qərb sərhədini isə Qara dənizə qədər uzatmaq qərarına gəldi. Bu işdə lazım gələrsə, İran və Türkiyə ilə müharibə etmək əzmində olduğunu da bildirdi. Bununla əlaqədar olaraq, Sisianov kansler Vorontsovdan

---

[1] Gürcüstan Respublikası MDTA, 2-ci fond, 39-cü sənəd, vər. 11.

[2] Yenə orada, 22-ci sənəd, vər 57; AKAK, Ic., 841-ci sənəd, səh. 841.

[3] AKAK, Ic., 28-ci sənəd, vər. 109-111.

Cənubi Qafqazda fəaliyyətini genişləndirmək üçün icazə istədi.

P.D.Sisianov Qafqazdakı rus qoşunlarının ali baş komandanı təyin edildikdən sonra Fətəli şah Pirqulu xanı geri çağırdı. Yerli əhalinin rəğbətini qazanmaq məqsədilə Fətəli şah, Kəlbəli xanı Naxçıvanın hakimi kimi tanıdı və ildə İran xəzinəsinə müəyyən məbləğdə xərac göndərmək şərti ilə onun Naxçıvana getməsinə icazə verdi.

Lakin bu tədbirlə Fətəli şah nə yerli əhalinin və nə də Kəlbəli xanın hörmətini qazana bilmədi. Dövrün müasirlərindən P.Zubov bu barədə belə yazır: "Hakimiyyət başında olan Qacar sülaləsinə nifrət bəsləyən Naxçıvan xanı, nəinki xərac verməkdən imtina etdi. O həmçinin Fətəli şahı İranın hökmdarı kimi də tanımadı[1].

Kəlbəli xanın Naxçıvana gəlməsi ilə Sisianovun 1803-cü il fevralın əvvəllərində Tiflisə gəlməsi eyni vaxta təsadüf edir. Sisianov Naxçıvanda və İrəvanda Kəlbəli xanın çox böyük hörmətə malik olduğunu bilirdi. O, həm də bilirdi ki, şah Kəlbəli xana zahiri də olsa pis münasibət bəsləmir. Sisianov ilk növbədə bundan istifadə etməyə çalışdı: uzun müddət idi ki, ermənilərin katolikosu Danil Tehranda həbsdə saxlanılırdı. Cənubi Qafqaz ermənilərinin etimadını qazanmaq məqsədilə Sisianov naxçıvanlı Kəlbəli xanın vasitəsilə Danili İrəvana qaytarmağı qərara aldı. Bu istəklə də o, 6 fevral 1803-cü ildə məktubla Kəlbəli xana müraciət etdi.

Çox güman ki, bu məktubdan sonra Kəlbəli xan İrəvana getmiş və katolikos-xəlifə Danilin geri qayıtmasına nail olmuşdur. Lakin irəvanlı Məhəmməd xan Danili İrəvana buraxmamışdır. Çünki bu həmən "Üç kilsə"ni özü tərəfindən təyin edilmiş David adlı başqa bir erməni ruhanisi idarə edirdi. İrəvanlı Məhəmməd xanın belə hərəkəti Sisianovun ciddi narazılığına səbəb oldu. Rus

---

[1] П.Зубов. Подвиги русских воинов в Кавказских странах. СПб., 1835, стр. 72.

komandanlığının qəzəbləndiyindən xəbər tutan Məhəmməd xan danışıqlar aparmaq məqsədi ilə Tiflisə öz nümayəndəsi Məhəmməd Əli bəyi göndərdi. Sisianov da öz növbəsində 1804-cü il may ayının 5-də Kəlbəli xanın adına yazdığı məktubu göndərdi. Məktubda deyilirdi: "Sizin Rusiya ilə münasibətinizin yaxın olmasından razılığımı bildirirəm" [1] . Sonra isə məktubda Məhəmməd xanın ünvanına yazılmış hədələyici sözlərlə əlaqədar o, Kəlbəli xana yazır ki, onun narazılığını Məhəmməd xanın nəzərinə çatdırsın: "1-ci, hər şeydən əvvəl Davidlə gedən hər cür danışıqlar kəsilməli və patriarx Danil öz yerinə bərpa olunsun; 2-ci, qala, rus orduları tərəfindən tutulduqdan sonra xana qalada və ya qaladan kənarda yaşamağa sərbəstlik veriləcəkdir; 3-cü, xan rus imperatorunu özünün dövləti kimi qəbul etməli və sədaqətli olacağına and içməlidir; 4-cü, xan 80 min manat həcmində xərac verməli və hər il bu xəracı iki müddətdə - birinci yarısını Novruzdan bir gün keçdikdən sonra, ikinci yarısını isə iyul ayından sonra ödəməlidir.Bunun müqabilində xan əgər sadiq olarsa, əvvələn öz hüququnda qalacaq və rəisliyini davam etdirəcəkdir; 2-ci, imperator xanlıq hüququ barədə şəhadətnamə verəcək ki, bu da onun təhlükəsizliyini təmin edəcəkdir; 3-cü, bütün imkanlardan istifadə ediləcək ki, xanın ailəsi İrandan gətirilsin"[2].

Göründüyü kimi, rus komandanlığı Kəlbəli xandan istifadə edərək onun vasitəsilə irəvanlı Məhəmməd xana təsir göstərməklə İrəvan xanlığını ələ keçirib "Üç kilsə" monastırına daha etibarlı Danili xəlifə vəzifəsinə bərpa etmək istəyirdi. Bununla rus komandanlığı çalışırdı ki, Cənubi Qafqazda xristianların, xüsusilə hələ o vaxt dünyanın bir çox ölkələrinə yayılmış ermənilərin hüsn-rəğbətini qazansın. Lakin bunu o zaman həyata keçirmək mümkün

[1] AKAK, 1271-ci sənəd, səh. 639.
[2] AKAK, II c., 57-ci sənəd (1803), vər. 1- 4.

olmadı.

Məhəmməd Əli bəy Sisianovun təkliflərini qəbul etmədi, beləliklə də danışıqlar heç bir nəticə vermədi [1]. İrəvan xanının nümayəndəsi geri qayıtdıqdan sonra Aisianov İrəvana öz nümayəndəsini -Tomas Orbelianini göndərdi ki, bəlkə o, Məhəmməd xanla şəxsən görüşdükdə onun bir qədər bundan əvvəl Məhəmməd Əli bəyə edilən təklifləriylə razılaşmasına nail olsun. Lakin T.Orbelianinin danışıqları da nəticəsiz qaldı. Məhəmməd xan T.Orbelianinin Rusiyanın təbəəliyini qəbul etmək haqqındakı təklifini də rədd etdi.

T.Orbeliani İrəvandan əliboş qayıtdıqdan sonra rus qoşunlarının qərargahında elə qənaətə gəlinirdi ki, Rusiya öz məqsədinə ancaq silaha əl atmaq yolu ilə nail ola bilər. Maraqlıdır ki, hadisənin belə cövlan etməsi İrəvanda məskunlaşmış və alver sayəsində varlanmış erməniləri heç də təmin etmirdi.Onlar müharibə baş verərsə, var- yoxdan çıxmaqlarından ehtiyat edirdilər. Odur ki, İrəvandakı ermənilər Abram Məlik Ağamoğlan və yüzbaşı Qabriel Qeqematsk Qarabağdan Tiflisə qaçmış Vərəndənin sabiq məliyi Cəmşid Məlik Şahnəzəryana məktubla müraciət edərək ondan xahiş etdilər ki, o Sisianovu İrəvan xanı ilə müharibə etməkdən yayındırıb Məhəmməd xanla sülh bağlamağa sövq etsin[2].

Bu zaman İrəvan xanlığı ağır günlər keçirirdi. İrəvanlı Məhəmməd xanın İran və Rusiya arasında apardığı ikitərəfli siyasət ifşa olunmuşdu. Xan iki od arasında qalmışdı. Onun aldığı məlumata görə İran sərbazları İrəvan istiqamətində hərəkət edirdilər, digər tərəfdən Cənubi Qafqazdan da həyəcanlı xəbərlər gəlirdi. 1803-cü

---

[1] Yenə orada, 1216-cı sənəd.

[2] AKAK, 2-ci fond, 1-ci siyahı, 49-cu sənəd, vər. 36.

ilin martında rus qoşunları Car-Balakən icmasını zəbt etdikdən sonra, 1804-cü ilin yanvarında qəddarlıqla Gəncə xanlığını işğal edərək, İrəvan üzərinə hücum etməyə hazırlaşırdılar.

1804-cü ilin martında irəvanlı Məhəmməd xan İran qoşunlarının İrəvan xanlığı istiqamətində hərəkət etdiklərini bildikdən sonra təcili surətdə Rusiya ilə münasibətlərini nizama salmağa səy göstərdi. Onun Tiflisə göndərdiyi qasid Sisianova bildirdi ki. Məhəmməd xan ruslara xidmət etmək arzusundadır. Bunun əvəzində Məhəmməd xan Sisianovdan xahiş edirdi ki, öz qoşunları ilə İrəvan xanlığına yaxınlaşan sərbazların qarşısını alsın. Sisianov İrəvan xanının xahişinə əməl edəcəyinə o şərtlə razılıq verdi ki, Məhəmməd xan "Üç kilsə" monastırının xəlifə taxtında rusların istədikləri kimi Danili oturtsun. Məsələ burasındadır ki, bundan əvvəl "Üç kilsə" monastırında xəlifə vəzifəsini daşıyan ruspərəst İosif Arqutinski qəflətən öldükdən sonra Məhəmməd xan həmin vəzifəyə ona sadiq olan Davidi xəlifə təyin etmişdi. Bu isə rusları təmin etmirdi. Onlar Davidi Danillə əvəz etməyə çalışırdılar. Sisianovun şərtlərindən biri də o idi ki, Məhəmməd xan İrəvan xanlığında 500 nəfər rus soldatının yerləşməsinə razılıq versin. Sisianovdan İrəvana məktub gəlməzdən əvvəl Məhəmməd xan həbsdə saxladığı və ölümlə cəzalandırmağı qərara aldığı mənşəcə erməni olan yüzbaçı Qabriel Qeqematsini həbsdən azad edərək rusların Cənubi Qafqazdakı qərargahına göndərdi ki, o ruslardan İrəvan xanlığı üçün hərbi kömək diləsin.

Məhəmməd xanla Sisianovun arasında gedən məktublaşma heç cür rus ordusunun komandanını təmin etmədi. Çünki Məhəmməd xan nə "Üç kilsə" xəlifəsini dəyişməklə, nə də rus qoşunlarının İrəvan qalasına daxil olmaları ilə razılaşmadı. Eyni zamanda İrəvan xanı cənubdan təhlükənin yaxınlaşması ərəfəsində ruslarla əlaqəni də kəsmək istəmirdi. Odur ki, 1804-cü ilin aprelində yenidən naxçıvanlı

Kəlbəli xan, yüzbaşı Qabriel və İoannes vasitəsilə Sisianova müraciət etdi. Məhəmməd xanın yeni təklifinə görə rus qoşunları İrəvan xanlığına daxil ola bilərlər, yalnız o şərtlə ki, onlar "Üç kilsə" monastırının ətrafında və yaxud, Şərur mahalında yerləşsinlər.İrəvan qalasına yalnız Sisianovun nümayəndəsi daxil ola bilər ki, Məhəmməd xanın I Aleksandrın hökümətinə sadiq olması haqqında, onun andiçmə mərasimində iştirak edə bilsin. Bununla belə, Məhəmməd xan bildirdi ki, o, İrəvan xanlığını Rusiyaya tabe etmək fikrində deyildir. Bu baxımdan o, xanlığı eyni dinə xidmət etdiyi İranın sərəncamına verməyi daha üstün tutur; şah onu xan kimi tanımağa söz verdiyi halda, xristianlar onu hakimiyyətdən məhrum edə bilərlər

Danışıqlar zamanı, Qabriel və İoannes Sisianovdan xahiş etdilər ki, hələlik Məhəmməd xanın təklifi ilə razılaşsın; xanlığın ərazisinə rus qoşunlarının daxil olmalarına xan razılıq verib, sonrası asan olar. Hadisələrin sonrakı gedişi göstərir ki, Məhəmməd xan belə hərəkətləri ilə vaxt udmaq və hərbi toqquşmanın qarşısını almağa çalışırdı.

İran qoşunlarının İrəvan xanlığına yaxınlaşmaları və Məhəmməd xanın diplomatik manevri bir daha göstərdi ki, xanlığı silah gücü ilə almaq vaxtı gəlib çatmışdır. Bu məsələnin həllini uzatmaq Gürcüstanın sərhədləri üçün də təhlükə yaradırdı.

Beləliklə, 1804-cü il may ayının sonlarında başda Sisianov olmaqla rus qoşunları İrəvan xanlığının sərhədlərinə yaxınlaşdılar. Rus komandanlığının bu yürüşdə əsas məqsədi İranı Cənubi Qafqaza buraxmamaq, böyük strateji əhəmiyyətə malik olan İrəvanı almaqla özünün Cənubi Qafqazda gələcək ağalığı üçün zəmin yaratmaqdan ibarət idi. İrəvanı almaqla Rusiya həm bu bölgədə öz mövqeyini möhkəmlədər, həm də Türkiyə və İran sərhədlərində özü üçün möhkəm sədd yarada bilərdi.

Məhz bu məqsədlərə nail olmaq əzmində olan çarizm Gürcüstanı ələ keçirdikdən sonra bütün Cənubi Qafqaza sahib olmaq üçün hərbi hazırlıq görürdü.

İrəvan xanlığı barədə eyni hərbi hazırlıq İranda da aparılırdı. İranın hakim dairələri elə düşünürdülər ki, İrəvan xanlığına sahib olduqdan sonra, onlar asanlıqla Gürcüstana qoşun çəkərək rusları oradan qovub, Cənubi Qafqazı ələ keçirmək üçün özlərinə əlverişli zəmin yarada bilərlər. Bu məqsədlə İranda təcili surətdə 20000-lik qoşun hazırlandı. İran sərbazlarına başçılığı şah öz oğlu və vəliəhdi Abbas Mirzəyə həvalə etdi.

Rus qoşunlarının həmləsini dəf etmək üçün irəvanlı Məhəmməd xan da ciddi hazırlıq görürdü. İrəvan qalasının müdafiəçilərinin sayını o, 7000-ə çatdırdı. Qala divarlarında 22 top bərkidildi. Xan həmçinin qalanı uzun müddətə ərzaq və döyüş sursatı ilə təmin etdi.

Erməni tarixçisi Z.T.Qriqoryanın yazdığına görə Məhəmməd xan ruslara meyil göstərən erməniləri zorla İrəvan xanlığından İranın və Türkiyənin ərazilərinə köçməyə məcbur etdi. Bircə bu fikir uydurmadan başqa bir şey deyil. Çünki, İrəvanda yaşayan azsaylı ermənilər tədqiq olunan dövrdə heç bir qüvvəyə malik deyildilər. Təkcə onu qeyd etmək kifayətdir ki, "Üç kilsə" monastırının taleyini də o zaman xan müəyyən edirdi.

Beləliklə, göründüyü kimi İrəvan qalasını zəbt etmək üçün həm Rusiyada, həm də İranda ciddi hərbi hazırlıq işləri görülürdü. Lakin bu sahədə ruslar daha cəld hərəkət edərək İranı qabaqlamaq istəyirdilər.

1804-cü il mayın əvvəllərində Sisianov Qafqaz qrenader, muşketyor, 9-cu yeger və Narva draqun alaylarına Tiflisdə cəmləşmələrini əmr etdi. Tiflis muşketyor polkuna isə Pəmbəkə gedib orada yuxarıda adları çəkilən alayları gözləmək tapşırıldı.

İrəvan qalasının üzərində qara buludlar göründüyü zaman Məhəmməd xanın qasidi Sisianovun düşərgəsinə gedərək bildirdi ki, o heç zaman ruslara pis münasibət bəsləməmiş və Rusiyanın sadiq dostu olmaq arzusudadır.

Məhəmməd xanın adamları Sisianovun yanına gəldikləri zaman Tiflisdə İrəvana ciddi hazırlıq gedirdi. Odur ki, Sisianov Məhəmməd xanın nümayəndəsini çox soyuq qarşıladı. O belə güman etdi ki, Məhəmməd xan belə hərəkətləri ilə vaxt udmaq istəyir ki, İrandan sərbazlar onun köməyinə gəlib çata bilsinlər. Odur ki, 1804-cü il mayın 29-da Sisianovun əmrinə əsasən, rus soldatları general-mayor Tuçkovun başçılığı altında İrəvan qalası istiqamətində hərəkət etdilər. Onların ardınca Sisianovun komandası altında yerdə qalan polklar həmin istiqamətdə yola düşdülər.

İrəvana hərəkət edən rus qoşunları Qafqaz qrenader alayından, iki batalyon Tiflis muşketyor alayından, iki batalyon Saratov muşketyor alayından ibarət idi. Yürüşdə həmçinin süvarilər-üç eskadron Narva draqun alayı, 350 kazak və 1020 yerlilər, cəmi 4370 döyüşçü iştirak edirdi..

Rusiyanın Cənubi Qafqazda fəallaşmasına biganə qala bilməyən İran dövlət rus qoşunlarının həmin bölgəni tərk etmələrini tələb etdi.Təbiidir ki, Rusiya İranın belə tələbinə əməl edə bilməzdi. Beləliklə, 1804-cü il iyun ayının 10-da İranla Rusiya arasındakı diplomatik münasibətlər pozuldu və tarixdə məşhur olan birinci Rusiya – İran müharibəsi başlandı.Əvvəlcə Fransa və sonradan İngiltərə tərəfindən müharibə etməyə təhrik olunan Fətəli şah qoşunlarını Cənubi Qafqaza, ilk növbədə İrəvan xanlığı istiqamətində hərəkət etdirdi. Sisianov İran sərbazlarının hərəkətinin qarşısını almaq məqsədilə öz qoşunlarını sərhəd boyu dörd istiqamətdə yerləşdirdi. Daha sonra onun əmrinə əsasən İrəvan qalası ətrafındakı evlərin gildən tikilmiş hasarları söküldü. Orada yerləşən

məscidi Sisianov özü üçün iqamətgah seçdi. Məscidin yaxınlığında yerləşən iki karvansaranı ələ keçirən soldatlar buradaakı İrəvan döyüşçülərini məhv etdilər. Sisianov ixtiyarında olan topları qala divarlarına atəş məsafəsində yaxınlaşdıraraq, özü də məscid və hamam yerləşən sahədə rəhbərlik edəcək topunu quraşdırdı.

Toplar əlverişli mövqe tutduqdan sonra əmri ilə İrəvan qalasına atəş açıldı. Bütün günü hər topdan bir saatdan bir on ədəd qumbara atıldı.

Rus qoşunlarının sərəncamında yarım pudluq[1] 4 ədəd, ¼ pudluq 4 ədəd, 3funtluq 4 ədəd, 12 ədəd müxtəlif toplar və funtluq mortira var idi.

İrəvan qalası Zəngi çayının kənarındakı ən yüksək təpədə salınmışdı. Çay tərəfindəki qala divarı yerdə qalan divarlardan zəif idi. Qalanın digər divarları, ikiqat hasarlardan ibarət idi. Kərpic və daşdan hörülmüş qala divarları, həm hündür, həm də qalın idi. Birinci qala divarı ilə ikinci divarın arasındakı məsafə 15 və yaxud 20 sajenə[2] bərabər idi. Divarlar arasındakı xəndək su ilə doldurulurdu. Qalanın 17 bürcü var idi. İrəvan qalasının divarları üstündə qurulmuş 60 topdan yalnız 20 –si saz şəkildə idi. İrəvan qalasında iki və üç mortira da qurulmuşdu.Qalanı müdafiə edən qarnizon 7000 nəfərdən ibarət idi. Buraya İrandan dəxi 800 sərbaz gəlmişdi.

Bombardmanın üçüncü günü İrəvan qalasından Məhəmməd xanın göndərdiyi nümayəndə Sisianovun qərargahına gələrək ona xanın adından bildirmişdir:

1. Xan təəssüf edir ki, özü Sisianovun hüzuruna bir dost kimi gələ bilməmişdir.

2. Xanın Rusiyanın himayəsini qəbul etməkdən başqa heç bir

[1] P u d – 40 girvəngəyə və ya 16 kiloqrama bərabərdir.
[2] S a j e n – 3 arşına və ya 2,134 metrə bərabərdir.

arzusu yoxdur.

3. Xan, 6 il ərzində Gürcüstana verməli olduğu 40000 gümüş manatı Tiflisə göndərməyə söz verir.

4. Xan, qala divarlarından rus qoşunlarına toplardan açılan atəşə görə üzr istəyir və bu işdə şəhərdəki "müsəlmanları" təqsirləndirir.

İrəvan qalasından gələn nümayəndə, həmçinin rus qoşunlarına rus sərkərdələri arasında yaşca böyük olan general – mayor Tuçkova da xanın adından məktub verdi.

Arxiv sənədlərindən belə qənaətə gəlmək olar ki, Sisianov Məhəmməd xanın nümayəndəsi ilə kobud rəftar etmiş, onu, eləcə də İrəvan xanını əməlli – başlı söymüş və bildirmişdir ki, bir saat ərzində xan "Üç kilsə" monastırından apardığı xəzinəni və əsir etdiyi "Üç kilsə" xəlifələri David və Danili qaytarmasa, o, xanla İrəvan qalası və şəxsən onun taleyi haqqında heç bir danışıq aparmayacaqdır.

Xanın nümayəndəsi qalaya qayıtdıqdan sonra oradan Sisianova heç bir cavab gəlmədi.

Bunun əksinə olaraq, İrəvan ətrafına ehtiyatda olan rus qoşunları gəldilər. Onların gəlişi qala divarlarından açılan yeni top atəşlərinə səbəb oldu. Beş gündən sonra İran tərəfindən gələn sərbazlar rus qoşunları üçün ərzaq və sursat daşıyan arabalara qəflətən hücum edərək 20 soldatı qətlə yetirdilər, dördünü isə əsir etdilər.

Artıq vaxt itirmək məğlubiyyətə bərabər idi. Sisianovun əmrinə əsasən hər rota özü üçün üç ədəd hücum pilləkəni hazırlamalı idi.Pilləkənin uzunluğu 13 və ya 14 arşın olmalı idi. Pilləkənlər elə quraşdırılmalıydı ki, onunla eyni zamanda bir-biri ilə yanaşı üç soldat qalxa bilsin. Rus soldatları Sisianovun əmrini ağır şəraitdə həyata keçirirdilər; həm hava xeyli isti keçirdi, həm də onların yemək

azuqələri gündən-günə azalırdı. Knyaz Sisianov elə qərarlaşdırmışdı ki, İrəvan qalasını aldıqdan sonra şəhərdə və "Üç kilsə" monastırında bir polk soldat qoyub, Naxçıvan istiqamətində hərəkət etsin, buranı aldıqdan sonra qalada bir polk soldat qoyub Tiflisə yollansın. Ərzaq çatışmazlığına gəldikdə isə o elə fikir edirdi ki, gürcü knyazı Çavçavadze bu sahədəki əyər-əskikliyi düzəldəcək.

Rus qoşunları İrəvan ətrafında olarkən gözlənilmədən İran şahına tabe olmaqdan imtina edən Xoy xanlığının hakimi Cəfərqulu xan 200 atlısı ilə onlara qoşuldu[1].

Qalaya qəti hücum etməzdən əvvəl rus qoşunları oraya hər gün arabir 5-dən 10-a qədər toplardan atəş açırdılar. Bu topların güllələrinin məhdudluğuna dəlalət edirdi. Sisianov əvvəlcə əlavə top güllələri gətirmək üçün 100 nəfər piyada ilə kapitan Spıtkovu Pəmbəkə göndərdi. Düşmən düşərgəsində də mürgüləmirdi. Ətrafda İrandan gələn süvarilərin sayı gündən-günə çoxalırdı.

İrəvan qalasından gələn xəbərlərdən müəyyən etmək olurdu ki, tezliklə oraya 50000 döyüşçü ilə şəxsən şahın özü gələcəkdir. Həbsdə olan və rusların hakimiyyəti ilə barışmayan gürcü knyazlarının qaçması xəbəri də rus ordusunun komandanını narahat edirdi. Bununla əlaqədar olaraq, Sisianov qaçmağa macal tapmayan gürcü knyazlarından Rusiya ordenlərinin kavaleri knyaz Tomas Orbeliani və İmereti çariçası Annanın qardaşının qarovulunu gücləndirdi. Rus qoşunlarının ərzaq çatışmazlığı "Üç kilsə" monastırının buğda ehtiyatı hesabına müəyyən qədər ödənilirdi. Atları ətrafda ot olmadığından bağ-bağçalardan yığılan yarpaq ilə yemləyirdilər. Lakin bu süvari və qoşqu atlarını təmin edə bilmirdi.

İyulun 14-də Cəfərqulu xan Sisianova çatdırdı ki, aldığı məlumata görə İrəvan xanlığına yaxınlaşan Fətəli şahın sərbazları rus

---

[1] Bu barədə daha ətraflı bax: N.Ç.Mustafayeva. Cənubi Azərbaycan xanlıqları. Bakı, 1995.

qoşunlarına iki tərəfdən zərbə endirəcəkdir. Bunu eşidən Sisianov qoşunların sağ cinahını müdafiə etməyi general-mayor Portnyaginə,sol cinahın müdafiəsini isə general-mayor Leontyevə tapşıraraq hərəsinin öhdəsinə 400 soldat verdi. Elə bu zaman Pəmbəkə hərbi sursat gətirmək üçün gedən Spitkov da gəlib çıxdı. O özü ilə 800 ədəd top gülləsi gətirmişdi.

İyul ayının 15-də səhər tezdən Fətəli şahın başçılıq etdiyi sərbazlar rus qoşunlarının sol cinahına hücum etdilər. Bu döyüş sərbazların rus qoşunları ilə səkkizinci toqquşması idi. Əvvəlki döyüşlər az əhəmiyyətli olduğu üçün sənədlərdə bu barədə demək olar ki, məlumat yoxdur.

Döyüşə girişən İran sərbazları üç dəstəyə bölünmüşdülər. Dəstələrdən biri general-mayor Leontyevin soldatlarına sol tərəfdən hücum edib düşməni geri çəkilməyə məcbur etdilər. Daha sonra sərbazlar sağ tərəfdə mövqe tutan poruçik Niqdanovun başçılıq etdiyi 40 nəfər seçmə soldatın-qrenaderin üzərinə hücum etdilər. Sərbazların həmləsini rus döyüşçüləri güllələri qurtarana kimi dəf edə bildilər. Beləliklə, sərbazlar rus qoşunlarının istehkamını ələ keçirə bildilər. Lakin tezliklə mayor Tokerev 60 soldatla sərbazları geri çəkilməyə məcbur etdi. Eyni zamanda general-mayor Tuçkov bundan əvvəl məğlub olmuş general-mayor Leontiyevə üç dəfə kömək etdi, nəticədə rus soldatları sərbazları məğlubiyyətə uğratdılar.

Rus qoşunları müəyyən uğurlar əldə etdikləri vaxt düşmən böyük qüvvə ilə mayor Noldenin başçılıq etdiyi rus soldatlarının üzərinə həmlə etdi. General Tuçkovun toplardan açdırdığı atəş düşmənin irəliləməsinə mane törədə bilmədi. 6 saat davam edən döyüşdə Nolden geri çəkilmədi. Düşmənin başqa dəstəsi Zəngi çayı tərəfdən rus qoşunlarına basqın etdi. Polkovnik Sekanskinin başçılıq etdiyi rus soldatları ciddi müqavimət göstərərək öz mövqelərini saxlaya bildilər. Düşmən bir bayraq və bir neçə sərbaz itirərək geri

çəkilməyə məcbur oldu.

Sərbazların dəstələrindən biri general-mayor Portnyağinin mövqeyinə və onu müdafiə edən general-mayor Tuçkovun və general-mayor Simenoviçin döyüşçülərinin üzərinə uğursuz həmlə etdi.

Sərbazların etdikləri zahiri fəallıqdan ruhlanan İrəvan xanı Məhəmməd xan öz qoşunları ilə qaladan çıxaraq ruslara sağ cinahdan hücum etməyə səy göstərdi. Lakin onun döyüşçüləri rus soldatlarının süngüsü ilə qarşılaşaraq müqavimət göstərə bilməyib böyük itki verə-verə qala divarlarının arxasında gizlənməyə məcbur oldu.

Bütün bu hadisələr baş verdiyi zaman rus ordusunun komandanlığı İrəvan qalasını aramsız bombardman etməkdən qalmırdı.

İrəvan qalasının müqaviməti iyul ayının 15-də səkkiz saat davam etdi. Bu döyüşdə rus döyüşçüləri 3 zabit, 120 kiçik zabit itirdi, həmçinin 6 nəfər zabit və 200 nəfər kiçik zabit yaralandı.

Rus qoşunları İrəvan qalasına hücum etdikləri müddət ərzində Sisianov məsciddəki iqamətgahda oturub bir dəfə də olsun küçəyə çıxıb uzaqdan-uzağa da olsun döyüşü izləmirdi.

Həmin savaşdan sonra İran və İrəvan xanlığının döyüşçüləri rus soldatlarının mövqelərini mühasirəyə almağa müvəffəq oldular. Hadisənin belə şəkil alması rus qoşunlarının vəziyyətini xeyli ağırlaşdırdı.

Knyaz Sisianov rus qoşunlarına kömək etmək məqsədilə ətraflarda qalaların tikilməsini əmr etdi. Lakin həmin yerlərdə suyun olması bu əmrin həyata keçməsinə mane oldu.

Rus komandanlığının düşmənlə fəal mübarizə aparmasının bir neçə səbəbləri vardı. İran sərbazlarının hücumundan iki gün əvvəl Sisianovun qərargahına Tiflisdən başda İvan Orbeliani olmaqla 200 döyüşçü ilə 30 gürcü knyazı da gəldi. Tiflisdən gələnlər Gürcüstan

torpağında rusların əleyhinə üsyan baş verdiyini bildirdilər. Həmin üsyana gürcü şahzadələrindən Yupon və Parnoy başçılıq edirdilər. Onlar bir ovuc gürcü zadəganlarının və iranpərəst feodalların mənafeyini müdafiə edirdilər. Onların müvəffəqiyyət əldə etmələri Gürcüstanın İran və Türkiyə arasında bölünməsinə gətirib çıxara bilərdi.

1804-cü ilin iyulunda Qafqaz dağlıları üsyan qaldırdılar. Nəticədə müvəqqəti də olsa Rusiya ilə Gürcüstanın əlaqəsi kəsildi. Bütün bu xoşagəlməz hadisələr Sisianovun İrəvan qalası ətrafındakı fəaliyyətini xeyli məhdudlaşdırdı. Sisianov bilmirdi İrəvan qalasının mühasirəsindən əl çəksin və yaxud düşmənə təzyiqini artırsın. Elə bu zaman onun cənubdan aldığı məlumat rus qoşunlarında qələbəyə inamı çoxaltdı. Onun eşitdiyinə görə düşmən düşərgəsində yaranmış çaxnaşma nəticəsində sərbazlar nizamsız halda İrana qaçmağa başlamışlar. Yaranmış belə əlverişli şəraitdən istifadə etməyə çalışan Sisianov general-mayor Portnyaginə 700 soldat ilə düşmən düşərgəsinə hücum etməyi əmr etdi. Eyni zamanda Cəfərqulu xan 200 nəfər öz döyüşçüsü, 100 nəfər gürcü döyüşçüsü və 100 nəfər kazakla sərbazlara qarşı həmlə etdi.

Portnyagin və Cəfərqulu xanın başçılıq etdikləri qoşunlarla sərbazların toqquşması rus soldatları üçün uğursuz oldu. Buna görə də onlar İrəvan tərəfə dönməli oldular. Məhəmməd xan İrəvan ətrafında rus qoşunlarının azalmasından istifadə edərək qaladan çıxmış və mayor Noldenin rəhbərlik etdiyi topxananı darmadağın etmişdir... Eyni zamanda İrəvan qalasına 800 nəfər İran döyüşçüsü daxil oldu. Qaladakılar onlara köməyə gələn sərbazları şadlıqla qarşıladılar.

Gecə İrəvana daha 15000 sərbaz daxil oldu. Gecəyarısı isə qala ətrafında general-mayor Portnyagin öz qoşunlarını cəmlədi. Bundan əvvəlki toqquşma zamanı o, 50 nəfər soldat itirmişdi, 100

nəfər rus soldatı isə xəsarət almışdı.

İki gündən sonra İrəvan ətrafında yerləşən rus soldatları üçün Pəmbəkdən ərzaqlarla dolu gələn nəqliyyata sərbazlar basqın etdilər.Bundan tutan Sisianov ərzaq gətirənlərə kömək məqsədi ilə 400 soldatla general- mayor Leontyevi sərbazların üzərinə göndərdi. Beləliklə, Pəmbəkdən gətirilən ərzaq mənzil başına çatdırıldı. Lakin gətirilən ərzaq rus qoçunlarına yalnız altı gün çata bilərdi. Odur ki, Sisianov soldatların yerləşdikləri bölgədə buğda axtarmağı əmr etdi. Onun eşitdiyinə görə yerli əhali buğdalarını iri həcmli küplərdə yerə bastırırdılar. Bu həqiqətən belə idi. Sisianov belə buğda tapanları 50 qəpik gümüş pulla mükafatlandıracağına boyun olmuşdu. Lakin bu tədbir də heç bir nəticə vermədi. Bundan sonra o, ərzaq ardınca Pəmbəkə yenə soldat göndərməyə məcbur oldu. Soldatlara bu dəfə kapitan Spıtkov başçılıq edirdi. Eyni zamanda podpolkovnik Durkov Tiflisə göndərildi ki, oradan İrəvan ətrafındakı rus soldatları üçün 50 günlük ərzaq gətirsin. Spıtkov və Durkov 1804-cü ilin iyulunda yola düşdülər.

Sisianovun qoşunlarına qoşulan İrəvan erməniləri baş komandana çatdırdılar ki, "Üç kilsə" monastırının ətrafında əkilmiş, lakin yığılmamış buğda zəmiləri vardır. Bu xəbəri eşidən Sisianovun əmri ilə həmin yerə buğda yığılıb üyütmək üçün də bir dəstə soldat göndərildi. Lakin rus ordusu komandanlığının bu tədbiri də kömək edə bilmədi. Çünki rus qoşunlarından əvvəl "Üç kilsə" ətrafındakı zəmilərə sərbazlar gəlmiş, olan-qalan buğdanı özləri üçün, samanı isə süvari atlar üçün toplamışdılar.

İran komandanlığı rus soldatlarının yerdə qalan buğda və samanı topladığını bilib ora sərbazları göndərdi ki, zəmiləri yandırsınlar. Belə bir ağır şəraitdə rus soldatları 30 girvənkədən çox buğda yığa bilməyib geri dönməyə məcbur oldular. Əlacsız qalan soldatlar nəqliyyat heyvanları üçün yeməyə yarpaq toplamaq üçün

bağlara səpələndilər. Bundan xəbər tutan sərbazlar gözlənilmədən soldatların üzərinə hücum edərək onlardan 4 nəfərini qətlə yetirdilər, 2 nəfərini isə əsir aldılar. Bundan əlavə, İran qoşunları Saratov polkuna məxsus olan atları da zəbt etdilər.

Dəhşətli aclıq zabit və soldatlara da öz təsirini göstərirdi. Arxiv sənədlərində hər gün rus qoşunları arasında 10 və yaxud 20 nəfərin acından ölməsi barədə məlumat vardır. Soldatların ölümünü havaların həddən artıq isti keçməsi, onların istirahət etməkdən məhrum olmaları da sürətləndirirdi. Soldatlar üçün nəzərdə tutulmuş 6 günlük bir tikə çörəyi onlara 8, çox vaxt isə 9 günə verirdilər.

Zabitlərin vəziyyəti soldatlara nisbətən daha ağır idi. Əgər soldatlara az da olsa bir dişləm çörək verirdilərsə, zabitlər ondan da məhrum olurdular.Hərbi əməliyyatların üzündən bu bölgəyə nə tacirlər gəlirdilər, nə də yerli əhali alver edirdi. Zabitlər bu yerlərdə ticarətin canlanması üçün çalışdıqları halda, heç bir nəticə əldə edə bilmədilər. Əgər "Üç kilsə" monastırı ətrafında yaşayan ermənilər əldə etdikləri buğdanı gizlincə zabitlərə satırdılarsa, bu da bəs etmirdi. Ermənilər bir funt unu rus zabitlərinə bir abbası, ya da 34 qəpiyə satırdılar. Bu rəqəm o dövrdə böyük məbləğ idi.

Avqustun 7-də sərbazların etdikləri həmlə nəticəsində soldatların üçü qətlə yetirildi, beşi yaralandı. Bu əməliyyat nəticəsində sərbazlar 70-ə yaxın süvari atı ələ keçirmişdilər.

Yeri gəlmişkən onu da qeyd edək ki, rus qoşunları Gəncə qalasını zorla zəbt etdikləri zaman, oraya Tiflisdən xeyli tacir də gəlmişdi ki, şəhər alınarkən rus soldatlarının qarət etdikləri əşyanı onlardan ucuz qiymətə alsınlar. Çox güman ki, gürcü tacirləri o vaxt öz arzularına çatmışdılar. Çünki rus qoşunları İrəvanı mühasirəyə aldıqları zaman Tiflisdən oraya yenə də qarət olunmuş ucuz mal ardınca xeyli tacir gəlmişdi. Lakin bu dəfə onların arzuları ürəklərində qaldı. Rus qoşunlarının uğursuz əməliyyatından sonra

Tiflisdən gələn tacirlər geri dönməli oldular. Lakin evlərinə qayıdarkən İran sərbazları onları haqlayaraq bir qismini əsir alıb, yerdə qalanını qətlə yetirdilər.

Tiflisdən Sisianovun düşərgəsinə gürcü knyazları ilə gələn general-mayor knyaz Orbeliani də geri qayıtmağa məcbur oldu. Sisianov onlar üçün heç bir ərzaq ayırmır və onlarla kobud rəftar edirdi.Avqustun 9-da o, Tiflisə qayıdarkən özü ilə birlikdə oradan gəlmiş 200 nəfəri aparmalı oldu.

Bundan xəbər tutan və Rusiya ağalığı ilə barışmayan Pəmbək hakimi Naçibəy sərbazlarla birlikdə onların üzərinə hücum edərək, çoxunu qətlə yetirdi, knyazlardan Orbelianini, Baqrationu və başqalarını əsir edib özü ilə apardı.

Pəmbək mahalının Qarakilsə kəndinə ərzaq toplamaq üçün göndərilən kapitan Spıtkov vəziyyətin belə şəkil almasını görüb, az miqdarda topladığı ərzaqla kifayətlənərək geri dönmədi.

Avqustun 22-də Sisianov ərzaq ardınca yenidən "Üç kilsə" monastırına mayor Levitskinin komandanı altında 100 nəfər soldat göndərdi.

"Üç kilsə" monastırına sağ – salamat çatan Levitski lazım olan ərzağı toplayıb geri dönərkən qəflətən çoxsaylı sərbazların hücumuna məruz qaldı. Levitski ərzaqla dolu arabalarla qala şəklində tikilmiş "Üç kilsə" monastırına qayıtmalı oldu. Lakin nəyin bahasına olursa olsun Levitski ərzağı İrəvan ətrafında yeməkdən məhrum olmuş rus soldatlarına çatdırmaq üçün avqustun 25-də gecə xəlvəti monastırından çıxıb İrəvan istiqamətində hərəkət etdi. Yarı yolda sərbazlar yenidən Levitskinin karvanına hücum etdilər. Yalnız İrəvandan onun köməyinə polkovnik Maykovun rəhbərliyi altında gələn 250 nəfər yegerin köməyi sayəsində Levitski avqustun 26-da 80 kirvəngə unla öz korpusuna gələ bildi. O bildirdi ki, "Üç kilsə" monastırında cəmi 40 kirvəngə düyü və az miqdarda buğdadan başqa

heç bir ərzaq qalmamışdır.

Ərzaq və hərbi sursat barədə hər şeydən ümidi kəsilən Sisianov avqustun 30 –da hərbi şura çağıraraq zabitlərə etiraf etdi ki, qoşunun üç günlük ərzağı qalmış, Gürcüstanla əlaqə kəsilmiş, sərbazlar çoxlu rus soldatını qətlə yetirmişlər. Belə bir şəraitdə İrəvan qalasını almaq mümkün deyil.

Hərbi şura üzvləri Sisianovla yekdil olduqlarını bildirdilər. Sentyabrın 1-də Sisianov axırıncı dəfə Məhəmməd xana İrəvan qalasını təhvil vermək barədə müraciət etdi. Lakin ertəsi gün o yenə də İrəvan xanından rədd cavabı aldı. Yalnız bundan sonra sentyabrın 3-də rus qoşunlarının geri çəkilməsi barədə əmr verildi.Onu da qeyd edək ki, rus qoşunları sakit və itkisiz geri qayıtmadılar. Məhəmməd xanın qoşunları rus soldatlarının mühasirədən əl çəkdiklərini görən kimi qaladan çıxıb onları təqib etməyə başladılar. Geri dönən soldatların vəziyyəti o qədər də yaxşı deyildi. Əvvala, onların kifayət qədər ərzağı yox idi. Digər tərəfdən soldatların arasında xəstəlik baş götürüb gedirdi. Hər polkda 200-dən 300-ə qədər xəstə vardı ki, onlarıda yarıac atlar qoşulmuş arabalarda yerləşdirmişdilər. Lakin xəstələrin sayı o qədər çox idi ki, onları daşımağa arabalar kifayət etmirdi. Ona görə də draqun və kazaklar məcbur olub, atlarını xəstə knyazlara güzəştə gedirdilər. Sisianovun əmri ilə general – mayor Leontyevin komandası altında 1-ci və 2-ci Tiflis batalyonları, general Portnyaginin komandası altında 2-ci Saratov batalyonu, general-mayor Tuçkovun başçılığı altında Qafqaz qrenader batalyonu geri çəkilən rus qoşunlarını düşmən həmləsindən qoruyurdular. Onlar bir neçə dəfə irəvanlı Məhəmməd xanın və Fətəli şahın göndərdiyi dəstələri həmləsini dəf edə bildilər

Böyük çətinliklə "Üç kilsə" monastırına çatan rus qoşunları istirahət etməklə yanaşı, burada ələ keçirdikləri buğda, düyü və s. ərzaq ehtiyatlarını mənimsəməklə kifayətlənməyib, monastırın

xəzinəsinə də əl gəzdirib burada olan daş-qaş, mirvari, qızıl, gümüş və bir çox qiymətli əşyaları da müsadirə etdilər. Ümumiyyyətlə, Sisianovun təşəbbüsü ilə rus qoşunları "Üç kilsə" monastırından 30 tay qarət olunmuş mal aparmışdılar. Sentyabrın 15-də rus qoşunları Qarakilsə kəndinə çataraq İrəvan qoşunlarının və sərbazların təqibindən yaxa qurtardılar. Buradan Tiflisə yola düşərkən rus qoşunları qarşılarında olan maneəni dəf etdilər.İrəvan xanlığının tərkibində Şuragəl mahalının hakimi Budaq- sultan Məhəmməd xanın təhriki ilə tez-tez Gürcüstana basqın edirdi. O, rus qoşunları Tiflis istiqamətində geri çəkilərkən onların da üzərinə hücum etməyə hazırlaşırdı. Bundan xəbər tutan Sisianov Budaq-sultanı "sakitləşdirmək" məqsədi ilə Şuragələ general göndərdi. Budaq-sultan savaşdan vaz keçib İrəvana pənah gətirdi. Rus qoşunları Tiflisə oktyabrın 3-də çatdılar.

Bir qədər xronologiyanı pozub qeyd edək ki, 1805-ci il martın 30-da Budaq –sultanın oğlu Şuragəli general Nesvetyayevə tabe etməklə faktiki olaraq Azərbaycanın bu torpağının Rusiya tərəfindən işğal olunmasını təsdiq etdi. Yeri gəlmişkən onu da qeyd edək ki, I Rusiya – İran müharibəsi dövründə Qarabağ xanlığı Rusiya tərəfindən işğal olunduğu zaman (1805, 14 may) bu xanlığın tərkibində olan İrəvan xanlığının torpaqlarından- Gorus, Qafan, Sisian mahalları da çar Rusiyasının işğal dairəsinə daxil edildi.

Rus qoşunları İrəvan qalasının mühasirəsindən əl çəksələr də, strateji əhəmiyyətə malik olan bu şəhəri işğal etmək, Rusiya hərbi dairələrinin gündəliyindən silinmədi. Rusiyanın belə niyyətindən xəbərdar olan İran hökuməti xarici siyasətində ardıcıl olmayan Məhəmməd xanı dəyişərək, onu Mehdiqulu xanla əvəz etdi. Bu hadisədən sonra Məhəmməd xan özünün yaxın adamlarını Tiflisə göndərərək rus hərbi komandanlığına İrəvan qalasını almağı təklif etdi. O yazırdı ki, İrəvana hakim təyin olunmuş Mehdiqulu xanın

hərbi qüvvəsi çox zəifdir. Məhəmməd xan eyni zamanda ruslara müqavimət göstərdiyi üçün üzr istəyərək, sədaqət rəmzi olaraq girov verməyə hazır olduğunu bildirdi [1]. Lakin cavab gözləyərkən Məhəmməd xan həbs edilib, İrana göndərildi.

1806-cı ilin əvvəllərində Sisianov İrəvan istiqamətində hərəkət etməyi qərara aldı. Lakin Bakı qalası yaxınlığında qətlə yetirilməsi bu tədbirin həyata keçirilməsinə mane oldu.

1806-cı ilin iyun ayında Bakıda öldürülmüş Sisianovun yerinə İ.V.Qudoviç təyin edildi. Qafqazdakı rus qoşunlarının yeni komandanlığına tapşırıldı ki, o təkcə rus qoşunlarının Cənubi Qafqazdakı mövqeyini möhkəmlətməklə kifayətlənməyib, Azərbaycan xanlıqlarının hamısını zəbt edərək ərazilərini rus torpaqlarının tərkibinə əlavə etsin.

Lakin çar Rusiyasının Cənubi Qafqaza təcavüz etməsi təkcə İran və Türkiyənin deyil, Fransa və İngiltərənin də qəti etirazına səbəb oldu. Həmin dövlətlərin hakim dairələri həm Türkiyə və həm də İranı öz xarici siyasətlərinin alətinə çevirməklə, onlardan Rusiya əleyhinə istifadə etməyə çalışırdılar. Napoleon Bonapart ilk növbədə İngiltərəyə də zərbə endirmək üçün planlar hazırlayırdı. O səy göstərirdi ki, İngiltərənin Hindistanda mövqeyini zəiflətsin, Hindistana ən rahat yol Türkiyənin ərazisindən keçdiyi üçün Napoleon çalışırdı ki, Aralıq dənizinin sərhədlərində və eyni zamanda Suriya və Misirdə öz nüfuzunu genişləndirsin. Fransa dövlətinin başçısı həmçinin, istəyirdi ki, İngiltərə və Rusiyanın İranda və Türkiyədə mövqeyini zəiflətsin.

Napoleonun təzyiqi nəticəsində Türkiyə sultanı Səlim Rusiyaya düşmən münasibət bəslədi. Türkiyənin Rusiyaya mənfi münasibəti 1806-cı ilin yayında İstanbulda Napoleonun ən yaxın

---

[1] История XIX века. Под. ред. Лависса и Рамбо, т. II.М., 1937, стр 123-127.

adamlarından general Sebastianın gəlməsi ilə daha da gücləndi.

Sebastiana Parisdə tapşırmışdılar ki, İstanbulda olarkən o, Rusiyanın əleyhinə “Üçlük” ittifaqının (Fransa, Türkiyə, İran) yaradılmasına nail olsun. Napoleon eyni zamanda çalışırdı ki, türklər Rusiya gəmilərinin Bosfordan keçməsinin qarşısını alsın Sebastianın qarşısında duran ən mühüm vəzifə - Türkiyəni Rusiya əleyhinə müharibəyə qaldırmaq idi.

Tezliklə Fransadan Türkiyəyə əsgərlərə təlim vermək üçün çoxlu zabit gəldi. Fransız mühəndislərinin rəhbərliyi ilə Türkiyənin sərhəd bölgələrində hərbi istehkamlar və qalalar inşa olundu. 1806-cı ilin dekabrında Türkiyənin Rusiyaya müharibə elan etməsi də məhz fransızların fəaliyyəti ilə bağlıdır.

Sisianovun Bakı qalası ətrafında öldürülməsi və Fransanın təhriki ilə Osmanlı Türkiyəsinin Rusiya ilə müharibəyə başlaması Abbas Mirzəni yeni hücumlara ruhlandırdı. O, Rusiyanın iki cəbhədə - həm İran və həm də Türkiyə ilə - çətinliklə müharibə apara biləcəyinə ümid bəsləyərək, mayın sonlarında on minlik sərbazla Qarabağ xanlığının ərazisinə soxularaq Şuşa qalası istiqamətində hərəkət etdi. Eyni zamanda rusların hakimiyyəti ilə razılaşmayan II İraklinin oölanlarından biri – şahzadə Aleksandr yeddi minlik qoşunla Qazağa basqın etdi.

Türkiyə ilə müharibə Rusiyanın Cənubi Qafqazda vəziyyətini xeyli ağırlaşdırdı. Rusiya iki cəbhədə müharibə aparmaqdan çətinlik çəkirdi. Vəziyyəti yüngülləşdirmək məqsədilə Qudoviç İranla danışıqlar aparmaq təşəbbüsündə oldu. O, danışıqlar aparmaq üçün İrana kapitan Stepanovu göndərdi. Qudoviçin təklifinə görə Rusiya ilə İran arasında sərhəd İrəvan xanlığı da daxil olmaqla, Kür və Araz çaylarından keçməli idi.

Lakin İranda olan Fransa diplomatları danışıqları pozdu. Rusların səyinin əksinə olaraq Fransa İranla danışıqlar aparıb, 1807-

ci il mayın 4-də hər iki dövlət arasında müqavilə bağlanılmasına nail oldu.

Həmin müqavilənin şərtlərinə əsasən Fransa İranın ərazisini qorumağı, Gürcüstanın İrana tabe olmasına nail olmağı, habelə Gürcüstanı ruslardan “təmizləməyi” öhdəsinə götürdü. Fransa həmçinin İranı silahla təmin etməyə və qoşunu yenidən qurmağa söz verdi.

İran İngiltərə ilə hər hansı münasibəti pozmağa və Fars körfəzi vasitəsilə fransız qoşunlarının Hindistana getmələri üçün şərait yaradacağına boyun oldu[1]

Fransa – İran müqaviləsi bağlandıqdan sonra, 1807-ci ildə İrana Fransadan general Qardanın başçılığı altında bir dəstə mühəndis gəldi. Onlardan bir qismi şahın xahişi ilə İrəvana gələrək qalanın müdafiə qabiliyyətini möhkəmlətməyə başladı. Bu barədə general Qudoviç yazırdı: “İrəvan qalası Avropa hərbi qaydaları üzrə möhkəmlənmiş, iki divarı, xəndəyi və torpaqdan düzəldilmiş səddi var. Təpənin üstünə əvvəllər burada yerli hərbiçilər tərəfindən tətbiq edilməyən Kirteçlə işləyən toplar qoyulmuşdur. İrəvanlılar fuqas bombalardan istifadə edidilər ki, bu da fransız mühəndislərinin fəaliyyətinin bəhrəsidir”[2].

Maraqlıdır ki, Tilzit müqaviləsi imzalandıqdan sonra da Fransa İrana rusların əleyhinə kömək etməkdən əl çəkmədi. Rus tarixçisi M.S.İvanovun fikrincə, 1807-ci ilin iyul ayında Fransa ilə Rusiya arasında bağlanan müqavilədən sonra Fransa bir daha İrana hərbi kömək etmədi[3]. Lakin hadisələrin gedişi göstərdi ki, Fransa Rusiya ilə müqavilə bağlamaqla, riyakarlıqla Rusiyanın hakim dairələrini yalnız arxayınlaşdırmağa çalışırdı.

---

[1] Дипломатический словарь, т. I, М., 1948, стр. 696-697.
[2] AKAK, III c., səh. 254.
[3] М.С.Иванов. Очерк истории Ирана. М., 1952, стр. 132.

Tezliklə Qardanın Rusiya əleyhinə apardığı təbliğat və onun bu sahədəki fəaliyyəti heç kəsə sirr olmadı. Qudoviçin mərkəzə göndərdiyi məktublarının birində deyilirdi: "Fransanın İrandakı nümayəndələri bizimlə dostluq müqaviləsinin bağlanılmasına baxmayaraq, hazırda mənim İranla münasibətlərimə maneçilik törədir... Onlar Babı xanı (Fətəli şah) inandırmağa çalışırlar ki, nə istəsələr ona nail ola bilərlər. Mən qoşunlarımla Pəmbək istiqamətində hərəkət edərkən və İrəvan sərhədlərinə yaxınlaşmazdan əvvəl onlar fransız mühəndis zabitlərindən Verds və başqalarını İrəvan qalası və "Üç kilsə" monastırını möhkəmləndirmək üçün göndərmişdilər"[1].

Digər məktubunda Qudoviç bildirir ki, fransızlar məndən İrəvan vilayətini tərk etməyi tələb edirlər, halbuki bu yerlərə mən silah gücü ilə sahib olmuşam[2]. Rus qoşunlarının İrəvan bölgəsini tərk etməsi tələbi ilə Qudoviçin düşərgəsinə hətta Latar adlı diplomat da göndərilmişdi. Lakin Qudoviç Rusiya ilə Fransa arasında "dostluq" müqaviləsinə əsaslanaraq, heç bir vəd vermədən Latarı geri göndərmişdir.

Fransa və İran dövlətlərinin yaxınlaşdığı bir dövrdə Qudoviçə mərkəzdən göstəriş verildi ki, Cənubi Qafqazdan Türkiyənin əleyhinə hərbi əməliyyətə başlasın. Bu ona görə idi ki, Türkiyə qoşunlarının Dunay cəbhəsinə çıxmağa imkanı olmasın.

Rus dövləti Cənubi Qafqazda Türkiyənin əleyhinə hərbi əməliyyatını Gümrü və Arpa bölgələrində genişləndirirdi.

General Qudoviç əsas qüvvələri ilə Axalkalaki istiqamətində hərəkət etdiyi halda, general Nesvetayev 1807-ci il aprelin 7-də öz döyüşçüləri ilə Arpa çayı keçərək Qars şəhərini zəbt etmək üçün

---

[1] MDHTA, f. VUA, 4265-ci sənəd, vər. 17-18.
[2] Gürcüstan Respublikası MDTA, 8-ci fond, 168-ci sənəd, vər. 60-72.

Fəaliyyətə başladı[1].Az sonra Qudoviçin qoşunları ilə Nesvetayevin döyüşçüləri birləşdi. Türk əsgərləri də həmin istiqamətdə hərəkət etdilər. Tezliklə, Abbas Mirzə də İran sərbazları ilə onun köməyinə gəldi. 1807-ci ilin iyunun 18-də Arpa çayının sahilindəki Kiçik Qarkilsə kəndində rəqiblər toqquşdular. Döyüş rus soldatlarının qələbəsi ilə bitdi[2]. Abbas Mirzə vaxt itirmədən sərbazları ilə Naxçıvana çəkildi.

Bu hadisədən sonra Türkiyə Rusiya ilə müvəqqəti sülh bağlamağa məcbur oldu. Lakin nə Fransa və nə də İngiltərə Türkiyədə Rusiya əleyhinə təbliğat aparmaqdan əl çəkmədilər. Fransa və İngiltərə diplomatlarının canfəşanlıqlarına baxmayaraq, Rusiyanın hakim dairələri İran və Türkiyə ilə sülh bağlamağa çalışırdı. Bu məqsədlə Qudoviç rus ordusunun zabitlərindən Baron Vredeni İrana göndərdi. Qudoviçin İran şahına təklifi əsasən, aşağıdakılardan ibarət idi: Rusiya Baba xanı (Fətəli şahı) rəsmi olaraq İranın şahı kimi tanıyacaq, İran öz növbəsində İrəvan və Naxçıvan xanlıqlarının Rusiya tərəfindən işğal olunacağına etiraz etməyəcəkdir[3].

Cənubi Qafqazdan əl çəkmək istəməyən İran Rusiyanın təklifini qəbul etmədi. Bu isə öz növbəsində rus qoşunlarının İrəvan üzərinə 1808-ci ilin baharında yeni hücumunun bərpa olunması ilə nəticələndi. Əslində İran dövlətinin rədd cavabı rus komandanlığının hərbi əməliyyata əl atmalarına bir bəhanə oldu. Ruslar uzun müddət idi ki, ciddi döyüş aparmaq üçün hazırlıq görürdü. İrəvan xanlığı sərhədində yerləşən rusqoşunları Pəmbəkdəki Qarakilsə, habelə Dərbas, Hamamlı, Xəzərabad, Gümrü kimi yerlərdə istehkamlar inşa

---

1 MDHTA, f. VUA, 4259-ci sənəd, III hissə, vər. 108-109.
2 AKAK, III c., 810-cu sənəd.
3 MDHTA, f. VUA, 4258-ci sənəd, (V) hissə, vər 279.

etmişdilər. Bu istehkamların vəzifəsi İrəvan, Qars və Axalsix tərəfdən İran və Türkiyə qoşunlarının gözlənilməz basqınlarının qarşısını almaqdan ibarət idi.

1808-ci il sentyabrın əvvəllərində Qudoviç Pəmbəkdən çıxaraq altı minlik qoşun və 12 top ilə İrəvan istiqamətində hərəkət etdi[1]. Bu yürüşdə rus qoşunlarının tərkibində 500 nəfərdən ibarət erməni süvariləri iştrak edirdi.

Beləliklə, rus komandanlığı İrəvan üzərinə ikinci dəfə yürüş etməli oldu.

İrəvan istiqamətində hərəkət edən Qudoviç, Qarabağda xüsusi dəstə ilə yerləşən general – mayor Nebolsinə göstəriş verdi ki, o da öz qoşunlarını Naxçıvana yeritsin. Nebolsin Naxçıvanı işğal etməli və beləliklə də, İran tərəfdən İrəvanı müdafiə etməyə gələn hərbi qüvvələrin qarşısını almalı idi[2].

Rus qoşunlarının hərəkəti İrəvanın yeni sərdarı Hüseynqulu xanı xeyli narahat etdi. O, təcili surətdə dəstələri ilə Aparana gedib rus qoşunlarının qarşısını almağı qərara aldı. 1808-ci il sentyabrın 26-da baş verən toqquşma zamanı İrəvandan gələn döyüşçülər məğlub olub geri çəkildilər[3]. Ertəsi günü şəxsən Qudoviçin başçılıq etdiyi rus qoşunlarının bir dəstəsi asanlıqla "Üç kilsə" monastırını işğal edərək, İrəvan yaxınlığındakı Qarabağ kəndində düşərgə salmağa müvəffəq oldu. Belə olduqda, sərdar Hüseynqulu xan qardaşı Həsən xanın komandası altında qalada iki minlik qarnizon qoyaraq, özü beş min döyüşçü ilə qaladan çıxaraq, Heydər çay sahilində düşərgə saldı.

Qudoviçin əmrinə əsasən general – mayor Portnyagin İrəvan

[1] В.Потто. Кавказская война в отдельных очерках, эпизодах, легендах и биографиях, т. I, в. I, стр. 412
[2] MDHTA, f. VUA, 4265-ci sənəd, vər. 4-16.
[3] Yenə orada.

xanı Hüseynqulu xanı təqib etməklə onun başını qatışdırdı, özü isə rəhbərlik etdiyi korpusla İrəvan qalasına yaxınlaşaraq şəhəri mühasirəyə aldı.

Həmin vaxtdan etibarən Hüseynqulu xan bir neçə dəfə öz düşərgəsindən İrəvan istiqamətinə qoşun göndərərək düşmənin fikrini dağıtmağa və bundan istifadə edərək, qalaya daxil olmağa səy göstərdi. Lakin bundan xəbər tutan Qudoviç Hüseynqulu xanın planlarını alt – üst etdi[1]. Onun podpolkovnik Podlustskinin başçılığı altında göndərdiyi döyüşçülərlə savaşda irəvanlılar məğlubiyyətə uğradılar.

Bu qələbədən sonra Qudoviç bir neçə dəfə İrəvan sərdarının qardaşı Həsən xana təklif etdi ki, qalanı ruslara təhvil versin, lakin hər dəfə Qudoviç rədd cavabı aldı. Qudoviçin təkliflərinə cavab olaraq Həsən xan qalanın müdafiə qabiliyyətini daha da möhkəmləndirdi.

Qudoviç İrəvan qalasını mühasirədə saxladığı müddətdə general Nebolsin döyüşçüləri ilə Qarabağdan Naxçıvana hərəkət edərək, 1808-ci il oktyabrın 28-də Qaradibi adlanan kəndin yaxınlığında Abbas Mirzənin qoşunlarını darmadağın etdi. Bu qələbədən sonra Naxçıvana hərəkət etmək büsbütün asanlaşdı[2]. Üç gündən sonra Nebolsinin qoşunları heç bir müqavimətə rast gəlmədən Naxçıvan qalasına daxil oldular.

İrəvan qalasının yenidən rus qoşunları tərəfindən mühasirəyə alınması və Naxçıvanın rusların əlinə keçməsi İranın hakim dairələrinin təşvişinə səbəb oldu. İran hökuməti kömək almaq üçün Yenidən Fransanın səfiri Qardana müraciət etdi. Lakin İranın xahişinə əməl edilmədi.

---

[1] Yenə orada, 4265-ci sənəd, vər. 4-16.
[2] Yenə orada, 4266- cı sənəd, vər. 1-2.

İran və İrəvan xanlığında rus qoşunlarının qələbəsindən sonra yaranan çaxnaşma və təşvişə baxmayaraq, Qudoviç hücuma keçməkdənsə hələ də Həsən xanla məktublaşır və ona İrəvan qalasını təhvil verməsini təklif edirdi. Bundan istifadə edən Həsən xan rədd cavabı verməklə qalanın müdafiəsini daha da möhkəmləndirdi[1]. Qudoviç qışın yaxınlaşmasını, qoşunların ərzağının və hərbi sursatın qurtarmasını nəzərə almamışdı. Qışın vaxtından əvvəl gəlməsi rus qoşunlarının Tiflislə əlaqəsini kəsdi. Bu isə İrəvanı mühasirədə saxlayan döyüşçülərin vəziyyətini daha da pisləşdirdi.

Yalnız 1808-ci il noyabrın 17-də Qudoviç İrəvanı hücumla almaq barədə əmr verdi. Lakin rus qoşunları irəvanlıların ciddi müqavimətinə rast gəldilər. Şəhərə daxil ola bilməyəcəyinə əmin olan Qudoviç mühasirə və hücumdan əl çəkib Tiflisə qayıtmaq haqqında əmr verdi. Dekabrın 1-də general Nebolsində Naxçıvanı tərk edərək Qarabağa qayıtmalı oldu.

Beləliklə, rus qoşunlarının İrəvan üzərinə ikinci yürüşünün uğursuzluğu Rus hökümətini məcbur etdi ki, Qafqazdakı ali baş komandanı – Qudoviçi vəzifədən azad etsin. Tezliklə onun yerinə vəzifəyə general Tormosov təyin olundu.

Həmin dövrdən etibarən İranın xarici siyasətində fəaliyyətlərini genişləndirən ingilislər, demək olar ki, fransızları bu bölgədən sıxışdırmağa nail oldular. 1809-cu il fevralın 13-də general Qardan Tehranı tərk etməli oldu. Ertəsi gün Tehrana ingilis səfiri Cons varid oldu. Həmin vaxtdan başlayaraq ingilislər İran qoşunlarının yenidən təşkil olunmasında fəal iştirak etməyə başladılar[2].

İngilis hərbi mütəxəssislərinin bir dəstəsi də Türkiyə

---

[1] MDHTA, f. VUA, 4266- cı sənəd, vər. 1-2.

[2] AKAK, IV c., səh. 756.

ərazisindən İrəvana gəldi. Onların əsas məqsədi Rusiyanın əleyhinə təxribat aparmaqdan ibarət idi.

İngilislərin təhriki ilə İrəvan sərdarı Hüseynqulu xan 20 minlik qoşunla Türkiyənin ərazisindən Gürcüstana hücum etmək təşəbbüsündə oldu. Lakin onun səyi uğursuzluqla nəticələndi.

İranla müharibə vəziyyətində olan Rusiya üçün eyni zamanda, Osmanlı Türkiyəsi ilə savaşmaq çox ağır idi. Odur ki, Rusiya hökuməti ilk növbədə İranla saziş bağlamağı qərara aldı. Danışıqların Əsgəran qalasında aparılması müəyyən edildi. Danışıqlarda Rusiya tərəfindən general Tormosov, İran tərəfindən isə şahzadə Abbas Mirzənin vəziri Mirzə Bozorq iştirak etdilər. Bir neçə gün davam edən danışıqlar heç bir nəticə vermədi.

Lakin 1810 –cu ildə bərpa olunan hərbi əməliyyatlar nəticəsində rus qoşunların qələbəsi İran dövlətini yenidən danışıqlara qaytardı.

Rusiya əvvəlcə 1812-ci il mayın 16-da Buxarestdə Türkiyə[1] ilə, 1813- cü ildə Gülüstanda İran ilə sülh bağlamağa məcbur oldu. Həmin dövrdə Napoleon qoşunları üzərində qələbə çaldıqdan sonra beynəlxalq aləmdə Rusiyanın nüfuzu xeyli artmışdı. Ona görə də Gülüstanda bağlanılan sülhün əsas şərtlərini də məhz Rusiya diplomatları diktə etdilər[2].

Həmin müqavilənin şərtlərinə əsasən, Naxçıvan və İrəvan xanlıqları istisna olunmaqla, Azərbaycanın şimalında yerləşən və rus qoşunları tərəfindən işğal edilən bütün xanlıqlar və sultanlıqlar rəsmi olaraq Rusiyanın, ölkənin cənubundakı xanlıqlar, habelə XVIII əsrin 20-ci illərində zəbt olunmuş Naxçıvan və İrəvan xanlıqları İranın

---

[1] Bu barədə daha ətraflı b a x: H.Sadıqov. Rusiya –Türkiyə münasibətlərində Cənubi Qafqaz problemi (1787-1829-cu illər). Bakı, 1991, səh. 94- 108.

[2] Т.Юзефович. Договоры России с Востоком, политические и торговые. СПб., стр. 208-214.

torpaqları hesab edildi.

Beləliklə, 1813-cü ilin oktyabrında tarixin ədalətsiz hökmlərindən biri də verildi: Azərbaycan xalqa iki, nisbətən qüvvətli dövlətlər arasında bölündü.

Yeri gəlmişkən qeyd etməliyik ki, I Rusiya – İran müharibəsi zamanı, xüsusilə qanlı döyüşlər İrəvan bölgəsində gedərkən rus qoşunlarına səfərbər edilmiş və həmçinin könüllü erməni döyüşçüləri də kömək edirdilər. Onlar xüsusi ilə 1804-cü və 1808-ci illərdə İrəvan üzərinə rus qoşunlarının etdikləri birinci və ikinci yürüş zamanı daha artıq fəallıq göstərmiş, rus ordusuna təkcə qoşun, silahla deyil, həmçinin sursat və ərzaqla da təmin edirdilər. Lakin ermənilərin səyinə baxmayaraq, hər dəfə rus ordusunun hücumu uğursuzluqla nəticələnmişdir.

Vəziyyətin belə şəkil alması bir fikri irəli sürməyə əsas verir: həmin dövrdə İrəvan şəhərində ya ermənilər yaşamamış və yaxud o qədər az olmuşlar ki, onlar heç bir ictimai qüvvə təşkil edə bilməmişlər. Odur ki, ermənilər rusların köməyilə İrəvana soxulub buranı özləri üçün istinadgaha çevirməyə çalışmışlar.

Təəssüflə qeyd etməliyik ki, nəhayət, ermənilər tarixən Azərbaycan şəhəri olan – Rəvanı – İrəvanı Rusiyanın köməyi ilə erməniləşdirməyə nail oldular.

I Rusiya – İran müharibəsində məğlub olan İranı, onun müttəfiqi İngiltərə tək qoymadı. Çox keçmədi ki, 1814-cü il noyabrın 25-də İngiltərə İranda saziş imzaladı. Həmin müqaviləyə əsasən, İran İngiltərə ilə rəqabət aparan və düşmənçılık edən hər hansı bir dövlətlə əlaqəsini kəsməli, Hindistana basqın etmək istəyən dövlətlərə müharibə elan etməli, Xarəzm, Buxara, Səmərqənd hakimlərinə öz ərazilərindən Hindistana qoşun çıxartmaq istəyən dövlətlərə icazə verməmələrinə nail olmalı, İrana yalnız İngiltərədən hərbi mütəxəssislər dəvət olunmalı idilər. Bunun əvəzində İngiltərə

İrana istənilən qədər pul və silah verəcəyinə boyun oldu.

1814-cü il İngiltərə - İran müqaviləsi, eyni zamanda Gülüstan müqaviləsinin şərtlərinə yenidən baxılmasını tələb edirdi. Bu münasibətlə İran dövləti ingilis hərbi mütəxəssislərinin köməyi ilə ordusunu təzələdi. Gülüstan müqaviləsindən təqribən dörd il keçdikdən sonra ordusunun yenidən müharibə aparmağa tam qadir olduğunu güman edən İran şahı öz nümayəndəsini Peterburqa göndərərək, Rusiyadan Talış xanlığını və Muğanı tələb edib, rəsmi şəkildə bildirdi ki, Gülüstan müqaviləsinin şərtlərini yenidən nəzərdən keçirməyin vaxtı gəlib çatmışdır.

İranın ingilislərin fitnəsi ilə hərəkət etməsindən xəbər tutan Rusiya hökuməti nəyin bahasına olursa olsun, İrandakı rəqiblərinin mövqeyini zəiflətməyə və ingilislərin İrandakı həm siyasi və həm də iqtisadi nüfuzunu heçə endirməyə çalışırdı. Lakin Fransa ilə apardığı qanlı müharibədən (1812) sonra İngiltərənin müdafiə etdiyi İran və eləcə də Türkiyə ilə yenidən müharibə aparmağı arzulamayan Rusiya dövləti, mövcud ixtilafları sülh yolu ilə tənzimləməyi daha üstün tuturdu. Bu məqsədlə də 1817 –ci ilin aprelində I Aleksandr general Yermolovun başçılığı altında İrana öz nümayəndəliyini göndərdi. Təqribən bir il əvvəl imperatorun Yermolova verdiyi təlimatda (16 iyul1816-cı il) deyilirdi ki, İngiltərə hamıdan artıq İranı öz təsiri altına almağa çalışır. İmperator I Aleksandr daha sonra yazırdı ki, ingilislərin İranda nüfuzunun artması Rusiya üçün ağır zərbədir. Yermolov Gülüstan müqaviləsinin şərtlərindən istifadə edərək Rusiyanın İranda mövqeyini möhkəmlətməyə çalışmalıdır[1].

Lakin İranda özlərinə isti yurd salmış ingilis diplomatları, İranın hakim dairələri Yermolov İrana gələrkən onu çox soyuq qarşıladılar. Şahın sarayında aparılan danışıqlar ingilis

[1] AKAK,VII c., səh. 667.

diplomatlarının təxribatçılığı üzündən heç bir nəticə vermədi.

İngilislər həmçinin çalışırdılar ki, rusların İranda fəaliyyətinə son qoyaraq hər iki dövləti – İran və Rusiyanı yenidən savaşdırsınlar[1].Rusiyanın əleyhinə təbliğat aparan ingilis diplomatları İrəvan xanlığında da bəd əməllərindən əl çəkmirdilər. Bu barədə Rusiyanın məşhur yazarı, XIX əsrin əvvəllərində diplomatik fəaliyyətlə də məşğul olan A.S.Qriboyedov yazırdı ki, İrəvan şəhərindəki ingilislər xanlığın bütün işlərinə müdaxilə edir, hər şeylə maraqlanır, özlərini ağa kimi aparırlar[2].

İngilislərin iştirakı ilə Tehranda tərtib olunan plana görə Rusiya ilə yenidən aparılan müharibədə İran qoşunları tədricən Qarabağ xanlığına doğru irəliləməli, Şuşa qalasını, sonra isə Tiflis istiqamətində hərəkət etmək üçün Gəncəni tutmalı idilər.

İrəvan sərdarı Hüseynqulu xan isə Şuragəl və Pəmbəkə hərəkət edib, orada şərqdən Abbas Mirzənin ümumi hücumunu gözləməli idi. Abbas Mirzə Şuşanı tutduqdan sonra onlar birləşməliydilər. Gürcü şahzadəsi Aleksandr isə Qacar ordusu ilə Kaxetiyaya hücum edib şimali – şərqdən Tiflisə yaxınlaşaraq birləşib, ümumi qüvvə ilə hücuma keçməli idilər. Sol cinah istiqamətində vəziyyət daha ciddi və mürəkkəb idi. Bu istiqamətdə başlıca olaraq İrana qaçmış Şimali Azərbaycan xanları hərəkət etməli idilər. Mir Həsən xan və Surxay xan Talış xanlığını və Salyanı, Hüseynqulu xan Bakını, Böyük xan və Hüseyn xan isə Quba, Dərbənd istiqamətində hərəkət edib bu yerləri ələ keçirməli idi.

Bu plan əsasında Qacar qoşunları iyulun 16-da hərbi əməliyyata başladılar. Onların əsas qüvvələri Cənubi Qafqaz sərhədinə yaxın yerlərdə Xoy - Ərdəbil – Təbriz xətti üzrə 600 km

---

[1] Yenə orada, VI c., II hissə, səh. 125.

[2] Г.Ахундов. Русско- Иранская война 1826-1828 гг. // AMEA Tarix İnstitutunun Elmi Arxivi, sənəd 1771, səh. 104.

uzunluqda geniş cəbhədə hücuma keçdilər [1]. I Rusiya – İran müharibəsində olduğu kimi, bu dəfə də Azərbaycanın ərazisi işğalçıların döyüş meydanına çevrilərək dağıntıya məruz qaldı.

1826-cı il iyulun 16-da sərdar Hüseyn xanın atlıları, sərbazlardan ibarət möhkəmlənmiş batalyonlar İrəvan tərəfdən rus sərhədlərinə hərəkət etdilər. İyulun 18-də isə Abbas Mirzənin komandanlığı altında 60 minlik ordu (bəzi mənbələrdə 80 min) Şimali Azərbaycana soxuldu.

Müharibənin ilk günlərində İran ordusu Şimali Azərbaycanın içərilərinə, hətta Şamxora qədər gəlib çıxsa da rus döyüşçülərinin güclü təzyiqi altında tezliklə geri çəkilməyə məcbur oldu. 1827-ci ilin əvvəli üçün, demək olar ki, Şimali Azərbaycanın bütün əyalətləri İran ordusundan təmizləndi[2].

Rus ordusunun müharibənin ilk çağlarında qazandığı qələbə İrəvan və eləcə də Naxçıvan xanlıqlarının müqəddəratında əhəmiyyətli rol oynadı. Məlum olduğu kimi, Gülüstan müqaviləsinin şərtlərinə görə bu xanlıqlar İranın hakimiyyəti altına düşmüşdülər. Onu da qeyd etməliyik ki, müharibə başlar – başlamaz imperator I Nikolay Cənubi Qafqazda rus qoşunlarının baş komandanı Yermolovu İvan Fyodoroviç Paskeviçlə əvəz etdi. General – adyutant İ.F.Paskeviç komandanlığı, 1827-ci il mart ayının 29-da xüsusi Qafqaz korpusunun komandan heyətini qəbul etdi[3].

Naxçıvan və İrəvan xanlıqları uğrunda gedən döyüşlərin ilk mərhələsi rus ordusu üçün müvəffəqiyyətsizliklə nəticələndi. Abbas Mirzə tərəfindən İrəvan qalasında saxlanılmış qarnizon daha güclü

---

[1] Г.Ахундов. Русско- Иранская война 1826-1828 гг. // AMEA Tarix İnstitutunun Elmi Arxivi, sənəd 1771, səh. 106.

[2] Hacı Murad İbrahimbəyli. Göstərilən əsəri, səh 198.

[3] Подробное описание Персии и государств Кабула, Сеистана, Синда, Бальха, Белуджистана земли Хорасана, также Грузии и персидских провинций, присоединениях к России, ч. III, М., 1829, стр. 26.

müqavimət göstərirdi. Döyüşlərin ilk mərhələsində Paskeviç heç bir müvəffəqiyyət qazana bilmədi. Ona görə ki, bir tərəfdən şah İrəvanda ingilis silahı ilə silahlanmış qarnizon saxlamışdı, digər tərəfdən isə rus ordusunun arxasında soyğunçuluqla məşğul olan kürd tayfaları, komandanlığın diqqətini yayındırırdı. Həmçinin iqlimin sərtliyi də rus əsgərlərinə mənfi təsir edirdi.

Yuxarıda deyilən vəziyyəti nəzərə alaraq, general-adyutant Paskeviç İrəvan qalasının mühasirəsindən müvəqqəti olaraq əl çəkdi və əsas gücünü səfərbər edərək Naxçıvan istiqamətində hücuma keçdi. İrəvan xanlığı ilə Türkiyə arasında əlaqəni kəsmək və buna imkan verməmək üçün Paskeviç general-leytenant Krassovskinin hissəsini burada saxladı. Krassovski həm İran ordusunun İrəvan qalasında, Sərdarabadda və "Üç kilsə" monastırı ətrafında hərəkətini izləməli, həm də Araz çayı sahillərinə, nəzarət etməli idi[1]. Onun sərəncamında yenicə Rusiyadan gətirilmiş 3000 soldat saxlanılmışdı. Xüsusi Qafqaz korpusunun 20-ci diviziyasına məxsus olan soldatların lazımi döyüş təcrübələri də yox idi. Məhz buna görə də onlar qarşıda duran vəzifənin öhdəsindən gələ bilmədilər. General – adyutant Paskeviç əsas qüvvələrlə Naxçıvan istiqamətində getdikdən sonra İrəvan qalasında olan İran qarnizonu hücuma keçərək Krassovskinin qüvvələrinə güclü zərbə endirdi. Bu hadisədən xəbər tutan Paskeviç, öz qüvvələrinin bir hissəsini Krassovskiyə köməyə göndərməyə məcbur oldu. Naxçıvan istiqamətində əməliyyat aparan general – leytenant knyaz Eristovun komandanlığı altında olan rus döyüşçüləri Araz çayı üzərində olan keçidi tutmalı, Abbas Mirzənin qüvvələrini Naxçıvana və ya Abbasabad qalasına buraxmamalı idilər.

İrəvan istiqamətində hərəkət edən orduya isə general-

[1]П.Зубов. Картина последней войны России с Персией, стр. 50.

adyutant Benkendorf komandanlıq edirdi. Rus ordusunun keçdiyi yerlərin əhalisi, hətta feodallar, sərbazların əlindən cana gəldikləri üçün Rus dövlətinin təbəəliyini qəbul etməyə hazır olduqlarını bildirirdilər. Həmin məsələ ilə əlaqədar mənbədə oxuyuruq: "Aprel ayının 30-da Kəlbalı Sultan general- adyutant Benkendorfun yanına gələrək 300 ailədən ibarət Vedi kəndinin əlahəzrət imperatorunun himayəsinə qəbul edilməsini xahiş etdi. Çünki Vedi kənd əhalisinin Arazın o tayına köçürülməsi təhlükəsi yaranmışdı"[1].Tezliklə rus komandanlığı məlumat aldı ki, Aslan Sultan bu təhlükəni nəzərə alaraq öz adamları ilə birlikdə Göyçə gölü yaxınlığında Həsən qalada möhkəmlənmişdir[2].Yeri gəlmişkən qeyd etməliyik ki, İran hökmdarları həmişə əhalini İranın daxili yerlərinə köçürməyə çalışırdılar. Lakin İran işğalçılarının belə təşəbbüsü çox zaman baş tutmurdu. Müasirlərdən biri yazırdı: "Nağı xan və vəkil İsmayıl ağa Ararat dağları yaxınlığında olan qarağlılara (qarapapaqçılara) naxçıvanlılarla birlikdə İrana köçürülməkdən ehtiyat etdikləri üçün müqavimət göstərməyə hazırdırlar"[3]. Onların əksəriyyətinin yeməyə çörəyi yox idi, yalnız süd və pendirlə qidalanırdılar. Buna baxmayaraq, onlar müqavimət göstərir və doğma yurdlarından uzaqlaşmaq istəmirdilər. Göründüyü kimi, II Rusiya-İran müharibəsi dövründə yerli əhali nizami orduya qoşulmaqla istər-istəməz rus ordusunun gücünü artırırdı. Rus ordusunun yeni qüvvələrinin yaxınlaşması ilə əlaqədar İrəvan qarnizonu qalaya çəkilməyə məcbur oldu. İrəvan qalası yenidən mühasirəyə alındı. Paskeviçin komandanlığı altında olan hissələr isə, qısa fasilədən sonra Naxçıvan istiqamətində hərəkət etməyə başladı.

---

[1] İranın ətraflı təsviri, səh. 32.
[2] Yenə orada.
[3] İranın ətraflı təsviri, səh. 32.

Rus ordusunun hərəkəti çox çətin bir şəraitdə davam edirdi. Belə ki, bir tərəfdən dəhşətli istilər, digər tərəfdən isə ordunun keçdiyi yolların çətinliyi rus ordusunun normal hərəkətinə maneçilik törədirdi.

Rus ordusunun keçdiyi ərazidə yaşayan əhalinin bir qismi əvvəlcədən zorla Arazın o tayına köçürülmüşdür[1]. Ona görə də bu yerlərdə ərzaq çatışmırdı. Yayın isti keçməsinə, ərzağın və yemin çatışmamasına baxmayaraq general-adyutant Paskeviçin komandanlığı altında yorğun, taqətdən düşmüş, lakin qarət və yeni torpaqlar əldə etmək hərisliyi rus soldatlarını altı günə Naxçıvana çatdırdı. Rus qoşunları hərəkət etdikləri zaman yolda düşmənlə qarşılaşmadılar. Yalnız Naxçıvan qalası yaxınlığında Həsən xanın və Nağı xanın komandanlığı altında olan İran süvariləri ilə rastlaşdılar. Knyaz Eristovun komandanlığı altında rus döyüşçüləri hücuma keçərək İran süvarilərini geri oturmağa məcbur etdilər.

Darmadağın olmuş İran süvariləri qalada gizlənməyə macal tapmayıb Naxçıvan xanlığının sərhədini tərk etdilər. Nəticədə 1827-ci il iyun ayının 26-da rus qoşunları Naxçıvana daxil oldular[2].

Rus qoşunlarının bir güllə belə atmadan şəhərə daxil olduqlarından, yaxın kəndlərin 2000 ailədən artıq əhalisi Rusiyanın tabeliyində olmaq istədiyini bildirdi. İran sərbazlarından fərqli olaraq rus komandanlığı ilk vaxtlarda yerlərdə soyğunçuluğa və dağıntıya yol vermədilər. Təkcə bu faktı göstərmək kifayətdir ki, qələbə zəfəri ilə Naxçıvana daxil olmuş rus ordusunun komandanlığı 1000 başa qədər iribuynuzlu heyvanı əhalidən pul ilə aldı. Bundan sonra əhali də qalaya gələrək ehtiyat etmədən soldatlara pul ilə ərzaq məhsulları satdılar. Halbuki, İran sərbazları yalnız yerli əhalini qarət etmək

[1] AKAK, VII c., 512-ci sənəd.
[2] Azərbaycan tarixi, 3 cilddə, II c., səh. 40.

hesabına dolanırdılar.

Rus qoşunları qalanı tutduqdan sonra, Abbas Mirzə danışıqlar aparmaq məqsədi ilə Nəcəf Əli Soltan Əşrəfi general-adyutant Paskeviçin yanına göndərdi. Danışıq zamanı Nəcəf Əli Soltan Əşrəfə bildirdi ki, Gülüstan müqaviləsinə görə Rusiya dövlətinin tərkibinə keçmiş Lənkəranı Rusiyaya "güzəşt" etməyə razıdır. Lakin danışıqların gedişindən məlum olur ki, Əşrəfin əsas məqsədi daha çox casuslarla əlaqədar məsələlərlə bağlı olmuşdur. O, əsasən rus ordusunun sayı və vəziyyəti ilə maraqlanır, bu kimi məlumatlar toplamağa çalışırdı. Odur ki, barışmaq haqqında danışıqlar baş tutmadı və müharibə davam etdi[1].

Paskeviç qoşunlarının müəyyən hissəsini Naxçıvanda saxlayaraq əsas qüvvələrini Abbasabad qalası üzərinə yeritdi. Bu qala Naxçıvanın cənub-qərbindən 10 kilometr məsafədə yerləşirdi. Abbasabad qalası Araz çayı üzərində olan keçidin qorunmasını təmin etməklə yanaşı, həm də Cənubi Azərbaycana gedən yolun üstündə idi. İran tarixçisi Mirzə Məhəmməd Tağı xan yazırdı ki, general Paskeviçi Abbasabad qalasına Kəlbəli xanın oğlu Ehsan xan dəvət etmişdir[2].

Tədqiq olunan dövrdə rusların xidmətində olan Azərbaycan tarixçisi Mirzə Adıgözəl bəy yazırdı: "Həmin dövrdə Abbasabad qalasını qoruyan və müdafiə edən naxçıvanlı Ehsan xan... mənim yanıma aşağıdakı xahişlə adam göndərdi: "Knyaza xəbər verir ki, bizə doğru hərəkət etsin. O gələn kimi qalanı ona təslim edəcəyəm"[3]. Sözsüz ki, Abbasabad qalasının verilməsində Ehsan xanın rolu olmuşdur. Məlumdur ki, rus komandanlığı qalanı tutmaq üçün xüsusi plan hazırlamışdı. 1827-ci il iyul ayının 1-dən 2-nə keçən gecə rus

---

[1] B.P.Balayan. Göstərilən əsəri, səh. 157.

[2] Mirzə Məhəmməd Tağı xan . Nasih üt – təvarix. Tehran, 1359 h., I c., səh. 201-202.

[3] Mirzə Adıgözəl bəy. Göstərilən əsəri, səh. 124; Azərbaycan tarixi, II c., səh. 40.

ordusu Abbasabad qalasını işğal etdi.

İran sərbazları üzərində bir neçə qələbə qazandıqdan sonra İ.F.Paskeviç İran ordusunun cəbbəxanasını – Təbriz şəhərini işğal etməyi qərara aldı. Lakin çoxsaylı düşmən qüvvəsi cəmləşmiş İrəvan qalasını arxada qoymaq böyük risk tələb edirdi. Buna görə də İ.F.Paskeviç əvvəlcə İrəvanı zəbt etməyi qərara aldı.

Bir çox maneələri dəf etdikdən sonra rus qoşunları Paskeviçin komandası altında İrəvan qalasını mühasirəyə aldı. Tezliklə rus komandanlığı İrəvan qalasını toplardan atəşə tutdu və oktyabrın 1-də rus sərbazları qalaya şiddətli basqın etdilər. Belə olduqda İrəvan qarnizonunun komandanı xahiş etdi ki, rus ordusu atəşi saxlasın və imkan versin ki, şahzadə Abbas Mirzədən ruslara tabe olmaq üçün razılığını alsın. Lakin Paskeviç İrəvan qarnizonunun xahişinə məhəl qoymayıb atəşi davam etdirdi. Rus qoşunlarının top atəşlərinə dözməyən İrəvan qarnizonu şəhərin darmadağın olmasının və əhalinin qırılmasının qarşısını almaq üçün təslim olmağı üstün tutdu.

İrəvan şəhərinə daxil olan rus qoşunları azərbaycanlılara divan tutduqları halda ermənilərə toxunmadılar. I Rusiya-İran müharibəsi zamanı olduğu kimi, II Rusiya-İran müharibəsi dövründə də ermənilər böyük həvəslə və ümidlə rus ordusuna kömək edirdilər. Onlar İrəvan xanlığı və İran qoşunlarının cəmləşdiyi yeri və sayı, döyüş qurğuları, ərzaq ehtiyatı və s. haqqında rus komandanlığına xəbər verirdilər. Məhz buna görə də düşmənin hərbi hazırlığından, ölkə daxilindəki şəraitdən, yolların vəziyyətindən rus komandanlığı xəbərdar idi.

Ermənilər eyni zamanda rus qoşunlarına böyük maddi yardım da edirdilər ki, bunun da rus yürüşlərinin uğurlu başa çatmasından mühüm əhəmiyyəti var idi.

II Rusiya-İran müharibəsi tarixində İrəvan əməliyyatı xüsusi yer tuturdu. Təsadüfi deyildir ki, İrəvan qalasının alınması zamanı

göstərdiyi hərbi taktikaya görə general-adyutant knyaz İ.F.Paskeviçə müharibə hələ bitməmiş "qraf Paskeviç yerevankasi" adı verildi.

İrəvan qalasını aldıqdan sonra rus qoşunları Cənubi Azərbaycanın ərazisinə daxil olaraq, burada yerləşən İran sərbazlarına zərbələr endirməyə başladılar.

Məğlubiyyətin labüdlüyünü duyan İran şahı rus qoşunlarının hücum dairəsinin genişlənməsindən dəhşətə gələrək, sülh barədə danışıqlar aparmaq üçün öz nümayəndəsi Davud xanı Rusiyaya göndərdi. İngiltərə bu danışıqlarda vasitəçilik edərək, Davud xana bacarıqlı diplomat olan Makdonaldı da qoşdu.

Rusiya ilə İran arasında danışıqların birinci mərhələsi Tiflisdə aparıldı. Çarizm üçün müharibəni tez qurtarmaq daha əlverişli idi. Maliyyə vəziyyətinin ağırlığı, həmçinin ehtiyatları Türkiyə ilə müharibə aparmaq üçün səfərbərliyə almaq istəyi də bu meyli doğururdu. Lakin Rusiya-İran müharibəsinin tezliklə qurtarması heç də İngiltərəni qane etmirdi. Odur ki, sülh imzalamaq haqqında Rusiya-İran arasında ilkin danışıqlar heç bir nəticə vermədi. Beləliklə, biri-birinin ardınca qələbələr qazanan rus ordusu Araz çayını keçib Cənubi Azərbaycana daxil oldu. Burada da sərbazlar rus soldatlarına müqavimət göstərə bilmədilər. Tezliklə Təbriz şəhəri rus qoşunları tərəfindən alındı. Bu isə İran üçün I Rusiya-İran müharibəsi zamanı əldə etdiyi ehtiyat və ticarət mənbəyi olan Cənubi Azərbaycanın itirilməsi demək idi. Rus ordusunun qələbəsi həmçinin Tehranı da təhlükə altına qoyurdu. Belə bir şəraitdə İran dövləti Rusiya ilə sülh bağlamaq razılığına gəldi.

İngilis və türk diplomatlarının səyinə baxmayaraq, 1828-ci il fevralın 10-da Təbriz şəhərinin yaxınlığındakı Türkmənçay adlanan yerdə İranla Rusiya arasında sülh müqaviləsi imzalandı. Müqavilənin başqa şərtləri ilə yanaşı, İrəvan və Naxçıvan xanlıqları bütünlükdə Rusiya imperiyasının tərkibinə daxil edildi. Yeri gəlmişkən qeyd

etməliyik ki, hələ 1827-ci ilin axırlarında yuxarıda adı çəkilən mənşəcə erməni olan X.Y.Lazarev I Nikolaya Azərbaycanın ərazisində Rusiya imperiyasının tərkibində "Erməni dövləti" yaradılması haqqında layihə təklif etmişdi.[1] Həmin təklifi imperatora Lazarevin xahişi ilə general-adyutant Benkendorf təqdim etdi. X.Y.Lazarevin bu təklifi Rusiya dövləti üçün bir növ bəhanə oldu. Çox keçmədi ki, Novruz bayramı günü imperator I Nikolay əsrlərdən bəri Naxçıvan diyarında yaşayan azərbaycanlılara bir növ sürpriz etdi-1828-ci il martın 21-də verdiyi fərmana görə İrəvan və Naxçıvan xanlıqları ləğv edilib, əvəzində Azərbaycanın bu qədim torpağında yeni inzibati bölgə- "Erməni vilayəti" "Армянская область) yaradıldı. Beləliklə, Rusiya imperiyasının cənub-qərbində, Türkiyə və İranla sərhəddə süni surətdə "xristianlardan" sədd yarandı. Çox keçmədi ki, ermənilərin xahişi və çar Rusiyası hakim dairələrinin arzusu ilə yeni yaranmış "erməni vilayətini" erməniləşdirmək məqsədi ilə buraya İran ərazisindən 40000-dən çox erməni köçürüldü[2].

İmperator I Nikolayın qılığına girmək məqsədi ilə X.Lazarev yeni bir hiyləyə əl atdı. O, yaltaqlıqla I Nikolaya müraciət etdi ki, imperator özünün tituluna, həmçinin "Ermənistan çarı" adını da əlavə etsin[3]. Lakin Rusiyanın hakim dairələri bu "təşəbbüsü" qulaqardına vurdular.

Rusiya imperiyasının tərkibində "Erməni vilayəti" 1850-ci ilə

---

[1] MDHTA, f. VUA, 4338- ci sənəd, vər. 74-77. "Mətndaran", Lazarevlər fondu, qovluq 126, iş 45, vər. 219; В.Тунян. Материалы к новой истории Восточной Армении.// Вестник общественныч наук, Ереван, 1986, № 8, стр. 8.

[2] İ.İ.Şopen. Göstərilən əsəri;С.Глинка. Описание переселения Азербайджанских армян в пределах России. М., 1931; Н.Шавров. Русская колонизация на Кавказе // Вопросы колонизации. СПб., 1911.

[3] Пояснительная записка Х.Е.Лазарева о необходимости самодержавию Российской империи Николаю I принять титул царя Армении (конец февраля – начала марта 1818 г).; Bax: V. Tunyan. Göstərilən əsəri, səh. 82.

kimi mövcud olmuşdur. Həmin ildə bu vilayət quberniyasına çevrilərək, həmin quberniyanın tərkibinə Naxçıvan və Ordubad uyezdləri də daxil edilmişdir.

# MÜNDƏRİCAT

